**AZƏRBAYCAN RESPUBLİKASININ**

**DÖVLƏT NEFT ŞİRKƏTİ**

**“AZƏRİQAZ” İSTEHSALAT BİRLİYİ**

# QAZ TƏSƏRRÜFATINDA TEXNİKİ İSTİSMAR, ƏMƏYİN MÜHAFİZƏSİ, YANĞIN TƏHLÜKƏSİZLİYİ, ƏTRAF MÜHİTİN MÜHAFİZƏSİ QAYDALARINA VƏ BEYNƏLXALQ STANDARTLARIN TƏTBİQİNƏ DAİR

## 1000 SUAL - 1000 CAVAB

**Bakı – 2017**

*Kitaba Azərbaycan Respublikası*
*Dövlət Neft Şirkətinin "Neftqazelmitədqiqatlayihə" İnstitutu*
*tərəfindən müsbət rəy verilmişdir.*

## I BÖLMƏ
## QAZ TƏSƏRRÜFATI HAQQINDA

### Ölkəmizdə qaz sənayesinin tarixi haqqında

Azərbaycan neft-qaz sənayesi çox şərəfli tarixi bir yol keçmişdir. Vətənimiz odlar diyarı Azərbaycan tarix boyu bütün dünyada ən qədim neft-qaz diyarı kimi tanınmış, dünya neft-qaz sənayesinin inkişafına danılmaz töhvələr bəxş etmişdir.
Ölkəmizdə təbii qazdan istifadə uzun tarixə malik olsa da qaz təsərrüfatı 1920-ci ildən başlayaraq inkişaf etməyə başlamışdır. Bu sahənin mərkəzləşdirilmiş qaydada idarə olunması məqsədilə 1923-cü ildə "Azneft" İstehsalat Birliyinin Əmtəə İdarəsinin nəzdində qazın hasilatı və işlənilməsi üzrə köməkçi şöbə yaradılır. Bununla da Azərbaycanda qaz təsərrüfatının təməli qoyulmuşdur.
1936-cı ildə "AzQaz" tresti, 1958-ci ilin fevral ayında Azərbaycan SSR Kommunal təsərrüfatı Nazirliyi nəzdində "Başqaz" İdarəsi, bu İdarənin strukturu təkmilləşdirilərək ulu öndərimiz Heydər Əliyev dövlət başçısı seçildikdən iki ay sonra 1969-cu ilin avqust ayında Hökümət yanında "Başqaz" İdarəsinə çevrilmişdir. 1983-cü ildə "Başqaz" İdarəsinin bazasında Dövlət Qazlaşdırma Komitəsi yaranmışdır. Bu Komitə 1989-cu ildə Azərbaycan Dövlət Yanacaq Komitəsinə birləşdirilmişdir.
SSRİ-nin süqutundan sonra 1992-ci ildə Azərbaycan Dövlət Yanacaq Komitəsi, "Azəriqaznəql" İstehsalat Birliyi və Azərbaycan Elmi-Tədqiqat Layihə İnstitutu bazasında "Azəriqaz" Dövlət Şirkəti, 1996-cı ildə "Azəriqaz" Qapalı Səhmdar Cəmiyyəti yaradılmış, 2009-cu ilin iyul ayında Azərbaycan Respublikası Prezidentinin neft və qaz sənayesinin idarəetmə mexanizmlərinin təkmilləşdirilməsi haqqında 366 nömrəli Sərəncamı ilə "Azəriqaz" Qapalı Səhmdar Cəmiyyəti yenidən təşkil olunaraq ARDNŞ-nin tərkibinə verilmiş, həmin şirkətin tərkibində öz fəaliyyətini "Azəriqaz" İstehsalat Birliyi kimi davam etdirir.
Hazırda Respublikada yaşayış məntəqələrinin qazlaşdırılması işləri uğurla davam etdirilir.

## I FƏSİL
## TƏBİİ QAZ VƏ QAZ TƏSƏRRÜFATI HAQQINDA ÜMUMİ MƏLUMAT

**1. Təbii qazın tərkibi hansı kimyəvi maddələrdən ibarətdir?**

Metan- $CH_4$, etan-$C_2H_6$, propan -$C_3H_8$, butan -$C_4H_{10}$, oksigen-$O_2$, azot-$N_2$, karbon qazı- $CO_2$ v.s.

**2. Təbii qaz yataqları neçə yerə bölünür?**

Təbii qaz yataqları əmələ gəlmə şəraitinə görə təmiz qazlı, qaz kondensatlı, qazlı-neftli olmaqla 3 qrupa bölünürlər. Şərti olaraq tərkibində 50 qr/$m^3$-dan aşağı ağır karbohidrogenlər olan qazlar quru, tərkibində 50 qr/$m^3$-dan yuxarı ağır karbohidrogenlər olan qazlar isə yağlı qazlar adlanır.

Təmiz qaz yatağından istehsal olunan təbii yanar qazların tərkibinin əsas hissəsini metan $CH_4$ (~95%), qalan hissəsini isə (~5%) etan $C_2H_6$, propan $C_3H_8$, butan $C_4H_{10}$ və daha ağır karbohidrogenlər təşkil edir. Bütün quru qazlar havadan yüngüldürlər. Bu qazların istiliktörətmə qabiliyyəti 8000 kkal/$m^3$ həddində olur. Yağlı qazlar isə yandırılmazdan qabaq ağır karbohidrogenlərdən və başqa zərərli komponentlərdən təmizlənməlidir. Müxtəlif texniki üsullarla bir cinsli hala gətirilmiş quru və yağlı qazların iyi və rəngi yoxdur.

**3. Təbii qazın mexaniki və maye qarışıqlardan təmizlənməsi necə həyata keçirilir?**

Təbii qazın mexaniki və maye qarışıqlardan təmizlənməsi üçün başlıca olaraq iri həcmli və «siklon» tipli separatorlar tətbiq olunur. Mexaniki qarışıqlar dedikdə kondensat, qazolin, su damcıları, süxur dənəcikləri və sair bu kimi mədən tullantıları nəzərdə tutulur.

**4. Təbii qazın kimyəvi tədqiqi dedikdə nə başa düşülür?**

Təbii qazın kimyəvi tədqiqi onun fraksiya tərkibini, nəmliyini, şeh nöqtəsini, nisbi çəkisini və xüsusi çəkisini, sıxlığını, yanma istiliyini (kalorimetrlə) laboratoriya şəraitində təyin etməkdən ibarətdir. Kimyəvi tədqiqin növündən asılı olaraq nümunə götürmək üçün yer, nümunənin götürülməsi qaydası və cihazlarla kimyəvi tədqiqi qüvvədə olan standartların (texniki şərtlərin) tələblərinə cavab verməli, sənədləşdirilməli və sertifikatlaşdırılmalıdır.

**5. Qaz halının qanunları hansılardır ?**

**Boyl-Mariot qanunu** – sabit temperaturda verilmiş qaz kütləsinin həcmi və təzyiqi arasındakı asıllığı müəyyən edir:

$$\frac{P_1}{P_2} = \frac{V_2}{V_1},\ \text{yaxud}$$

$P_1V_1 = P_2V_2 = const$ Sabit temperaturda verilmiş qaz kütləsinin təzyiqi ilə həcmi hasili sabit kəmiyyətdir. Beləliklə, izotermik prosesdə qazın mütləq təzyiqi tutduğu həcmlə tərs, sıxlıqla isə düz mütənasibdir. Burada, P- qaz kütləsinin təzyiqi, V-isə həcmidir.

**Qey-Lüssak qanunu -** sabit təzyiqdə verilmiş qaz kütləsi həcmi ilə onun temperaturu arasındakı asılılığı müəyyən edir.

$$V_1 = V_0(1+at)$$

t-qaz kütləsinin temperaturu,

a-qazın istidən həcmi genişlənmə əmsalı, a=1/273.

$$V/T=const$$

Verilmiş qaz kütləsinin təzyiqi dəyişmirsə, onun həcminin mütləq temperatura nisbəti sabit kəmiyyətdir.

**Şarl qanunu -** sabit həcmdə verilmiş qaz kütləsi təzyiqinin onun temperaturundan asılılığını müəyyən edir.

$$P_1 = P_2(1+at); \quad P/T=const$$

Verilmiş qaz kütləsinin həcmi dəyişmirsə, onun təzyiqinin mütləq temperatura nisbəti sabit kəmiyyətdir.

Avaqadro qanunu eyni temperatur və təzyiqdə bərabər həcmli müxtəlif qazların tərkibindəki molekulaların sayının bərabər olduğunu müəyyən edir. Normal şəraitdə ($0^0$ C÷750 mm civə süt.) bir qram molekul üçün bu say $6{,}06\text{x}10^{23}$-dən ibarətdir və Avaqadro ədədi adlanır. Normal şəraitdə 1 qram molekul müxtəlif qazların həcmi bərabər olmaqla 22,4 litrdən ibarətdir.

**6. Qazın təzyiqi nədir?**

Qazın təzyiqi - sıxılma zamanı onun molekullarının yerləşdiyi qabın divarına vurduğu zərbələrin nəticəsidir:

$$P = \frac{F}{S}\left(\frac{N}{m^2}\right),\ F = \frac{1}{9.8}kqq = 102qram = 1N$$

P-təzyiq
F-qüvvə
S-qabın səthinin sahəsi
Təzyiq vahidi olaraq 1 N qüvvənin 1 $m^2$ sahəyə təsirindən yaranan təzyiq qəbul edilmiş və Fransız alimi Paskalın şərəfinə Pa ilə işarə olunaraq Paskal adlandırılır.

$$Pa = 1\left(\frac{N}{m^2}\right)$$

Normal atmosfer təzyiqi, yaxud barometrik təzyiq adlanan bu kəmiyyətin qiyməti dəniz səviyyəsində $0^0$C temperaturda 760 mm civə sutunu = 101325 Pa = 1013mbar = 10330 mm su sütunu=1,033 $\frac{kqq}{sm^2}$ bərabərdir.
Dəniz səviyyəsi adı altında, dəniz suyunun qabarması və çəkilməsi nəticəsində yaranan titrəyişləri nəzərə almadan, dünya okeanının səviyyəsi kimi başa düşülməlidir.
Dəniz səviyyəsindən yuxarı qalxdıqca hər 12 metrdən bir təzyiq 1 mm civə sütunu qədər azalır (1 mm civə sütunu= 133,3 Pa).
Normal atmosfer təzyiqində həcmi 1 $m^3$ olan havanın kütləsi 1,033 kq-dır.
Hər hansı bir qabdan havanı çıxarmaq üçün onun daxilində atmosfer təzyiqində aşağı boşalma təzyiqi yaradılır və bu zaman qabdakı təzyiq sıfra enir. Sıfrdan ölçülən təzyiq mütləq təzyiq, atmosfer təzyiqini üstələyən təzyiq isə izafi ($P_{izafi}$) təzyiq adlanır və manometrlə ölçülür:
$P_{mütləq} = P_{bar} + P_{izafi}$
Ölçmə və hesablanma işlərinin aparılmasında təzyiqin aşağıdakı vahidləri belədir:

1Pa=0,001 kPa

1 kPa = 1000 Pa

1 hektoPa= 100Pa

100 kPa= 0,1 MPa= 1 kqq/$sm^2$

1 mm civə sütunu= 133,3 Pa

**7. Qazın Yanma reaksiyası necə gedir?**

Metan ($CH_4$) qazının yanma reaksiyası bərabərliyi aşağıdakı kimidir:



$$1\ m^3\ CH_4 + 2\ m^3\ O_2 = 1\ m^3\ CO_2 + 2\ m^3\ H_2O$$

Bu onu göstərir ki, 1 $m^3$ metan qazının tam yanması zamanı 2 $m^3$ oksigen işlədilməklə, 1 $m^3$ karbon qazı və 2 $m^3$ su buxarı ayrılır. Yanma reaksiyalarının bu reaksiyalar üçün əsas katalizator olan oksigensiz təsəvvür etmək mümkün deyil. Oksigen yanmaya istər odluqla nizamlanmış şəkildə verilsin (qaz-oksigen qarışığı ilə kəsmə və qaynağ işləri istisna olmaqla) istərsə də atmosferdən təbii olaraq qatılsın, hər iki halda tərkibi müxtəlif cinsli, o cümlədən başlıca olaraq 78,8 % azotdan, 21% oksigendən, 0,12% $CO_2$-dən və sairə komponentlərdən ibarət olan atmosfer havası ilə daxil olur.

Beləliklə nəzəri olaraq 1 $m^3$ metan qazının yanması üçün, yəni 9,5 $m^3$ hava tələb olunur.

**8. Yeraltı qaz saxlama anbarları haqqında nə bilirik?**

Yeraltı qaz anbarları magistral qaz kəmərlərinin kompleksinə aid edilməklə əsasən qaz istehlakçılarının qış-yay mövsümündən asılı olaraq qazdan istifadənin qeyri bərabərliyini tənzimləyir.

Qazdan istifadə edən elektrik stansiyalarının, bir sıra iri sənaye müəssisələrinin işində texniki səbəblər üzündən dayanmalar və bu sahələrə təbii qazın nəqlində fasilələr olduqda, təchiz olunan qazın həcmi kəskin azaldıqda texnoloji rejimə uyğun olaraq fasiləsiz və etibarlı qaz təchizatının təmin olunmasında yeraltı qaz anbarlarının rolu əhəmiyyətlidir. Yeraltı qaz saxlama anbarları üçün ən əlverişlisi vaxtı ilə istismarda olub sonralar tükənmiş neft, qaz, su yataqları olan laylar və yeraltı məsaməli, su saxlayan qüvvə şəkilli lay təbəqələridir.Ölkəmizdə Qalmaz və Qaradağ qaz yataqları əsasında 1976-ci ildə Qalmazda, ikinci növbədə Qaradağ rayonunda 1986-ci ildə yeraltı qaz saxlama anbarları (YQSA) inşa edilmişdir. 2009-2011-ci illərdə həmin anbarların yenidən qurulması işləri aparılmışdır.

**9. Təbii və səmt qazların odorizasiya olunması nədir?**

Məişətdə otaq daxilində yerləşən qaz xətləri və qaz cihazlarında hər-hansı səbəbdən yaranan qaz sızması bir çox hallarda yanğın və partlayış

hadisələrinin yaranması ilə nəticələnir ki, bu da arzu olunmazdır. Bu hadisələrdən qurtulmaq üçün QPS və QTM-lərdə istehlakçılara nəql olunan təbii və səmt qazlarına xüsusi kəskin iyə malik olan kimyəvi maddə - etilmerkaptan ($C_2H_2SH_2$) və yaxud tetrahidrotiofen ($C_4H_8S$), qış fəslində 1000m$^3$ həcmə 16qram, yay fəslində 1000 m$^3$ həcmə 8 qram əlavə olunur. Təkcə yanar qazlar deyil, qaz kəmərlərində pnevmatik sınaq işləri aparılarkən kəmərə vurulan hava da odarizə oluna bilər.

**10. Təbii qaz, onun fiziki kimyəvi xassələri və partlayış həddi haqqında nə deyə bilərsiniz?**

İstehlakçılara verilən təbii qaz 5542-87 QOST-na uyğun olmalıdır. Təbii qazın tərkibinin əsas hissəsini metan təşkil etdiyindən onun fiziki kimyəvi xassələri metan qazına aid olan xüsusiyyətlərdir. Metan qazı – $CH_4$ – iysiz və rəngsiz, havadan təxminən 1,8 dəfə yüngül qazdır, xüsusi çəkisi 0,714 kq/m$^3$. Qapalı şəraitdə havanın tərkibində 5-15 % təbii qaz olduqda partlayış həddi yaranır. 1m$^3$ təbii qazın yanması üçün 9,52 m$^3$ hava tələb edilir.

**11. Bioqaz haqqında nə bilirik?**

Bioqaz üzvi maddələrin mikroorqanizmlərinin sərbəst oksigen olmadan çürüyərək tərkib hissələrinə ayrılıb artması şəraitində alınan yanar qaz məhsuludur. Tərkib hissəsi 60-80% metan və karbon dioksiddən ibarətdir. İstiliktörətmə qabiliyyəti 6000-6500 kkal/m$^3$ həddindədir. Bioqazın alınması əsas xammal bitki və heyvan mənşəli bioloji kütlədir. Bioqaz xüsusi qurğu tətbiq etməklə alınır.

**12. Yanacaq kimi istifadə edilən yanar qazlar hansı standartlara uyğun olmalıdır?**

Yanacaq kimi istifadə edilən yanar qazlar hazırda Azərbaycan Respublikasında qüvvədə olan standartlara uyğun olmalıdırlar:

- təbii qaz – ГОСТ 5542-87;
- mayeləşdirilmiş qazlar – ГОСТ 20448-90.

Digər növ yanar qazlar (alternativ yanacaq növü) istifadə edildikdə, qaz təsərrüfatı müəssisələri tərəfindən həmin qazın xüsusiyyətləri nəzərə alınmaqla xüsusi istismar təlimatı tərtib edilməli, müvafiq qaydada Dövlət Qaz Nəzarəti İdarəsi ilə razılaşdırılmalıdır.

**13. Ölkə ərazisində qaz paylayıcısının və təbii qaz istehlakçısının öhdəlikləri hansı sənədlə tənzimlənir ?**

Ölkə ərazisində qaz paylayıcısının və təbii qaz istehlakçısının öhdəlikləri Azərbaycan Respublikası Nazirlər Kabinetinin 12.05.2011-ci il tarixli 80 №-li qərarı ilə təsdiq edilmiş "Qazdan istifadə Qaydaları" ilə tənzimlənir.

**14. Qaz təsərrüfatı sisteminə, şəbəkəsinə nələr aiddir?**

Qaz təsərrüfatı sisteminə aşağıdakılar aiddir:

- qaz kəmərləri və onların avadanlıqları;
- kondensat yığıcılar;
- qazpaylayıcı qurğular və məntəqələr (punktlar, şkaflar), qaz paylayıcı stansiyalar (QPS-lər);
- avtomatlaşdırma və idarəetmə avadanlıqları;
- nəzarət-ölçü cihazları, məişət qaz cihazları;
- qaz kəmərlərinin korroziyadan mühafizə qurğu və vasitələri;
- idarə və müəssisələrin inzibati-məişət binaları, kooperativ (özəl), kiçik müəssisələr və bu kimi digər idarə və təşkilatların qaz avadanlıqları.

**15. Qaz təchizatı sistemlərinin istismarına nələr daxildir?**

- texniki xidmət;
- təmir işləri (cari və əsaslı təmir);
- qəza-bərpaetmə işləri;
- mövsümi işləyən avadanlıqların qoşulması və açılması.

**16. Qazpaylayıcı sistem və qazpaylayıcı şəbəkə dedikdə nə başa düşülür?**

**Qazpaylayıcı sistem** – bir-biri ilə texnoloji, təşkilatı və iqtisadi əlaqəsi olan qazın nəqlini və birbaşa istehlakçılara verilməsini həyata keçirən istehsalat kompleksi deməkdir.

**Qazpaylayıcı şəbəkə** – qazın mənbəyindən istehlakçıların qaz kəməri girişlərinə qədər olan xarici qaz kəmərləri və onların üzərində olan tikili, avadanlıq və texniki qurğular sistemi deməkdir.

**17. Qazpaylayıcı mənbə dedikdə nə başa düşülür?**

**Qazpaylayıcı mənbə** – qazın qazpaylayıcı sistemlərə verilməsini təmin edən qaz təchizatı sistemlərinin ayrı-ayrı elementləri (məsələn: QPS – qazpaylayıcı stansiya) deməkdir.

**18. Buraxılış-sazlama işləri nə deməkdir?**

Qaz qurğusunun işə buraxılmasına hazırlığı, işə buraxılmasını və qaz qurğusunun işlək gücünün qurğu sahibi ilə razılaşdırılmış səviyyəyə çatdırılmasını nəzərdə tutan kompleks işlərə buraxılış-sazlama işləri deyilir.

**19. Rejim-sazlama işləri nəyə deyilir?**

Qaz qurğularının faydalı iş əmsallarının işçi diapazonunda layihə (pasport) göstəricilərinə uyğunluğuna nail olunması və yanacağın yandırılma proseslərinin avtomatik tənzimlənmə vasitələrinin sazlanmasını nəzərdə tutan kompleks işlərə rejim-sazlama işləri deyilir.

**20. Texniki şərt nə deməkdir?**

Tikinti obyektlərinin qaz təchizatı üçün layihələndirilməsinə əsas olan və qazın verilməsi ilə bağlı mühəndis-texniki parametrləri özündə əks etdirən texniki sənədə texniki şərt deyilir.

**21. Qaz paylayıcı stansiyalar hansı məqsədlə inşa edilir?**

Qaz paylayıcı stansiyalar (QPS) və qaz tənzimləyici məntəqələr (QTM) təbii qazı məişət və kommunal-sənaye obyektlərinə, şəhər qaz şəbəkələrinə təmizlənmiş, qurudulub odarizə olunmuş, həcmi kub metrlərlə ölçülmüş halda vermək üçün magistral qaz kəmərlərindən ayrılmalar (qollar) üzərində quraşdırılır. Qaz paylayıcı stansiyalar təyinatlarına görə bir neçə çıxışlı olmaqla texnoloji rejim tələbləri əsasında təzyiqin və qaz sərfinin bilavasitə tənzimlənməsini həyata keçirir.

**22. Paylayıcı sistemlərin seçilməsi, qazpaylayıcı stansiyaların (QPS) və qaz tənzimləyici məntəqələrin (QTM) sayı necə təyin edilir?**

Paylayıcı sistemlərin seçilməsi, qaz paylayıcı stansiyaların (QPS) və qaz tənzimləyici məntəqələrin (QTM) sayının təyin edilməsi, paylayıcı qaz kəmərləri sxemlərinin (həlqəvi, dalanlı, qarısıq) qəbul edilməsi, qaz tələbatının həcmi, strukturu, sıxlığı, qaz təchizatının etibarlığı, həmcinin tikintinin aparıldığı yerin vəziyyəti və istismar səraiti nəzərə alınmaqla, texniki-iqtisadi hesabatlar əsasında həyata kecirilməlidir.

**23. Xarici qaz kəməri dedikdə nə başa düşülür?**

**Xarici qaz kəməri -** binadan kənarda çəkilmiş, binanın xarici divarının konstruksiyasına qədər olan yeraltı, yerüstü və ya yer səthindən yuxarı çəkilən qaz kəmərinə deyilir.

**24. Daxili qaz kəməri dedikdə nə başa düşülür?**

**Daxili qaz kəməri** – binanın xarici divarlarının konstruksiyasından binanın daxilində yerləşən qaz cihazlarının birləşdirilməsinə qədər olan qaz kəməri nəzərdə tutulur.

**25. Qaz kəmərlərinə mühafizə zonasının ayrılması nə üçün tələb edilir?**

Qaz kəmərlərinin və onların üzərində quraşdırılan qurğuların və avadanlıqların normal şəraitdə istismar edilməsini və zədələnmədən qorunmasını təmin etmək üçün qaz kəməri boyu və qazpaylayıcı şəbəkələrin digər obyektləri üçün mühafizə zonaları ayrılmalıdır. Mühafizə zonalarındakı ərazilərdən xüsusi şərtlərlə istifadə oluna bilər.

**26. Qaz kəmərləri, cihazlar və qurğular hansı sənəd əsasında quraşdırılır ?**

Qaz təchizatı sistemlərinin (şəhər, qəsəbə, kənd və sair yaşayış məntəqələrinin qaz təchizatı) və ayrı-ayrı qaz kəmərləri və avadanlıqlarının tikintisi “Azəriqaz” İstehsalat Birliyi (və ya aidiyyatı üzrə Qaz təchizatı müəssisələri) tərəfindən verilmiş texniki şərtlərə əsasən Dövlət tikinti norma və qaydalarının (TN və Q), həmçinin “Qaz təsərrüfatında texniki təhlükəsizlik qaydaları”nın tələblərinə uyğun olaraq layihələndirilmiş və müvafiq qaydada təsdiq edilmiş layihə-smeta sənədləri əsasında həyata keçirilir.

**27. Qaz təsərrüfatı müəssələri və onların işçiləri xidmətləri zamanı nələri təmin etməlidirlər?**

- bütün istehlakçıların qazla gün ərzində fasiləsiz təchizatını;
- qaz təchizatı sisteminin təhlükəsizliyini;
- qaz kəmərləri və avadanlıqlarının quraşdırılmasına nəzarəti və tikilməkdə olan obyektlərin istismara qəbul edilməsini;
- qaz kəmərləri və avadanlıqlarının texniki xidmətinin təşkilini və vaxtında keçirilməsini;
- bütün kateqoriyalardan olan istehlakçıların qazdan səmərəli istifadə etmələrinə və qaz sərfinin qeydə alınmasına nəzarəti;
- qaz təsərrüfatında istehsal proseslərinin effektivliyini, etibarlığını və təhlükəsizliyini təmin edən yeni texnikanın tətbiq edilməsini;
- baş verən qəza və bədbəxt hadisələrin vaxtında aradan qaldırılması

üçün müvafiq tədbirlərin hazırlanması məqsədilə onların tədqiqi, qeydə alınması və təhlilini;

- qazdan düzgün istifadə edilməsi və təhlükəsizlik qaydaları haqqında əhalinin təlimatlandırılmasını və bu sahədə müvafiq təbliğatın aparılmasını.

**28. Layihələndirmə normalarına görə qaz kəmərlərinin trasının relyefinin başlanğıc və son nöqtələri arasındakı fərqin göstəricisi neçə olmalıdır ki, qaz kəmərinin hidravliki hesabatında relyef nəzərdə tutulsun?**

Qaz kəmərlərinin trasının relyefinin başlanğıc və son nöqtələri arasındakı fərq 200 metrdən çox olmalıdır.

**29. Əhalisinin sayı 100 min nəfərdən artıq, seysmikliyi 8 və 9 bal olan yaşayış məntəqələrində qaz təchizatı sistemi layihələndirildiyi zaman neçə qaz paylayıcı stansiya nəzərdə tutulmalıdır, QPS-in yerləşməsnə əsas tələb hansılardır ?**

Ən azı 2 qaz paylayıcı stansiya nəzərdə tutulmalıdır və QPS-lər yaşayış məntəqəsinin bir-birinə əks tərəflərində yerləşdirilməlidir.

**30. Şəhərlərin və kəndlərin baş planları hazırlanarkən 1 nəfər üçün illik qaz tələbatı norması necədir?**

Şəhərlərin və digər yaşayış məskənlərinin baş planları hazırlanarkən 1 nəfər üçün illik qaz tələbatı normasının, $m^3$/il, qazın yanma istiliyi 34 MC/$m^3$ (8000 kkal/$m^3$) olduqda, aşağıdakı kimi qəbul edilməsinə yol verilir:

- mərkəzləşdirilmiş isti su təchizatı olduqda – 100;
- isti su təchizatı qaz su qızdırıcılarından olduqda – 250;
- hec bir nov isti su təchizatı olmadıqda – 125 (kənd yerləri ucun 165).

**31. Ölkə ərazisində yaşayış məntəqələrinin qazlaşdırılması üçün layihə-smeta sənədləri tərtib edilərkən hansı normativ sənədlərə istinad edilir?**

Yaşayış məskənləri ərazisində izafi təzyiqi 1,2MPa-dan (12 kqq/$sm^2$-dən) yüksək olmayan yeni tikilən və yenidən qurulan qaz təchizatı sistemləri və obyektlərinin həmçinin yaşayış məskənləri arasındakı qaz kəmərlərinin tikintisi üçün layihə smeta sənədləri tərtib edilərkən Azərbaycan Respublikasının Dövlət Şəhərsalma və Arxitektura Komitəsinin 02. 03. 09.

tarixli 17 №-li əmri ilə təsdiq edilmiş AzDTN 2.13-1 "Qaz təchizatı. Layihələndirmə normaları"na istinad edilməlidir.

**32. Qaz kəmərlərinin və qaz avadanlıqlarının istismara qəbulu hansı sənədlərə əsasən və necə həyata keçirilməlidir?**

Qaz kəmərlərinin və qaz avadanlıqlarının istismara qəbulu AzDTN 1.6-1, СниП 3.05.02-88*, "Qaz təsərrüfatında texniki təhlükəsizlik qaydaları"nın və eləcə də digər normativ sənədlərin tələblərinə uyğun olaraq həyata keçirilməlidir.

Polietilen borulardan tikilmiş qaz kəmərlərinin istismara qəbulu həyata keçirilərkən istismar təşkilatları qabaqcadan aşağıdakılarla təmin edilməlidirlər:

- müxtəlif ölçülü (diametrli) polietilen borular və onların birləşdirici hissələri (detalları);
- təmir işlərini yerinə yetirmək üçün lazım olan avadanlıq və alətlər (siyahı əlavə olunur).

Həmçinin Tikinti-quraşdırma işləri başa çatdıqdan sonra qaz kəmərlərinin və onun qurğularının üfürülməsi və sınağı qaz vasitəsilə aparıldığı halda, tikinti təşkilatı, göstərilən işləri təhlükəsiz yerinə yetirmək üçün sifarişçi ilə razılaşdırılmış təlimatı Azərbaycan Respublikası FHN-nin Sənayedə İşlərin Təhlükəsiz Görülməsi və Dağ-mədən Nəzarəti Dövlət Agentliyinə və Dövlət Qaz Nəzarəti İdarəsinə təqdim edərək onlardan rəsmi icazə almalıdır.

**33. İstismara qəbul olunan qaz kəmərlərinə və onun avadanlıqlarına qaz buraxılana qədər sifarişçi nələri yerinə yetirməlidir?**

- Qaz təchizatı müəssisəsinin imtahan komissiyası (zəruri hallarda Fövqəladə Hallar Nazirliyi və Dövlət Qaz Nəzarəti İdarəsinin nümayəndələrinin iştirakı ilə) tərəfindən qaz kəmərlərinin və onun avadanlıqlarının istismarı və təmiri üzrə cavabdeh məsul şəxslərin və xidmət işçilərinin biliklərinin yoxlanılmasını;
- təsdiq olunmuş normativ sənədlərin siyahısına əsasən qaz kəmərlərinin və onun avadanlıqlarının istismarına aid olan sənədlərin (istehsalat, texnoloji, əməyin mühafizəsi və yanğına qarşı təlimatları, texniki xidmət, təmir, həmçinin təsadüfi baş verə biləcək qəzalar və onların ləğvi planlarını, qaz kəmərlərinin və avadanlıqlarının

sxemlərini) iş yerlərində oxuna bilən yerlərdən asılmasını;

- Azərbaycan Respublikası Fövqəladə Hallar Nazirliyinin Dövlət Baş Yanğın İdarəsinin (Xidmətinin) müvafiq təlimatına uyğun olaraq obyektlərin yanğınsöndürmə vasitələri ilə təmin edilməsini;
- müvafiq tikinti norma və qaydalarının tələblərinə əsasən bütün texniki-icra sənədlərinin Qaz təchizatı müəssisəsinə təhvil verilməsini;
- yaşayış və digər qazlaşdırılmış binaların qaz sobalarının, tüstü bacaları və tüstü borularının, ventilyasiya kanalları və qurğularının istismara hazırlanmasını.

**34. Hansı obyektlərə təbii qazın verilməsi qəti qadağandır?**

Dövlət komissiyası və Baş idarələrin müvafiq komissiyası tərəfindən qəbul olunmamış, həmçinin Dövlət Qaz Nəzarəti İdarəsindən xüsusi icazə verilməmiş obyektlərə qazın verilməsi və ya onun avadanlıqlarının istismara buraxılması qəti qadağandır.

**35. Qaz kəmərlərində və onun avadanlıqlarında, hər hansı bir tikinti, yenidən qurma və təmir işləri başa çatdırılaraq istismara veriləndən sonra istismar təşkilatı necə gün ərzində lazımi qeydləri aparmalıdır?**

Qaz kəmərlərində və onun avadanlıqlarında, hər hansı bir tikinti, yenidənqurma və təmir işləri başa çatdırılaraq istismara veriləndən sonra 3 gün ərzində, istismar təşkilatı mövcud qaz avadanlıqlarının texniki pasportlarında görülmüş dəyişikliklər haqqında lazımi qeydiyyatlar aparmalıdır.

Obyekt istismara qəbul edildikdən sonra tikintiyə aid olan bütün layihə və texniki icra sənədləri, o cümlədən təsdiq olunmuş qəbul aktının bir nüsxəsi (akta əlavə olunan sənədlərlə birlikdə) istismarçı təşkilatda (Qaz təchizatı müəssisələrində) mütləq saxlanılmalıdır.

**36. Qaz kəmərinin muhafizə zonası nə deməkdir?**

Qaz kəmərinin muhafizə zonası - qaz kəmərlərinin və onların uzərində qurasdırılan qurğuların və avadanlıqların normal səraitdə istismar edilməsini və zədələnmədən qorunmasını təmin etmək ucun qaz kəməri boyu və qazpaylayıcı səbəkələrin digər obyektləri ucun nəzərdə tutulan və xususi sərtlərlə istifadə olunan ərazidir.

**37. Yeni tikilmiş qaz kəmərlərinin istismarda olan qaz kəmərlərinə qoşulması üçün əsas sənəd hansıdır?**

Yeni tikilmiş qaz kəmərlərinin istismarda olan qaz kəmərlərinə qoşulması üçün əsas, Dövlət Qaz Nəzarəti İdarəsinin nümayəndəsinin iştirak etdiyi səlahiyyətli komissiya tərəfindən, həmin obyektin istismara qəbulu haqqında rəsmiləşdirilmiş aktdır.

**38. Qaz təchizatı müəssisəsində qəza, təmir-bərpa xidmətləri (qəza-dispetçer xidməti) nə məqsədlə yaradılır?**

Qəzaların məhdudlaşdırılması və ləğvi üzrə işlərin yerinə yetirilməsi, eləcə də qazın qəbulu, istehlakçılara paylanması və qaz kəmərlərində normal təzyiq rejimlərinin saxlanması üçün hər bir Qaz təchizatı müəssisəsində qəza, təmir-bərpa xidmətləri (qəza-dispetçer xidməti) yaradılır.

Bu xidmətlərin işi bütün gün ərzində təmin edilməlidir.

**39. Qaz təchizatı sistemlərinə xidmət edən qəza, təmir-bərpa xidmətlərinin idarəetmə sisteminə nələr daxildir?**

- qazın təchizatçılardan qəbul edilməsi və istehlakşılara buraxılması rejimlərinin tənzimlənməsi;
- təchizatçılar tərəfindən qazın verilməsində müqavilə şərtlərinə (qazın tərkibinin texniki şərtlərə uyğunluğuna, proqnozlaşdırılan qazın həcminə, müəyyən edilmiş təzyiq rejimlərinə) əməl edilməsinə nəzarət;
- təchizatçıların növbətçi heyəti ilə bütün gün ərzində operativ rabitə əlaqəsinin saxlanması;
- xidmət olunan qaz nəqli xətləri və şəbəkələrinin normal və xüsusi şəraitlərdə (qaz çatışmadıqda, qəza vəziyyətində, qaz kəmərlərinin ayrı-ayrı sahələrində təmir işləri yerinə yetirildiyi zaman, yeni obyektlər (qaz kəmərləri, QTM-lər, iri istehlakçılar) istismara buraxıldıqda iş rejimlərinin tənzimlənməsi;
- qaz təchizatı sistemində qazın təzyiqi və sərfi üzrə toplanmış rejimlərin təhlili, QTM-in fəaliyyət zonasının müəyyənləşdirilməsi, sistem üzrə eyni vaxtda qazın təzyiqinin ölçülməsi, qaz şəbəkəsinin yeni daha səmərəli iş rejimlərinin işlənilməsi və tətbiq edilməsi, bütövlükdə sistemin və onun ayrı-ayrı rayonları üçün təzyiq rejimlərinin tənzimlənməsi üzrə metodikaların işlənilməsi;

- qaz çatışmazlığı müddətində qaz təchizatı qrafikinə uyğun olaraq iri istehlakçıların (obyektlərin) qaz təchizatı şəbəkəsindən açılması və qoşulması;
- təmir, qəza, yeni qaz kəmərlərinin qoşulması işləri yerinə yetirilən zaman qaz şəbəkəsinin ayrı-ayrı sahələrinin açılması və ya onlarda qazın təzyiqinin aşağı salınması;
- lazımi istismar sənədlərinin aparılması və saxlanılması.

**40. Azərbaycan Respublikasının Dövlət Tikinti Normaları (AzDTN) 2.13-1, (Qaz təchizatı. Layihələndirmə normaları) hansı qazlaşma işlərinə şamil edilir?**

Bu normalar qazdan yanacaq kimi istifadə edən istehlakcıları izafi təzyiqi 1,2MPa-dan (12 kqq/sm2-dən) yuksək olmayan təbii qazla və qaz-hava qarısığı ilə, izafi təzyiqi 1,6MPa-ya (16 kqq/sm2-ə) qədər (daxil olmaqla) olan mayeləşdirilmiş karbohidrogen qazı (MKHQ) ilə təmin edilən yaşayış məskənləri ərazisində yeni tikilən, yenidən qurulan və genişləndirilən qaz təchizatı sistemləri və obyektlərinin, həmcinin yaşayıs məskənləri arasındakı qaz kəmərlərinin və qazdan yanacaq və xammal kimi istifadə edən sənaye müəssisələrinin sahələrindən kənarda çəkilən xarici qaz kəmərlərinin layihələndirilməsinə samil edilir.

## II FƏSİL
## XARİCİ QAZ KƏMƏRLƏRİ VƏ ÜZƏRİNDƏKİ AVADANLIQLAR, ONLARIN TİKİNTİSİ VƏ İSTİSMARI QAYDALARI HAQQINDA

**1. Xarici qaz kəmərləri və qurğuları anlayışı dedikdə nə başa düşülür?**

Qaz paylayıcı stansiyadan və ya qaz tənzimləyici məntəqədən qaz istehlakçılarına (binaların və qurğuların xarici divarlarına) qədər əhalinin məskunlaşdığı ərazilərdə çəkilən xarici qaz kəmərləri, bir qayda olaraq "AzDTN 2.6-1. Şəhər, qəsəbə və kənd yaşayış məskənlərinin planlaşdırılması və tikilib abadlaşdırılması" normativ sənədin 6.2÷6.57-ci bəndlərinin tələblərinə uyğun olaraq əsasən yeraltı nəzərdə tutulmalıdırlar. Xarici qaz kəmərlərinin yerüstü dayaqlarda çəkilməsinə də yol verilə bilər. Bu əməliyyat yaşayış məhəllələri və həyətləri daxilində, həmçinin trassaların ayrı-ayrı sahələrində tətbiq oluna bilər. AzDTN 2.6-1 normativ sənədin 6.17-ci bəndinin tələbinə uyğun olaraq qaz kəmərlərinin çəkilmə dərinliyi və ya futlyarın üstündən yerin səthinə qədər 0,8 m-dən az olmamasına xüsusi fikir verilməlidir. Yerüstü və yer səthindən yuxarı çəkilən qaz kəmərləri "AzDTN 2.6-1. Şəhər, qəsəbə və kənd yaşayış məskənlərinin planlaşdırılması və tikilib abadlaşdırılması" normativ sənədin 6.22÷6.57-ci bəndlərinin tələblərinə uyğun olmalıdır.

**2. Yaşayış məskənlərində qaz kəmərləri təzyiqlərinə görə neçə yerə bölünür?**

Yaşayış məskənlərində qaz təchizatı sistemlərinin qaz kəmərləri, nəql edilən qazın təzyiqindən asılı olaraq 3 yerə bölünür:

- aşağı təzyiqli qaz kəmərləri – qazın isçi təzyiqi 0,005 MPa-ya (0,05 kqq/sm$^2$-ə) qədər (daxil olmaqla);
- orta təzyiqli qaz kəmərləri – qazın isçi təzyiqi 0,005 MPa-dan (0,05 kqq/sm$^2$-dən) yuxarı 0,3 MPa-ya (3 kqq/sm$^2$-ə) qədər;
- yüksək təzyiqli qaz kəmərləri – isçi təzyiqi 0,3 MPa-dan (3 kqq/sm$^2$-dən) yuxarı.

**3. Xarici qaz kəmərləri necə çəkilməlidir?**

Yaşayış məntəqələri ərazisində xarici qaz kəmərləri əsasən torpağa basdırılmalı, sənaye və kommunal müəssisləri ərazisində isə yerin üstü ilə çəkilməlidir.

Məntəqələrarası qaz kəmərlərinin çəkilməsi həm yeraltı, həm də yerüstü aparıla bilər (dayaqlar üzəri ilə, yaxud yaşayış və ictimai binaların xarici boyu ilə). Binaların divarının xarici hissəsindən yeraltına keçən bütün yeraltı kommunikasiyaların girişləri və çıxışları kipləşdirilməlidir.

Təzyiqi 6 kqq/sm$^2$ (0.6Mpa) qədər olan qaz kəmərləri yanmayan (dəmir-beton, metal və daş) avtomobil və piyada körpüləri ilə, 12kqq/sm$^2$ (1,2Mpa) qədər təzyiqli qaz kəmərləri isə bəndlər və başqa hidrotexniki tikililərin üzəri ilə çəkilə bilər.

**4. Qaz kəmərlərinin girişlərinin binaların bünövrələrindən və bünövrələrin altından keçməsinə yol verilirmi?**

Qaz kəmərlərinin girişləri binaların bünövrələrindən və bünövrələrin altından kecməməlidir. Qaz kəmərlərinin QTM-yə girişlərində və cıxışlarında bünövrələrlə kəsişməsinə yol verilir. Qaz kəməri girişlərinin zirzəmilərdə, lift otaqlarında, ventilyasiya kameralarında və şaxtalarında, zibil toplanan otaqlarda, transformator yarımstansiyalarında, paylayıcı qurğularda, maşın bolmələrində, anbar otaqlarında, partlayış və partlayış-yanğın təhlükəsinə görə A və Б kateqoriyalarına aid edilən otaqlarda yerləşdirilməsinə yol verilmir.

**5. Qaz təchizatı sistemlərinin qaz kəmərləri, nəql edilən qazın təzyiqindən asılı olaraq hansı kateqoriyalara ayrılırlar ?**

- I kateqoriyalı yüksək təzyiqli qaz kəmərləri – təbii qaz və qaz-hava qarısığı ucun qazın isci təzyiqi 0,6 MPa-dan (6kqq/sm2-dən) yuxarı 1,2 MPa-ya (12kqq/sm2-ə) qədər (daxil olmaqla), mayeləşdirilmiş karbohidrogen qazı (MKHQ) uçun 1,6MPa-ya (16 kqq/sm2-ə) qədər;
- II kateqoriyalı yüksək təzyiqli qaz kəmərləri – isci təzyiqi 0,3 MPa-dan (3kqq/sm2-dən) yuxarı 0,6MPa-ya (6kqq/sm2-ə) qədər;
- orta təzyiqli qaz kəmərləri – qazın isci təzyiqi 0,005MPa-dan (0,05 kqq/sm2-dən) yuxarı 0,3MPa-ya (3 kqq/sm2-ə) qədər;
- alcaq təzyiqli qaz kəmərləri – qazın isci təzyiqi 0,005MPa-ya (0,05 kqq/sm2-ə) qədər (daxil olmaqla);

**6. Torpaqda qoyulan qaz kəmərlərində sökülə bilən (yivli) birləşmələr qoyula bilərmi?**

Torpaqda qoyulan qaz kəmərlərində sökülə bilən birləşmələrin nəzərdə tutulmasına yol verilmir.

Həmçinin yaşayıs binalarının və qeyri-istehsalat xarakterli ictimai binaların pəncərələrinin və balkonlarının altından çəkilən qaz kəmərlərində sökulən birləşmələrin nəzərdə tutulmasına yol verilmir.

**7. Yeraltı qaz kəmərləri istilik şəbəkəsi kanalları, kommunikasiya kollektorları və digər müxtəlif təyinatlı kanallarla kəsişdiyi yerlərdə hansı tələblər gözlənilməlidir?**

Yeraltı qaz kəmərləri istilik şəbəkəsi kanalları, kommunikasiya kollektorları və digər müxtəlif təyinatlı kanallarla kəsişdiyi yerlərdə (kəsişən qurğuların altından və ya üstündən keçməklə), kəsişdiyi qurğuların xarici divarlarından hər tərəfə 2 m çıxmaqla futlyarda qoyulmalıdırlar. Eyni zamanda kəsişmə hüdudlarında və kəsişən qurğuların xarici divarlarından hər tərəfə 5 m məsafədə bütün qaynaq birləsmələri dağıdıcı təsiri olmayan nəzarət usulu ilə yoxlanılmalıdır. Futlyarın bir ucunda mühafizə qurğusunun altına çıxan nəzarət borucuğu nəzərdə tutulmalıdır.

**8. Qaz kəmərləri binaların xarici divarlarından keçdiyi yerlərdə hansı tələblər yerinə yetirilməlidir?**

Qaz kəmərləri binaların xarici divarlarından keçdiyi yerlərdə futlyarda qoyulmalıdır. Boru ilə futlyar arasındakı boşluq kəsişən konstruksiyanın butun qalınlığı boyu əsaslı surətdə doldurulmalıdır. Futlyarın ucları elastiki materiallarla kipləsşdirilməlidir.

**9. Tərkibində çürüntülər və inşaat zibilləri olan qruntlarda qaz kəmərlərinin çəkilməsi necə olmalıdır?**

Tərkibində çürüntülər və inşaat zibilləri olan qruntlarda qaz kəmərlərinin çəkilməsi, qaz kəmərlərinin altında qalınlığı 10 sm-dən az olmayan yumşaq və ya qumlu əsaslar düzəltməklə nəzərdə tutulmalıdır, qaz kəmərinin yerləşdiyi xəndək bütün dərinlik boyu həmin növ qruntla tam doldurulmalıdır.

Yükdaşıma qabiliyyəti 0,025 MPa-dan (0,25kqq/sm2-dən) az olan qruntlarda, həmçinin tərkibində çürüntülər və inşaat zibilləri olan

qruntlarda xəndəklərin dibi beton tirlər, antiseptikalı taxta tirlər, paya əsaslar qoyulmaqla və ya çınqıl, qırmadaş ilə möhkəmləndirilməlidir. Bu halda qaz kəmərinin altına və xəndəklərin doldurulmasına verilən qrunt bu bəndin birinci hissəsindəki kimi qəbul edilməlidir.

**10. Yerüstu və yer səthindən yuxarı çəkilən qaz kəmərlərinin tikintisi zamanı hansı tələblər gözlənilməlidir?**

Yer səthindən yuxarı çəkilən qaz kəmərləri yanmayan materiallardan olan ayrı-ayrı dayaqlar, sütunlar, rəflər üzərində və ya binaların divarları ilə cəkilməlidir.

Bu halda aşağıdakı çəkilmələrə yol verilir:

- ayrı-ayrı dayaqlarda, sütunlarda, estakadalarda və rəflərdə – bütün təzyiqli qaz kəmərlərinin;
- В, Г və Д kateqoriyalı otaqları olan istehsalat binalarının divarları ilə təzyiqi 0,6MPa-ya (6 kqq/sm2-ə) qədər olan qaz kəmərlərinin;
- odadavamlılıq dərəcəsi III – IIIa-dan aşağı olmayan yaşayıs evlərinin və ictimai binaların divarları ilə – təzyiqi 0,3MPa-ya (3 kqq/sm2-ə) qədər olan qaz kəmərlərinin;
- IV–V odadavamlılıq dərəcəsi olan yaşayıs evlərinin və ictimai binaların divarları ilə, bir qayda olaraq, şərti diametri 50 mm-dən yuxarı olmayan alçaq təzyiqli qaz kəmərlərinin, qaz təzyiq tənzimləyiciləri bu binaların xarici divarlarında və digər konstruksiyalarında yerləşdirildikdə isə təzyiqi 0,3MPa-ya (3kqq/sm2-ə) qədər olan qaz kəmərlərinin – tənzimləyicilərin girişinə qədər olan sahələrdə.

**11. Qaz kəmərlərinin hansı hallarda tranzit çəkilməsi qadağan edilir?**

- uşaq bağcalarının, xəstəxanaların, məktəb binalarının və tamaşa müəssisələrinin divarları ilə – butun təzyiqli qaz kəmərlərinin;
- yasayıs binalarının divarları ilə – orta və yuksək təzyiqli qaz kəmərlərinin;
- A və Б kateqoriyalı binaların və metal üzlüklu və polimer isidici materialı olan panel divarlı binaların divarları ilə bütün təzyiqli qaz kəmərlərinin çəkilməsi qadağan edilir.

**12. Yaşayış məskənləri ərazilərində polietilen borulardan qaz kəmərlərinin qurasdırılması necə həyata keçirilir?**

Yaşayış məskənləri ərazilərində polietilen borulardan qaz kəmərlərinin quraşdırılması, bir qayda olaraq, buxtalarda, sarğaclarda və ya barabanlarda göndərilən polietilen borulardan (uzun ölçülü) nəzərdə tutulmalıdır. Bu məqsədlər üçün standart ölçülü borulardan istifadə edilməsinə icazə verilir. Bu halda bütün qaynaq calaqları fiziki usulla 100%-li sınaqdan kecirilməlidir.

Qaz kəmərinin tikintisi üçün işlədilən polietilen boruların möhkəmlik ehtiyat əmsalı istehsal olunan borunun standartı üzrə 2,5-dən az olmamalıdır.

**13. Polietilen borulardan qaz kəmərinin çəkilməsinə haralarda yol verilmir?**

- yerüstu, yer səthindən yuxarıda, binaların daxilində, həmçinin tunellərdə, kollektorlarda və kanallarda;
- Qaz kəmərlərinin umumi dəmir yolu şəbəkələrindən və I-II dərəcəli avtomobil yollarından, sürətli yolların, magistral küçələrin və ümumşəhər əhəmiyyətli yolların altından, həmçinin suyun orta axın səviyyəsində eni 25 m-dən artıq olan su maneələrindən və III tip bataqlıqlarda layihələndirilən kecidlərin sahələrində;
- yasayıs məskənləri ərazilərində – təzyiq 0,3 MPa-dan yuxarı olduqda;
- yasayıs məskənləri ərazilərindən kənarda – təzyiq 0,6 MPa-dan yuxarı olduqda;
- yasayıs məskənləri ərazilərində II tip çökmə qruntlarında;
- tərkibində aromatik və xlorlanmış karbohidrogen olan qazları, həmçinin mayeləşdirilmiş karbohidrogen qazının (MKHQ) maye fazasını nəql etmək üçün.

**14. Polietilen qaz kəmərlərinin çəkilməsi borunun yuxarı səthindən neçə metr dərinlikdə nəzərdə tutulmalıdır və maillik nə qədər olmalıdır?**

Polietilen qaz kəmərlərinin çəkilməsi borunun yuxarı səthindən 1m-dən az olmayan dərinlikdə nəzərdə tutulmalıdır.

Mailliyi 1:5 və daha cox olan yerlərdə çəkilən qaz kəmərləri üçün xəndəklərin yuyulmasının qarşısını ala biləcək tədbirlər nəzərdə

tutulmalıdırlar. Qaz kəmərilərinin 1:2 və daha çox mailliklə çəkilməsinə yol verilmir.

**15. Qaz tənzimləyici məntəqənin (QTM) funksiyası nədən ibarətdir və hansı yerlərdə yerləşdirilməlidir?**

Qazın təzyiqinin aşağı salınması və tələb olunan səviyyədə saxlanılması üçün qaz təchizatı sistemlərində QTM və ya QTQ nəzərdə tutulmalıdır.
QTM texniki təyinatından və texniki məqsədə uyğunluğundan asılı olaraq aşağıdakı yerlərdə nəzərdə tutulmalıdır:

- binalara əlavə edilmiş tikililərdə;
- birmərtəbəli istehsalat binalarının və ya qazanxanaların daxilində əlavə tikililərdə;
- ayrılıqda dayanan binalarda;
- qazlaşdırılan binaların xarici divarlarında şkaflarda və ya ayrılıqda dayanan yanmayan materiallardan hazırlanan dayaqlarda;
- qazlasdırılan, I və II dərəcəli odadavamlılığı olan istehsalat binalarının yanmayan isidicili örtülərində;
- iqlim şəraiti texnoloji avadanlıqların (pasport göstəricilərinə əsasən) və nəzarət ölçü cihazlarının (NÖC) normal işini təmin edirsə, sənaye müəssisələrinin ərazilərində açıq hasara alınmış sahələrdə talvarın altında.

QTM-in yasayıs və ictimai binaların daxilində və onlara əlavə edilmiş tikililərdə (istehsalat xarakterli binalardan başqa) nəzərdə tutulması, həmçinin təyinatından asılı olmayaraq butun binaların zirzəmi və kürsülu otaqlarında yerləsdirilməsi qadağan olunur.
İqlim şəraiti imkan verərsə, avadanlıqların bir hissəsini (siyirtmələr, süzgəclər və.s.) QTM-dən çıxarmağa yol verilir. QTM-dən kənarda yerləşdirilən avadanlıqlar QTM binasına bitişik hasarla və ya QTM-in ümumi hasarı ilə əhatə olunmalıdırlar.

**16. Qaz tənzimləyici məntəqələr və qaz tənzimləyici qurğularda (şkaflarda) hansı avadanlıqlar quraşdırılır?**

Qaz tənzimləyici məntəqələrdə (QTM), qaz tənzimləyici qurğularda (QTQ) və qaz tənzimləyici şkaflarda (QTŞ) əsasən qaz tənzimləyicilər, qoruyucu və atqı klapanları ilə yanaşı bağlayıcı avadanlıqlar, nəzarət-ölçü cihazları yerləşdirilir. Bu qurğulardan qazın təzyiqinin aşağı salınması və

texnoloji rejimə əsasən tələb olunan səviyyədə saxlanılması üçün istifadə edilir. Burada tənzimləyici bir və ya iki yaruslu olmaqla yerləşdirilir. Paylayıcı qaz kəmərində əsasən özündən sonra tənzimləyicilər tətbiq edilir.

**17. Bağlayıcı və atıcı klapanların quraşdırılmasında məqsəd nədir?**

Qaz tənzimləyicilərdən əvvəl qoruyucu bağlayıcı və tənzimləyicidən sonra tənzimləyicinin çıxışında atqı klapanları istifadə edilir. Qoruyucu-atıcı klapanlar (məsələn PPK-4-50-16, PSK-50 və s.) təzyiq altında işləyən qabların üzərində, QPS və QTM-lərdə təzyiq tənzimləyicisindən və sərf ölçən cihazdan sonra quraşdırılır. Bu klapanlar təzyiqin verilmiş rejim həddindən 15% artıq qalxdığı zaman avtomatik olaraq açılıb artıq təzyiqi havaya atmalıdır.

Qaz tənzimləyici məntəqələrdə (QTM), qaz tənzimləyici qurğularda (QTQ) və qaz tənzimləyici şkaflarda (QTŞ) yerləşdirilmiş tənzimləyicilərdən sonra qoruyucu-ayrıcı klapanlar quraşdırılır ki, bunlardan respublikada ən geniş yayılmışları PKN (PKV) tipləridir. Bu klapanlar vasitəsilə qazın təzyiqi verilmiş həddən artıq olduqda (qalxdıqda), avtomatik olaraq klapanın bağlanılmasına şərait yaradılır və qaz axını dayandırılır.

**18. Dövrələmə qaz kəmərlərində (baypaslarda) ardıcıl olaraq neçə bağlayıcı qurğu qoyulmalıdır?**

Dövrələmə qaz kəmərlərində (baypaslarda) ardıcıl olaraq iki bağlayıcı qurğu qoyulmalıdır.

Dövrələmə qaz kəmərinin diametri qaz tənzimləyici klapanın yəhərinin diametrindən az olmamalıdır.

Girişdə qazın təzyiqi 0,6MPa-dan (6kqq/sm2-dən) yuxarı olan və buraxma qabiliyyəti 5000m3/saatdan artıq olan QTM-lər üçün, baypasların əvəzinə əlavə ehtiyat tənzimləyici xətləri nəzərdə tutulmalıdır.

**19. Qaz kəmərlərindən ağacların gövdəsinə qədər hansı məsafə saxlanılmalıdır?**

Qaz kəmərlərindən ağacların gövdəsinə qədər məsafə 1,5 metrdən az olmamalıdır. Ondan kol bitkilərinə qədər olan məsafə isə hüdudlanmır.

**20. Qaz kəməri ilə onun çəkildiyi divar arasındakı məsafə nə qədər olmalıdır?**

Qaz kəməri ilə onun çəkildiyi divar arasındakı məsafə elə olmalıdır ki, qaz kəmərinə və onun üzərində quraşdırılmış avadanlığa nəzarət etmək və təmir işləri aparmaq mümkün olsun.

**21. Şkaf tipli QTM-lər binaların divarlarında qoyulduqda məsafələr necə təyin olunmalıdır?**

Şkaf tipli QTM-lər binaların divarlarında qoyulduqda şkaflardan pəncərə, qapı yerlərinə və digər boşluqlara qədər olan üfüqi məsafələr qazın giriş təzyiqi 0,3MPa-ya (3 kqq/sm2-ə) qədər olduqda 3m-dən az, qazın giriş təzyiqi 0,3 MPa-dan (3 kqq/sm2-dən) 0,6 MPa-ya (6kqq/sm2-ə) qədər olduqda isə 5 m-dən az olmamalıdır.

Şkafdan pəncərə yerlərinə qədər şaquli məsafələr 5 m-dən az olmamalıdır. QTM-in girişində qazın təzyiqi 0,3 MPa-ya qədər olduqda, şkaf tipli QTM-in yaşayış evlərinin bütov divarlarında qoyulmasına yol verilir.

**22. Ayrılıqda dayanan QTM-dən üfüqi xətt üzrə məsafələr neçə metr olmalıdır?**

| QTM-in girişində qazın təzyiqi, MPa (kqq/sm2) | Ayrılıqda dayanan QTM-dən üfuqi xətt uzrə məsafələr, m, qədər | | | |
|---|---|---|---|---|
| | Binalara və qurğulara | Dəmir yolu və tramvay yoluna (yaxınlıqdakı relsə qədər) | Avtomobil yollarına (yolun kənarına qədər) | Hava ötürücü xəttinə |
| 0,6 (6)-ya qədər | 10 | 10 | 5 | Dayağın 1,5 hündürlüyündən az olmamaqla ---≪--- |
| 0,6 (6)-dan yuxarı 1,2 (12)-yə qədər | 15 | 15 | 8 | |
| *Qeyd. Məsafə binaların xarici divarlarından və ya QTM-in şkaflarından, avadanlıqlar açıq sahədə yerləşdikdə isə hasarın kənarından qəbul edilməlidirlər.* | | | | |

**23. QTM-in otaqlarının isidilməsi zərurəti necə müəyyən edilir və necə təmin edilir?**

QTM-in otaqlarının isidilməsi zərurəti iqlim şəraitindən, nəql edilən qazın nəmliyindən və tətbiq olunan avadanlıq və nəzarət-ölçü cihazlarının konstruksiyalarından asılı olaraq təyin edilməlidir.

İstilik daşıyıcılarının maksimum temperaturu $130^0$S-dən çox olmamalıdır. QTM-də yerli istilik sistemi qurulduqda isitmə qurğusu texnoloji, həmçinin digər otaqlardan aralıda yerləşən, sərbəst çıxışı olan və QTM-dən bütov, qaz buraxmayan və yanğına qarşı odadavamlılıq muddəti 2,5 saatdan az olmayan divarlarla əhatə olunmuş ayrıca otaqda yerləşdirilməlidir. İsitmə qurğusuna çəkilən qaz borusu və istilik sistemi boruları tənzimləyicilərin otaqlarının divarlarından keçdikdə, onların qaz sızma ehtimalını istisna edən kipkəcli sıxıcıları və ya digər sıxıcıları olmalıdır.
Şkaf tipli QTM-in isidilməsi üçün partlayış-yanğın təhlukəsizliyinin təmin olunması şərti ilə qaz odluqlarından istifadə edilməsinə yol verilir.

**24. QTM-nin bütün otaqlarında işıqlandırma və havalandırma necə təşkil edilməlidir?**

QTM-nin bütün otaqlarında təbii və süni işıqlandırma və 1 saat ərzində üç dəfədən az olmamaqla hava mübadiləsini təmin edən, daimi işləyən təbii ventilyasiya nəzərdə tutulmalıdır.

**25. QTM-də və QTQ-də üfürmə və atqı boruları nəzərdə tutulmalıdırmı və harada yerləşdirilməlidir?**

QTM-də və QTQ-də üfürmə və atqı boruları nəzərdə tutulmalıdır. Üfurmə boruları aşağıdakı yerlərdə yerləşdirilməlidirlər:

- daxil olan qaz kəmərlərində birinci bağlayıcı qurğudan sonra;
- dövrələmə qaz kəmərlərində (baypaslarda) iki bağlayıcı qurğunun arasında;
- təmir və proflaktiki işlərinin aparılması üçün bağlayıcı avadanlıqları olan qaz kəmərlərinin ayrı-ayrı sahələrində.

Üfurmə borusunun şərti diametri 20mm-dən az olmamalıdır. Eyni təzyiqli üfürmə borularının ümümi üfürmə boru kəmərinə birləşdirilməsinə yol verilir.
Qaz atqı klapanından (QAK) qazkənaredici atqı borusunun sərti diametri 20 mm-dən az olmamaqla, klapanın çıxış borucuğunun şərti diametrinə bərabər olmalıdır.
Qazın yayılması üçün təhlukəsiz şərait yaratmaq məqsədi ilə, üfürmə və atqı boruları binanın karnizindən 1m-dən az olmamaqla yuxarı çıxarılmalıdır. Üfürmə və atqı borularında dönmələrin sayı az olmalıdır.

Atmosfer yağıntılarının bu boruların içərilərinə daxil olmasına yol verməmək üçün, üfürmə və atqı borularının başında xüsüsi duzəltmə nəzərdə tutulmalıdır.

**26. QAK-nın buraxma qabiliyyətinin yoxlanılması necə həyata keçirilir?**

QAK-nın buraxma qabiliyyətinin yoxlanılması təzyiq altında işləyən tutumların (qabların) quruluşunu və təhlukəsiz istismarını tənzimləyən gaydalara əsasən aparılmalıdır.

QAK-dan atılmalı olan qazın miqdarı aşağıdakı kimi təyin edilməlidir:

- qaz təzyiq tənzimləyicilərindən qabaq QBK olduqda:

$Q \geq 0{,}0005$ Qd – dusturu ilə, (3)

burada - Q – bir saat ərzində QAK-dan atılan, qazın miqdarı, $m^3$/saat ($0^0$S-də və 0,10132MPa-da);

Qd – qaz təzyiq tənzimləyicisinin hesabi buraxma qabiliyyəti $m^3$/saat, ($0^0$S- də və 0,10132 MPa-da).

- qaz təzyiq tənzimləyicilərindən qabaq QBK olmadıqda:

zolotnikli qaz təzyiq tənzimləyiciləri üçün

$Q \geq 0{,}01Qd$, (4)

elektron tənzimləyicisi olan tənzimləyici qapaqlar üçün

$Q \geq 0{,}02$ Qd, (5)

QTM (QTQ)-də paralel olaraq bir neçə qaz tənzimləyici qoyulması lazım gəldikdə, QAK-dan atılan qazın miqdarı aşağıdakı düsturla təyin edilməlidir:

$Q' \geq Qn$, (6)

burada - Q′ – bir saat ərzində QAK-dan atılmalı olan, qazın ümumi miqdarı, $m^3$/saat ($0^0$S-də və 0,10132MPa-da);

n – qaz təzyiqi tənzimləyicilərinin sayı – ədədlə;

Q – hər bir tənzimləyici üçün bir saat ərzində QAK-dan atılan qazın miqdarı, $m^3$/saat ($0^0$Sdə və 0,10132MPa-da).

**27. Kombinasiya edilmiş tənzimləyicilərin yerləşdirilməsi necə təmin edilməlidir?**

Kombinasiya edilmiş (birləşdirilmiş) qaz təzyiq tənzimləyiciləri yanmayan materiallardan olan dayaqlar üzərində və ya odadavamlığı III – III a dərəcədən aşağı olmayan qazlaşdırılan binaların xarici divarlarında

(metal üzluk çəkilmiş və yanan istiləndiricisi olan panel divarlardan başqa) və ya binaların daxilində (yaşayış evlərindən və qeyri-istehsal xarakterli ictimai binalardan başqa) qoyulmalıdırlar.

Kombinasiya edilmiş təzyiq tənzimləyicisinə qazın giriş təzyiqi asağıdakılardan çox olmamalıdır:

- yasayış evləri və qeyri-istehsal xarakterli ictimai binalar üçün – 0,3 MPa (3kqq/sm2) tənzimləyici qazlaşdırılan binaların divarlarında qoyulduqda və 0,6MPa (6,0 kqq/sm2) tənzimləyici ayrılıqda dayanmış dayaqlarda yerləşdirildikdə;
- sənaye (o cümlədən qazanxanalar) və kənd təsərrufatı müəssisələri üçün – 0,6MPa (6,0 kqq/$sm^2$), tənzimləyici binaların divarlarında qoyulduqda və 1,2MPa (12,0 kqq/$sm^2$) tənzimləyici ayrılıqda dayanmış dayaqlarda yerləşdirildikdə.

Kombinasiya edilmiş təzyiq tənzimləyiciləri qaz kəmərinin üfüqi sahəsində, bir qayda olaraq, 2,2m-dən artıq olmayan hündürlükdə qoyulmalıdırlar. Tənzimləyicinin yuxarı hündürlükdə qoyulması zərurəti yarandıqda ona xidmət etmək üçün pilləkənli meydanca nəzərdə tutulmalıdır.

**28. QTM və QTQ yerləşdirilən şkaflar hansı materialdan hazırlanmalı və necə quraşdırılmalıdır?**

QTM və QTQ yerləşdirilən şkaflar yanmayan materiallardan hazırlanmalı, onların aşağı və yuxarı hissələrində ventilyasiya üçün deşiklər qoyulmalı, içərisindəki avadanlıqlara xidmət göstərilməsi üçün əlverişli hündürlükdə quraşdırılmalıdır.

**29. Qaz tənzimləyicilərinin istismarına hansı işlər daxildir?**

QTM (QTQ)-in istismarına aşağıdakı işlər daxildir:

- texniki xidmət;
- planlı təmir (cari və əsaslı)
- qəza-bərpa işləri

**30. QTM və QTQ-lərdə yoxlamalar necə aparılır?**

QTM və QTQ-lərin təhlükəsiz istismarını təmin etmək üçün aparılan yoxlamalar qaz təchizatı müəssisəsinin baş mühəndisi tərəfindən təsdiq olunmuş qrafik üzrə aparılmalıdır.

**31. Hansı sənəd əsasında və kimlər tərəfindən QTM (QTQ)-lərə texniki xidmət göstərilməlidir?**

QTM-nin və QTQ-nin texniki xidməti təsdiq olunmuş qrafik (cədvəl) əsasında, xüsusi ixtisaslaşmış usta və 2 nəfər çilingər-nəzarətçi tərəfindən həyata keçirilir.

**32. QTM və QTQ-lər üzərində aparılmış işlər harda qeyd olunmalıdır?**

Hər bir QTM və QTQ-nin pasportu olmalı, onun hər hansı hissənin dəyişdirilməsi və təmiri, habelə aparılan bütün işlər barədə həmin pasportda müvafiq qeydlər aparılmalıdır.

**33. Qaz tənzimləyicilərinə texniki xidmət və rejim sazlama işləri hansı müddətdən bir aparılır ?**

QTM-nin və QTQ-nin avadanlıqlarına 6 ayda 1 dəfədən az olmamaqla texniki xidmət, 12 ayda 1 dəfədən az olmamaqla cari təmir aparılmalı və ayda iki dəfədən az olmamaqla isə rejim sazlama işləri keçirilməlidir.

**34. Yaşayış məntəqələrinin qaz şəbəkələrində lazımi təzyiqin saxlanılmasına nəzarət necə həyata keçirilməlidir?**

Şəhərin və yaxud başqa yaşayış məntəqəsinin qaz şəbəkələrində lazımi təzyiqin saxlanılmasına nəzarət ildə iki dəfədən az olmamaq şərtilə şəbəkənin müxtəlif nöqtələrində təzyiqin ölçülməsi yolu ilə həyata keçirilməlidir.

**35. QTM (QTQ) avadanlıqlarının təmiri zamanı hansı işlər yerinə yetirilməlidir?**

- avadanlıqların sökülməsi, köhnəlmiş hissələrin və detalların təmiri və ya dəyişdirilməsi;
- siyirtmələrin və qoruyucu klapanların hərəkətliliyinin və bağlanmalarının kipliyinin yoxlanılması;
- bütün birləşmələrin və armaturların kipliyinin sabunlu su məhlulu ilə və ya müvafiq cihazlarla yoxlanılması;
- sürtülən hissələrin yağlanması və kipgəclərin dəyişdirilməsi və ya əlavə olunması;
- impuls borucuqlarının üfürülməsi;
- təzyiq tənzimləyicisinin klapanın yəhərinə oturmasının kipliyinin yoxlanılması;

- təzyiq tənzimləyici membranlarının kipliyinin və həssaslığının təyin edilməsi;
- qoruyucu qurğuların sazlanmasının və işlənməsinin yoxlanılması və sairə.

**36. Qaz tənzimləyicilərinə texniki xidməti zamanı hansı işlər görülməlidir?**

Qaz tənzimləyicilərinə texniki xidmət təsdiq olunmuş qrafik (cədvəl) əsasında, xüsusi ixtisaslaşmış usta və 2 nəfər çilingər-nəzarətçi tərəfindən həyata keçirilir. Texniki xidməti zamanı aşağıdakı işlər yerinə yetirilməlidir:

- texnoloji avadanlıqların istismara yararlığının yoxlanılması;
- ölçü cihazlarının göstəricilərinin götürülməsi;
- QTM (QTQ)-in və ya şkafın daxili və xarici müayinəsi;
- işıqlandırma və ventilyasiya sistemlərinin istismara yararlıqlarının yoxlanılması;
- otaqların və avadanlıqların tozdan, çirkdən və kənar əşyalardan təmizlənməsi.

Cihazların göstəriciləri və müayinələrin nəticələri QTM (QTQ) xidməti üzrə ayrılmış jurnallarda qeyd olunmalıdır.

**37. Qaz tənzimləyicisinin çıxışında təzyiq verilmiş rejimin hansı həddində dəyişə bilər?**

Qaz tənzimləyicisinin çıxışında təzyiq verilmiş rejimin 10% həddində dəyişə bilər.

**38. QTM və QTQ-in texniki xidməti ilə məşğul olan işçilərin işinə kim nəzarət etməlidir?**

QTM və QTQ-in texniki xidməti ilə məşğul olan işçilərin işinə nəzarət, həmin sahəyə məsul olan mühəndis tərəfindən həyata keçirilməli və yoxlamanın nəticələri istismar jurnalında qeyd olunmalıdır.

**39. QTM və QTQ-nin əsaslı təmirinə hansı işlər daxildir?**

QTM və QTQ-nin köhnəlmiş və yararsız hala düşmüş avadanlıqlarının və ya onun ayrı-ayrı hissələrinin, eləcə də onların yerləşdikləri binaların təmiri.

**40. QTM-nin binasında havanın temperaturu ən azı nə qədər ola bilər ?**

QTM-nin binasında havanın temperaturu $5^0$ c-dən aşağı saxlanılmasına icazə verilmir.

**41. Qaz kəmərinin korroziyaya uğraması dedikdə nə başa düşülür?**

Qaz kəmərlərinin xarici mühitin və digər kənar təsirilərin nəticəsində aşınması onun korroziyaya uğraması adlanır.

**42. Qaz kəmərlərinin korroziyaya uğrama səbəbləri hansılardır?**

Qaz kəmərlərinin çəkilişində istifadə edilən polad borular korroziyaya kimyəvi, elektrokimyəvi və elektrikin təsirlərdən uğrayır.

Kimyəvi - boruya qruntdakı qazın və mayenin təsrindən yaranır.

Elektrokimyəvi- borunun aqressiv kimyəvi birləşmələr məhlulu ilə təması (kontaktı) nəticəsində yaranır. Bu halda qaz kəməri elektrod, məhlul isə elektrolit rolunu oynayır.

Elektrik- qruntda olan azmış elektrik cərəyanının boruya təsiri nəticəsində yaranır.

**43. Qaz kəmərlərnin korroziyadan mühafizə metodları hansılardır?**

Qaz kəmərləri korroziyadan aktiv və passiv metodlarla mühafizə olunur. Passiv metod nəticəsində qaz kəməri xarici mühitin, aktiv metod nəticəsində isə azmış cərəyanın təsirindən qorunur.

**44. Qaz kəmərlərnin korroziyadan passiv müdafəsi necə aparılır?**

Qaz kəmərləri korroziyadan atmosferin təsirindən rənglənməklə, qruntun təsirindən isə izolyasiya olunmaqla qorunur. İzolyasiyanın seçilməsi zamanı qruntun aqressivliyi nəzərə alınmalıdır. İzolyasiya materialı olaraq polimer, polivinilxlorid, bitum, boya, lak-boya örtüklərdən geniş istifadə edilir. Qeyd etmək lazımdır ki, metal borular metal istehsal edən zavodlarda mexaniki üsulla da izolyasiya edilir. Bu da keyfiyyətə şərait yaratmaqla tikintinin səmərəliliyinə müsbət təsirini göstərir. Yerüstü metal borulardan inşa olunan qaz kəmərləri iki dəfədən az olmamaqla astarlanmalı və yağlı boya ilə rənglənməlidir. Qruntun aqressivliyindən asılı olaraq izolyasiya normal, güclü, daha güclü olmaqla 3 yerə bölünür.

**45. Qaz kəmərlərnin korroziyadan aktiv (elektrokimyəvi) müdafiəsi necə aparılır?**

Qaz kəmərləri azmış cərəyanın təsirindən qorunmaq üçün aktiv müdafiə olunmalıdır. Aktiv müdafiə katod, drenaj və protekter adlandırılmaqla 3 yerə bölünür.

**46. Kəmərin katod üsulu ilə korroziyadan mühafizəsi necə aparılır?** Bu üsulla mənfi potensial qoymaqla, anod sahələrinin təsirini aradan qaldırılması mümkün olur. Mənfi potensial, müsbət potensialı xüsusu torpaqlandırıcıya – anoda verilən xarici sabit cərəyan mənbəyindən qidalanır. Anod olaraq torpağa basdırılmış anod torpaqlandırıcılarından, köhnə boru və köhnə relsdən, tirdən istifadə edirlər. Anod torpaqlandırıcıdan yerə keçən cərəyan elektrolitik təsir edərək onu tədricən parçalayır. Boru divarının şəbəkəsi ilə birləşdirmə nöqtəsində potensial 0.8 V-dan çox alınmamaqla minimal potensial 0.285V olmalıdır. Katod mühafizəsinin işləməsi üçün cərəyan mənbəyi lazımdır. Katod mühafizəsi üçün Respublikada hal-hazırda əsasən KSS-600, KSS-1200, SSG-59-600, SSG-59-1200 modelli katod stansiyaları tətbiq edilir. Yeraltı qaz kəmərlərinin katod mühafizəsi onların xarici cərəyan mənbəyinin təsiri ilə katod polyarlaşdırılmasının təmin olunmasıdır.

Katod stansiyası ilə mühafizə qurğusu sabit cərəyan mənbəyindən, anod torpaqlandırıcıdan, metal şkafda yerləşdirilən elektrik nəzarət cihazlarından, diodlardan, elektrik açarından və elektrik naqillərdən ibarətdir.




Katod mühafizəsinin sxemi

1 – qrafit anod torpaqlandırıcı;
2 – birləşdirici kabel;
3 – sabit cərəyan mənbəyi;
4 – drenaj kabeli;
5 – drenaj nöqtəsi;
6 – qaz kəməri.

Cərəyan mənbəyinin mənfi qütbü mühafizə olunan qaz kəmərinə, müsbət qütbü isə anod torpaqlandırıcıya birləşdirilir. Yaradılan qapalı elektrik dövrəsindən cərəyan, mənbəyin müsbət qütbündən torpaqlanmış anoda və torpaq vasitəsilə qaz kəmərinə, qaz kəmərindən mənbəyə (katod stansiyasına) dövr edir, qaz kəməri mühafizə olunur, torpaqlanmış anod elektrokimyəvi dağılmaya məruz qalır.

**47. Kəmərin korroziyadan Protektor mühafizəsi necə aparılır?**

Protektor mühafizəsinin quruluşu çox sadədir. Bu quruluş əlvan metalların xüsusi xəritəsindən tökülən kündədən ibarətdir. Xüsusi duzlar qatışığında yerləşdirilən protektoru qaz kəmərindən 3-6 metr məsafədə, 2 metrə qədər dərinlikdə yerə basdırılır.

Qaz kəmərini və protektoru yaxşı izolə edilmiş məftil vasitəsilə qısa qapayırlar. Qalvanik qütbə anodun rolunu protektor oynayır. Bu məftilin izolyasiyası uzun müddət torpaqda qalmadan xarab olmamalıdır. Müdafiə edilməli olan məntəqədə protektorları qaz kəməri boyunca 35 və 70 metr addımla qoyurlar.

Qaz kəməri və qurğularını korroziyaya qarşı izolə edilməsinin layihələndirilməsinin həmin işlərin aparılması üzrə «CH-266-63. Yeraltı metal qurğularının korroziyadan qorunması Qaydaları» («CH-266-63. Правила защиты подземных металических сооружений от коррозии») uyğun aparılmalı, kəmərlərin və qurğuların istismara qəbulunda bu təlimata ciddi əməl edilməlidir.




Protektor mühafizəsinin sxemi

1 – nəzarət məntəqəsi;

2 – birləşdirici kabel;

3 – protektor;
4 – doldurucu (duzlar+gil+su);
5 – mühafizə cərəyanının torpaqda hərəkəti istiqaməti;
6 – qaz kəməri.

**48. Kəmərin korroziyadan elektrik drenaj qurğusu vasitəsi ilə mühafizəsi necə aparılır?**

Elektrikləşdirilmiş tramvay və dəmir yol xətlərini kəsən və onların yaxınlığından keçən qaz kəmərlərində azmış cərəyanlar nəticəsində kəmərdə anod sahəsi yaranır ki, bu da boru metalının korroziyası-dağılması ilə nəticələnə bilər.

Azmış cərəyanların təsirindən yaranan korroziya, qaz kəməri səthinin tramvay, elektrikləşdirilmiş dəmir yolu, metropoliten xətlərində reslərdə itən sabit cərəyanın bilavasitə təsiri ilə elektrokimyəvi dağılmaya məruz qalmasıdır. Relslərlə axıb qaz kəməri sahəsinə yaxın dartı yarımstansiyasının mənfi giriş yerinə qayıdan sabit cərəyan relslərin torpaqla yaxşı izolyasiya olunmaması səbəbindən, yaxud relslərin bir-biri ilə əlaqəsinin pozulmasından azmış halda torpağa keçərək zədələnmiş izolyasiya örtüyü yerindən elektrik müqaviməti ətraf torpağın müqavimətindən aşağı olan qaz kəmərinə, kəmərdən torpağa, torpağdan relsə dövrü olaraq axır. Azmış cərəyanların qaz kəmərinə giriş zonasında qaz kəməri katod (mənfi elektrod) kimi, çıxış zonasında isə anod (müsbət elektrod) kimi polyarlaşır. Metal boruları belə vəziyyətdən qorumaq məqsədilə elektrik drenaj qurğularından istifadə edilməlidir.




Drenaj mühafizəsinin sxemi

1 – qaz kəməri;
2 – drenaj kabeli;
3 – drenaj qurğusu;
4 – reostat;
5 – düzləndirici element;
6 – ampermetr;
7 – qoruyucu;
8 – dartıcı yarımstansiyanın generatoru;
9 – qidalandırıcı fider;
10 – kontakt troyler məftili;
11 – azmış cərəyanların axın istiqamətləri.

**49. Elektrokimyəvi mühafizə qurğularının istismarında təhlükəsizlik tədbirləri və onlara xidmət işlərinin təşkili necə aparılır?**

Metal qurğularının korroziyadan mühafizə olunması işlərinə, buna uyğun təhlükəsizlik texnikası qaydalarından təlim keçmiş şəxslər buraxıla bilərlər. Hər bir işçi işə başlayarkən iş yerinə və görülən işə müvafiq təlimatlandırılmalıdır. İş icra olunan yerdə işin xüsusiyyətlərinə uyğun xəbərdaredici nişanlarının qoyulması məcburidir.

Yeraltı qurğularda elektrik ölçmə əməliyyatı ilə əlaqəli və elektrik mühafizə avadanlıqlarında təmir-quraşdırma işləri icra olunarkən mütləq «1000 V-a qədər gərginlikli şəhər elektrik avadanlıqlarının istismarında təhlükəsizlik texnikası Qaydaları»nın tələblərinə ciddi əməl olunmalıdır.

İstismar dövründə elektrokimyavi mühafizə qurğularının işinə nəzarət dövrü olaraq onlara texniki baxış keçirmək və onların normal işləməsinin, nəzarət-ölçü məntəqələrində mühafizə olunan qurğularda potensiallar fərqinin yoxlanılmasından ibarətdir.

Elektrik mühafizə qurğularına texniki baxış və xidmət, onların əlaqə qurğularında potensiallar fərqinin ölçülməsi işləri aşağıdakı müəyyən olunmuş müddət üzrə icra olunur:

- Katod mühafizə qurğularında - 1 ayda 2 dəfə;
- Drenaj mühafizə qurğularında - 1 ayda 4 dəfə;
- Nəzarət olunan protektor qurğularında - 1 ayda 1 dəfə.

**50. Elektrokimyəvi mühafizə qurğularının cari təmiri hansı müddətdə aparılır və hansı təmir işləri yerinə yetirilir ?**

İldə bir dəfədən az olmayaraq aparılır və aşağıdakı işlər yerinə yetirilir:

- texniki xidmətlərin bütün əməliyyatları;
- şkafların və başqa qurğuların konstruktiv elementlərinin rənglənməsi;
- cərəyan ötürücü xətlərin təmiri;
- torpaqlama mühafizəsindəki nasazlıqların ləğvi;
- elektrik avadanlıqlarındakı nasazlıqların ləğvi.

**51. Dayaqlar üzərində çəkilmiş qaz kəmərlərində siyirtmələrin flyanslarından dayağa qədər ən azı nə qədər məsafə olmalıdır ?**

Dayaqlar üzərində çəkilmiş qaz kəmərlərində siyirtmələrin flyanslarından dayağa qədər ən azı 400 mm məsafə olmalıdır.

**52. Qaz kəmərləri binaların örtüyü üzərindən çəkildikdə binanın örtüyü ilə qaz kəmərinin alt hissəsi arasındakı məsafə ən azı nə qədər olmalıdır ?**

Qaz kəmərləri binaların örtüyü üzərindən çəkildikdə binanın örtüyü ilə qaz kəmərinin alt hissəsi arasındakı məsafə ən azı 0,5 m olmalıdır.

**53. Xarici qaz kəmərlərində açma armaturları harada yerləşdirilməlidir ?**

Qaz paylaşdırıcı sistemləri istehlakçıların qaz ilə fasiləsiz təmin edilməsini, qaz kəmərlərinin təhlükəsiz istiamarını və ayrı-ayrı qaz təchizatı rayonlarının qaz kəmərindən açılmasını təmin etməlidir. Açma armaturlarının quraşdırılma yeri layihə zamanı təyin edilir. Açılma armaturları elə yerləşdirilməlidir ki, qəza şəraitində ayrı-ayrı sahələrin tezliklə açılması mümkün olsun.

**54. Qaz kəmərləri üzərində armaturlar 2,2 metrdən yüksəkdə quraşdırıldıqda onlara xidmət üçün hansı vasitələrdən istifadə etmək lazımdır?**

Qaz kəmərləri üzərində armaturlar 2,2 metrdən yüksəkdə quraşdırdıqda onlara xidmət üçün yanmayan materialdan pillləkənli meydança yaxud da məsafədən idarəetmə inteqralı quraşdırılmalıdır. Az istifadə olunan armaturlar üçün xidmət zamanı səyyar nərdivanlardan istifadə oluna bilər.

**55. Yeraltı və yerüstü qaz kəmərlərinin hava ilə üfürülərək nəzarət üçün yoxlanılması hansı müddətdə, hansı təzyiq altında aparılır və təzyiq düşməsi nə qədər olur ?**

Yeraltı və yerüstü qaz kəmərlərinin hava ilə üfürülərək nəzarət üçün yoxlanılması 1saat müddətinə, 0,2 atm, təzyiq altında aparılır və təzyiq düşgüsü 10 mm su süt. qədər ola bilər.

**56. Qaz kəmərləri üzərində kondensat yığıcıları nə məqsədlə və necə quraşdırılır?**

Kondensat yığıcıları qazın tərkibində olan mayenin yığılaraq xaric edilməsi məqsədilə layihəyə uyğun olaraq qaz kəmərinin aşağı nöqtələrində ona qaynaq edilməklə quraşdırılır. Kondensat yığıcılardan kondensatı boşaldan borular yerin səthinə örtük altına dayaz quyunun qapağı altına çıxarılmalıdır. Kondensat yığıcılar onların donmamasını təmin edən dərinlikdə quraşdırılmalıdır.

**57. Kondensat yığıcının boşaltma borusi ilə onun üzərinə qoyulmuş örtük arasında məsafə nə qədər olmalıdır?**

Kondensat yığıcının boşaltma borusunun tıxacı ilə onun üzərinə qoyulmuş örtüyün qapağı arasındakı məsafə 10 sm-dən az olmamalıdır.

**58. Xarici qaz kəmərlərinə dövri olaraq texniki baxış hansı müddətdən bir keçirilməlidir?**

Xarici qaz kəmərlərinə təsdiq olunmuş qrafik əsasında dövri olaraq texniki baxış keçirilməlidir. Yerüstü qaz kəmərlərinə gəzmə üsulu ilə texniki baxış 3 ayda bir dəfədən az olmamaqla aparılmalıdır. Yeraltı qaz kəmərləri xəttinin yoxlama-nəzarət dövriliyi isə onların texniki vəziyyətindən, kimyəvi-elektrokimyəvi mühafizə qurğularının mövcudluğundan və səmərələliyindən, təzyqindən, və s. amillərdən asılı olur.

**59. Sənaye, kənd təsərrüfatı və kommunal müəssisələrinin yeraltı qaz kəmərləri hansı müddətdən bir yoxlanılır ?**

Sənaye, kənd təsərrüfatı və kommunal müəssisələrin yeraltı qaz kəmərləri 2 gündə bir dəfədən az olmayaraq yoxlanılmalıdır.

**60. Yeraltı qaz kəmərləri xəttinin yoxlanılması işlərini həyata keçirən briqadanın tərkibi neçə nəfərdən ibarət olmalıdır?**

Yeraltı qaz kəmərləri xəttinin yoxlanılması tərkibində 2 nəfərdən az olmayan briqada tərəfindən aparılmalıdır.Yaşayış məntəqələrindən kənarda və digər yeraltı kommunikasiyalar olmayan yerlərdə bu işi bir fəhlə ilə aparmağa yol verilir.

**61. Yeraltı qaz kəmərləri xəttinin yoxlanılması üçün marşrut xəritələrinin tərtibi nə üçün lazımdır?**

Yeraltı qaz xətlərini yoxlayanlara marşrut xəritələri verilməlidir. Bu xəritələrdə havası yoxlanılacaq qaz və digər qurğuların, quyuların, bina zirzəmilərinin yerləri qeyd edilməklə (hər iki tərəfə 15 m məsafədə) qaz kəmərləri xətlərinin sxemləri göstərilməlidir. Bu xəritələr hər il dəqiqləşdirilməli, kəmərdə və onun keçdiyi ərazidə baş vermiş dəyişikliklər qeyd edilməlidir.

**62. Qazın təzyiqi hansı hallarda növbədənkənar yoxlanılmalıdır ?**

- yeni qazpaylayıcı kəmərlər və qazpaylayıcı məntəqələr (QPM) istismara buraxıldıqda;
- istehlakçı limitdən 10%-dən artıq və ya az qaz götürdükdə;
- iqlimdə nəzərdə tutulmayan temperatur dəyişiklikləri baş verdikdə;
- yeni istehlakçılar qaz kəmərinə qoşulduqda.

**63. Qaz kəmərlərinin cari təmirinə hansı əsas işlər daxildir?**

- aşkar olunmuş qüsurların ləğv edilməsi;
- qaz kəmərlərinin dayaqlarının bərpa edilməsi və ya onların dəyişdirilməsi;
- yerüstü qaz kəmərlərinin rənglənməsi;
- quyuların (lyuklarının), qapaqlarının vəziyyətinin yoxlanılması və mövcud olan qüsurların ləğv edilməsi;
- quyuların örtüklərinin ( lyuklarının )rənglənməsi;
- bağlayıcı qurğuların sökülüb yığılması, yararsız hala düşmüş hissələrin dəyişdirilməsi və kipliyinin yoxlanılması;
- siyirtmələrin, kranların və kompensatorların rənglənməsi;
- qaz kəmərlərinin yeraltı girişlərinin yoxlanması və onların lazımi vəziyyətə gətirilməsi.

**64. Bağlayıcı armatur və kompensatorların təmirinə hansı işlər daxildir ?**

- çirklənmədən və paslanmadan təmizlənməsi;
- lazım gəldikdə rənglənməsi;
- siyirtmədə vintin açılması və yağlanması;
- kipkəcin yoxlanması və doldurulması;
- siyirtmələrin sazlığının yoxlanması və ötürücü qurğularının təmiri;

- kompensatorların vəziyyətinin yoxlanması;
- bütün qaynaq, flans və yivli birləşmələrin kipliyinin sabunlu su məhlulu ilə yoxlanması;
- köhnəlmiş və zədələnmiş boltların və aralıq qatların dəyişdirilməsi.

**65. Yeraltı və yerüstü qaz kəmərlərinin əsaslı təmirinə hansı əsas işlər daxildir?**

- ayrı-ayrı qaynaq calaqlarının müvafiq üsullarla möhkəmləndirilməsi;
- mühafizə örtüklərinin zədələnmiş və ya keyfiyyətsiz yerlərinin təmiri;
- yararsız vəziyyətə düşmüş boru sahələrinin dəyişdirilməsi;
- qaz kəmərlərinin ayrı-ayrı sahələrində izolyasiya örtüklərinin dəyişdirilməsi;
- qaz quyularının üst örtüklərinin sökülüb dəyişdirilməsi;
- istismara yararsız hala düşmüş kran və siyirtmələrin dəyişdirilməsi və sairə.
- Qaz kəmərlərində tikilmiş quyularda qazın olmasının müəyyənləşdirilməsi və nəzarət borucuqlarının yoxlanılması;
- Quyularda və örtüklərdə armaturların zahiri baxışı;
- Qaz kəmərlərinin oxundan hər iki tərəfə 15m-ə qədər məsafədə yerləşmiş digər qurğularda qazın olmasının yoxlanılması, digər yeraltı kommunikasiyaların quyuları, kollektorlar, binaların zirzəmiləri və sair
- Zahiri əlamətlər üzrə qaz sızmasının aşkar edilməsi;
- Quyuların (lyukların) örtüklərinin, divar göstəricilərinin yaxşı vəziyyətdə saxlanılmasına və onları qardan, buzdan, çirklənmədən təmizlənməsinə nəzarət edilməsi.

**66. Yeraltı qaz kəmərlərinə gəzmə üsulu ilə texniki baxış keçirdikdə kəmərdən hər iki tərəfə neçə metr məsafədəki digər xidmətlərə məxsus quyular, zirzəmilər yoxlanılmalı və qaz sızması aşkar edildiyi təqdirdə bu məsafə hansı radiusa qədər artırılır ?**

Yeraltı qaz kəmərlərinə gəzmə üsulu ilə texniki baxış keçirdikdə kəmərdən hər iki tərəfə 15 metr məsafədəki digər xidmətlərə məxsus quyular, zirzəmilər yoxlanılmalı və qaz sızması aşkar edildiyi təqdirdə bu məsafə 50 metr radiusa qədər artırılır.

**67. İstismarda olan yeraltı qaz kəmərlərinin cihazlarla texniki müayinəsi hansı müddətdən bir aparılmalıdır?**

İstismarda olan yeraltı qaz kəmərlərinin cihazlarla texniki müayinəsi 5 ildə bir dəfədən az olmamaqla aparılmalıdır. Əsaslı təmirə və yenidənqurmaya ehtiyacı olan qaz kəmərlərinin cihazla texniki müayinəsi ildə bir dəfədən az olmamaqla aparılmalıdır.

**68. İstismarda olan yeraltı qaz kəmərinin kipliyi (şurf açma yolu ilə baxış) neçə ildən bir yoxlanılır ?**

İstismarda olan yeraltı qaz kəmərinin kipliyi 5 ildə bir dəfə şurf açma yolu ilə yoxlanılır.

**69. Qaz təchizatı müəssisələrinin balansında olan və balansında olmayan qaz kəmərlərinin və qurğularının tam xarakteristikası hansı sənədlərdə öz əksini tapmalıdır?**

Tam xarakteristikalarını (diametrlər, izolyasiya örtüyünün tipi, mühafizə vasitələri, texniki vəziyyəti və s.) əks etdirən kompleks istismar sənədləri olmalıdır (texniki pasportlar və s.).

**70. Qaz kəmərləri xəttində nəzarət-ölçü məntəqələri arasındakı məsafə nə qədər olmalıdır?**

Şəhərlərdən, qəsəbələrdən və kənd yaşayış məntəqələrindən keçən qaz kəmərləri  xəttində nəzarət-ölçü məntəqələri arasında 200 metrdən artıq, yaşayış məntəqələrindən kənarda isə bu məsafə 500 metrdən artıq olmamalıdır. Nəzarət-ölçü məntəqələri qaz kəmərlərinin elektrik enerjisi işləyən dəmir yolu xətləri ilə və eni 50metrdən artıq olan su sədləri ilə kəsişdikləri yerlərdə də qoyulmalıdır.

**71. Qaz kəmərinin istismarı zamanı hansı işlər yerinə yetirilməlidir?**

Qaz kəmərinin istismarı zamanı aşağıdakı işlər yerinə yetirilməlidir:

- texniki xidmət;
- planlı təmir (cari və əsaslı);
- qəza-bərpaetmə.

**72. Texniki xidmətə hansı işlər daxildir?**

- yeraltı, yerüstü və yer səthindən yuxarıda çəkilmiş qaz kəmərlərinin və onların qurğularının, eləcə də elektrik mühafizə qurğularının vəziyyətinə nəzarət və istismar prosesində aşkar olunmuş nasazlıqların ləğv edilməsi;

- quyularda və yerüstü qaz kəmərlərində quraşdırılmış avadanlıqların müayinəsi;
- qaz kəmərlərinin və onların izolyasiya örtüklərinin vəziyyətinin cihazlarla, qazıma və şurflama üsulu ilə müayinə edilməsi və kəmərlərin təzyiq altında yoxlanılması;
- qaz kəmərlərində təzyiqin ölçülməsi;
- qaz kəmərlərində elektrik potensialının ölçülməsi.

**73. Yeraltı qaz kəmərlərinin xəttinin yoxlama nəzarət dövrüliyi necə müəyyən edilir?**

Yeraltı qaz kəmərlərinin xəttinin gəzmə üsulu ilə yoxlamanın vaxtı və işin həcmi Qaz təchizatı müəssisəsinin baş mühəndisinin təsdiq etdiyi təqvim qrafikinə (cədvəlinə) əsasən müəyyən edilir. Şəhər və qəsəbələrdə qaz kəməri trassalarının (zolaqlarının) gəzmə üsulu ilə nəzarətinin müddəti müəyyən edilərkən onların istismar şəraitləri (qaz kəmərinin texniki vəziyyəti, qazın təzyiqi, istismar etmə müddəti, qruntların qabarma xüsusiyyətləri və korroziya aktivliyi, ilin fəsli, elektrik mühafizəsinin mövcudluğu və s.) nəzərə alınmalıdır.

**74. Yerüstü qaz kəmərlərinin gəzmə üsulu yoxlama müddəti və görülən işlər haqqında nə deyə bilərsiniz?**

Yerüstü qaz kəmərləri gəzmə üsulu ilə yoxlanılması 3 ayda bir dəfədən az olmamaqla aparılmalıdır. Qaz kəmərlərinin xarici müayinəsi zamanı boruların rənglənməsi; armaturların bütövlüyü, qaz kəmərinin binaların divarlarına və ya dayaqlara bərkidilməsinin (dayaqlardan düşməsinin) vəziyyəti, kənar təşkilatlar və kənar şəxslər tərəfindən özbaşına qaz kəmərlərinə qoşulmalar, elektrik xətlərinin qaz kəmərləri ilə kəsişdiyi yerlərdə onların üstünə düşməsindən mühafizə vasitələrinin mövcudluğu və vəziyyəti yoxlanılmalıdır.

**75. Qaz kəmərlərinin yaxınlığında hər hansı təşkilat tərəfindən torpaq işləri görülərkən qaz təchizatı müəssisəsi nə etməlidir?**

İstismarda olan qaz kəməri xətlərinin uzunluğu boyu, hər hansı təşkilat tərəfindən torpaq işləri aparılarkən Qaz təchizatı müəssisəsi, torpaq işləri yerinə yetirilən müddət ərzində öz nümayəndəsinin iş aparılan sahədə olmasını təmin etməlidir.

**76. Polietilen borularda yaranmış zədələrin ləğvi zamanı hansı tələblərə riyət olunmalıdır?**

Polietilen borularda yaranmış xırda çatlar (uzunluğu 35 mm-dən kiçik) aşkar edildikdə, polietilen qaz kəmərlərinin təmiri qüsurlu sahədə qaynaq işləri aparmaqla ləğv edilə bilər. Polietilen boruların qaynaq calaqları qırıldıqda, eləcə də boru kəmərlərində iri zədələr (diametri 35 mm-dən böyük deliklər, uzunluğu 35 mm-dən böyük çatlar) olduqda, qüsurlu sahələr kəsilərək uzunluğu 500 mm-dən az olmayan qısa boru kəsiyi qaynaq edilməklə ləğv edilməlidir.

**77. Qaz kəmərlərinin mühafizə zonaları hansı normativ sənədlə tənzimlənir ?**

Qaz kəmərlərinin mühafizə zonaları Azərbaycan Respublikası Nazirlər Kabinetinin 21.06.1999-cu il tarixli 103 saylı qərarı ilə təsdiq edilmiş "Qaz təchizatında mühafizə zonaları və təhlükəsizlik tədbirləri Qaydaları"na əsasən tənzimlənir.

**78. Yeni inşa edilmiş yeraltı aşağı təzyiqli qaz kəmərlərinin kipliyə sınağı hansı müddətdə və təzyiqdə həyata keçirilir ?**

Yeni inşa edilmiş yeraltı aşağı təzyiqli qaz kəmərlərinin kipliyə sınağı 24 saat müddətində və 1 atm təzyiq altında aparılır.

**79. Yeni inşa edilmiş yerüstü aşağı təzyiqli qaz kəmərlərinin kipliyə sınağı hansı müddətdə və təzyiqdə həyata keçirilir ?**

Yeni inşa edilmiş yerüstü aşağı təzyiqli qaz kəmərlərinin kipliyə sınağı 0,5 saat müddətdə və 1 atm təzyiq altında aparılır.

**80. Yeni inşa edilmiş yeraltı aşağı təzyiqli qaz kəmərlərinin möhkəmliyə sınağı hansı müddətdə və təzyiqdə həyata keçirilir?**

Yeni inşa edilmiş yeraltı aşağı təzyiqli qaz kəmərlərinin möhkəmliyə sınağı 3 saat müddətdə və 6 atm təzyiq altında aparılır.

**81. Yeni inşa edilmiş yerüstü aşağı təzyiqli qaz kəmərlərinin möhkəmliyə sınağı hansı müddətdə və təzyiqdə həyata keçirilir?**

Yeni inşa edilmiş yerüstü aşağı təzyiqli qaz kəmərlərinin möhkəmliyə sınağı 1saat müddətdə və 3 atm təzyiq altında aparılır.

**82. Yeni inşa edilmiş yeraltı orta təzyiqli qaz kəmərlərinin möhkəmliyə sınağı hansı müddətdə və təzyiqdə həyata keçirilir?**

Yeni inşa edilmiş yeraltı orta təzyiqli qaz kəmərlərinin möhkəmliyə sınağı 3 saat müddətdə və 6 atm təzyiq altında aparılır**.**

**83. Yeni inşa edilmiş yerüstü orta təzyiqli qaz kəmərlərinin möhkəmliyə sınağı hansı müddətdə və təzyiqdə həyata keçirilir?**

Yeni inşa edilmiş yerüstü orta təzyiqli qaz kəmərlərinin möhkəmliyə sınağı 1 saat müddətdə və 4,5 atm təzyiq altında aparılır.

**84. Futluyara salınmış yeraltı qaz kəmərlərində qaynaq tikişi futluyarın qurtaracağından ən azı hansı məsafədə ola bilər?**

Futluyara salınmış yeraltı qaz kəmərlərinin qaynaq tikişindən futluyarın qurtaracağına qədər məsafə 100mm-dən az olmamalıdır.

**85. Küçə xətlərindən ayrılıqda inşa edilmiş şərti diametri 100 mm-ə qədər olan yeraltı aşağı təzyiqli məhəllədaxili qaz kəmərləri və onlara birləşdirilən qolların kipliyə sınağı hansı müddətdə və təzyiqdə həyata keçirilir ?**

Küçə xətlərindən ayrılıqda inşa edilmiş şərti diametri 100 mm-ə qədər olan yeraltı aşağı təzyiqli məhəllədaxili qaz kəmərləri və onlara birləşdirilən qolların kipliyə sınağı 3 saat müddətdə və 1 atm təzyiq altında aparılır.

**86. Küçə xətlərindən ayrılıqda inşa edilmiş şərti diametri 100 mm-ə qədər olan yerüstü aşağı təzyiqli məhəllədaxili qaz kəmərləri və onlara birləşdirilən qolların kipliyə sınağı hansı müddətdə və təzyiqdə həyata keçirilir ?**

Küçə xətlərindən ayrılıqda inşa edilmiş şərti diametri 100 mm-ə qədər olan yerüstü aşağı təzyiqli məhəllədaxili qaz kəmərləri və onlara birləşdirilən qolların kipliyə sınağı 0,5 saat müddətdə və 0,1 atm təzyiq altında aparılır

**87. Küçə xətlərindən ayrılıqda inşa edilmiş şərti diametri 100 mm-ə qədər olan yeraltı aşağı təzyiqli məhəllədaxili qaz kəmərləri və onlara birləşdirilən qolların möhkəmliyə sınağı hansı müddətdə və təzyiqdə həyata keçirilir ?**

Küçə xətlərindən ayrılıqda inşa edilmiş şərti diametri 100 mm -ə qədər olan yeraltı aşağı təzyiqli məhəllədaxili qaz kəmərləri və onlara birləşdirilən qolların möhkəmliyə sınağı 1 saat müddətdə və 3 atm təzyiq altında aparılır

**88. Küçə xətlərindən ayrılıqda inşa edilmiş şərti diametri 100 mm-ə qədər olan yerüstü aşağı təzyiqli məhəllədaxili qaz kəmərləri və onlara birləşdirilən qolların möhkəmliyə sınağı hansı müddətdə və təzyiqdə həyata keçirilir ?**

Küçə xətlərindən ayrılıqda inşa edilmiş şərti diametri 100 mm-ə qədər olan yerüstü aşağı təzyiqli məhəllədaxili qaz kəmərləri və onlara birləşdirilən

qolların möhkəmliyə sınağı 1 saat müddətdə və 1 atm təzyiq altında aparılır.

**89. Qaz kəmərlərinin qaynaq birləşmələrinin fiziki üsulla yoxlanılması nə deməkdir?**

Qaynaq birləşmələrinin fiziki üsulla yoxlanılması onların qamma, rentgen, maqnitoqrafiya şualanmadan keçirilməklə yoxlanılması əməliyyatları aparılmalıdır. Qaz kəmərlərinin işçi təzyiqlərindən asılı olaraq onların bütün qaynaq birləşmələrinin ümumi sayından faizlə fiziki üsulla yoxlanmaya verilməsi aşağıdakı qaydada müəyyən edilməlidir:

- İşçi təzyiqi 0,005 MPa qədər – 5%;
- İşçi təzyiqi 0,005 MPa-dan 0,3 MPa qədər – 10%;
- İşçi təzyiqi 0,3 MPa-dan 0,6 MPa qədər – 50%;
- İşçi təzyiqi 0,6 MPa-dan 1,2 MPa qədər – 100% qaynaq birləşməlrinin ümumi say miqdarında.

Diametri 50 mm-dən aşağı olan daxili və xarici yeraltı və yerüstü qaz kəmərlərinin qaynaq birləşmələri fiziki və mexaniki üsulla yoxlanılması tələb olunur. Üzərində hər hansı istiqamətdə və ölçüdə çat olduqda, tikiş boyunca natamam qaynaq gedişi olduqda qaynaq birləşməsi zay sayılır. Elektrik qovsü ilə qaynaq tikişlərində hətta ən az qaz buraxılışı olduqda belə onu qazla qaynaq üsulu ilə və yaxud çəkiclə döyməklə bərpa etmək yol verilməzdir.

**90. Tikintisi başa çatmış şəhər qaz kəmərlərinin və avadanlıqlarının istismara qəbulu necə aparılır?**

Tikinti işləri tam başa çatdıqdan sonra sifarişçinin təşəbbüsü və onun nümayəndəsinin sədrliyi ilə podrat təşkilatın, layihə təşkilatının, aidiyyəti üzrə Azərbaycan Respublikası Fövqəladə Hallar Nazirliyinin müvafiq struktur bölməsinin, Dövlət Qaz Nəzarəti İdarəsinin, digər dövlət orqanlarının nümayəndələrinin daxil olduğu işçi qəbul komissyası yaradılır. Podrat təşkilat razılaşdırılmış, təsdiq olunmuş və qeydiyyatdan keçmiş layihə sənədlərini, obyektin texniki-icra sənədlərini (üstü örtülmüş işlərin qəbulu aktları, qaynaq işlərinin jurnalı, möhkəmliyə və kipliyə sınaq aktları, sınaq və üfürülmə təlimatları, istifadə olunmuş materialların sertifikatları, quraşdırılmış avadanlıqların pasportları, qaynaqçıların sertifikatları, yaxud vəsiqə və diplomları, qaynaq birləşmələrinin

yoxlanılması üzrə laboratoriyanın protokolları və digər texniki sənədlər) işçi komissiyasına təqdim edilməlidir.

**91. Tikinti-quraşdırma işləri başa çatdıqdan sonra qaz kəmərlərinin və onun qurğularının üfürülməsi və sınağının qaz vasitəsilə aparılması zamanı hansı tələblərə riayət edilməlidir?**

Tikinti-quraşdırma işləri başa çatdıqdan sonra qaz kəmərlərinin və onun qurğularının üfürülməsi və sınağı qaz vasitəsilə aparıldığı halda, tikinti təşkilatı, göstərilən işləri təhlükəsiz yerinə yetirmək üçün sifarişçi ilə razılaşdırılmış təlimatı Azərbaycan Respublikası FHN-nin Sənayedə İşlərin Təhlükəsiz Görülməsi və Dağ-mədən Nəzarəti Dövlət Agentliyinə və Dövlət Qaz Nəzarəti İdarəsinə təqdim edərək onlardan rəsmi icazə almalıdır.

**92. Yeni tikilmiş qaz kəmərlərinin istismarda olan qaz kəmərlərinə qoşulması üzrə işlərin aparılmasına hazırlaşarkən hansı tədbirlər həyata keçirilməlidir?**

- istismarda olan və yeni tikilmiş qaz kəmərlərinin texniki sənədləri, pasportları və icra cizgilərinin mövcudluğunun yoxlanılması;
- yeni tikilmiş qaz kəmərlərinin və quraşdırılmış qaz avadanlıqlarının pasportu, sertifikatı və sair, eləcə də qaz kəmərlərinin korroziyadan elektrik mühafizə qurğularının vəziyyətinin yoxlanılması;
- qaz təsərrüfatında texniki təhlükəsizlik qaydalarının tələblərinə əsasən işin təhlükəsiz görülməsi üzrə müvafiq iş planının hazırlanması;
- qoşulma düyünlərinin eskizinin (sxeminin) tərtib edilməsi;
- işin təhlükəsiz aparılması üçün lazımi avadanlıqların, materialların, alətlərin və mühafizə, xilasetmə, yanğından mühafizə vasitələrinin (əleyhqaz, tibbi apteçka, mühafizə kəməri və sair) tələb olunan sayda və saz vəziyyətdə hazırlanması;

Texniki sənədlərin hazırlanması, qoşulma düyünlərinin eskizlərinin (sxeminin) tərtib edilməsi, qaz kəmərinin qoşulması üzrə qaz təhlükəli işlərin yerinə yetirilməsinə tapşırıq verən şəxsin göstərişi nəzərə alınmaqla, Qaz təchizatı müəssisəsinin  mütəxəssisləri tərəfindən yerinə yetirilir.

**93. Yeni tikilmiş qaz kəmərlərinin istismarda olan qaz kəmərlərinə qoşulması zamanı hansı işlər görülməlidir?**

- Qoşulma işlərinin aparılmasından əvvəl elektro-kimyəvi mühafizə vasitələri açılmalıdır (ayrılmalıdır).
- Qoşulmadan və qazın verilməsindən əvvəl yeni tikilmiş qaz kəmərləri "Qaz təsərrüfatında texniki təhlükəsizlik qaydaları"nın tələblərinə uyğun olaraq yoxlama sınağından keçirilməlidir.
- Girişlərdə bütün bağlayıcı qurğular bağlanılmalı və metal tıxaclarla qapanmalıdırlar.
- İşlərin icrası tərtib edilmiş iş planı və təlimat əsasında yerinə yetirilməlidir.

**94. Qaz kəmərindən qaz-hava qarışığının üfürülməsi necə həyata keçirilir?**

Qaz kəmərinə qaz verilərkən qaz-hava qarışığının üfürülməsi atqı şamı vasitə ilə həyata keçirilməlidir. Atqı şamında quraşdırılmış kranlar, ardıcıllıqla açılmalı və işlər onu yerinə yetirə bilən işçilər tərəfindən təlimat aldıqdan sonra icra edilməlidir. Qazı atqı şamından havaya buraxan müddət ərzində yaxınlıqda 10 m radiusunda açıq oddan istifadə etmək, siqaret çəkmək və digər qaz-hava qarışığının yanmasına səbəb ola bilən hərəkətlərə yol verilməməlidir. Eyni zamanda ildırım çaxan zaman qazı atqı şamı vasitəsilə havaya buraxmaq qəti qadağandır.

**95. Qaz kəmərləri nəzarət üçün hava ilə hansı təzyiq altında üfürülməlidir?**

Yeraltı və yerüstü qaz kəmərləri hesablanmış təzyiqdən asılı olmayaraq 2000 mm su sütünü (0,02 MPa) təzyiq altında hava ilə üfürülərək nəzarət üçün yoxlanılmalıdır. Təzyiqin aşağı düşməsi 1 saatda 110 mm su sütünündan (10 daPa) artıq olmamalıdır.

**96. Qaz kəmərləri hava ilə üfürülərkən hansı tələblərə riayət olunmalıdır?**

Qaz kəmərindən qazı çıxararkən, onlar hava ilə, yaxud təsirsiz qazla, qaz tamamilə basılıb çıxarılanadək üfürülməlidir. Üfürmənin qurtarması borudan götürülən havanın, yaxud təsirsz qazın analizi ilə təyin edilir. Götürülən nümunədə qazdakı oksigenin miqdarı 1 faizdən artıq olmamalıdır, qaz isə arası kəsilmədən sakit yanmalıdır. Qaz kəmərlərini

üfürən zaman qaz-hava qarışığı elə yerlərə buraxılmalıdır ki, binalara, həmçinin hər hansı od mənbəyindən alışa biləcək yerlərə keçməsin.

**97. İstismara qəbul edilmiş qaz kəməri 6 (altı) aydan artıq müddətdə istifadəyə verilmədikdə hansı işlər görülür ?**

İstismara qəbul edilmiş qaz kəməri 6 (altı) aydan artıq müddətdə istifadəyə verilmədikdə kipliyə sınaqdan keçirilib müvafiq qaydada aktlaşdırıldıqdan sonra istifadəyə verilməlidir.

**98. Qaz kəmərlərinin üfürülməsindən sonra hansı işlər yerinə yetirilməlidir?**

- Qaz kəmərlərinin və cihazlarının girişində monometr vasitəsilə qazın təzyiqinin yoxlanılması;
- qaz cihazlarının qarşısındakı kranlara açarların geydirilməsi (taxılması):
- qaz cihazlarının odluqlarının ardıcıllıqla yandırılması və qazın yanmasının tənzimlənməsi;
- qaz kəmərlərinin və cihazlarının birləşmə yerlərində kipliyin (qazın sızmasına qarşı) cihazla və ya sabunlu su məhlulu ilə yoxlanılması;
- qazdan və qaz cihazlarından təhlükəsiz istifadə edilməsi qaydaları ilə abonentlərin təlimatlandırılması və bu məqsədlər üçün təyin olunmuş xüsusi nömrələnmiş jurnallarda onların imzalarının alınması.

**99. Yeni qaz kəmərləri istismarda olan qaz kəmərlərinə qoşulduqdan və hava ilə üfürüldükdən sonra işçi təzyiq altında hansı işlərin yerinə yetirilməsi vacibdir?**

- qaynaq tikişlərinin və digər birləşmələrin kipliyini sabunlu su məhlulu və ya cihazla yoxlamaq;
- qaz kəmərlərinin yanından keçməklə qoşulmuş qaz kəməri xəttinin vəziyyətini yoxlamaq;
- istismarda olan qaz kəməri ilə yeni qoşulmuş qaz kəmərinin birləşmə yerində izolyasiyanın keyfiyyətini yoxlamaq və torpaqla doldurmaq;
- görülən işlər barədə "icazə-tapşırıqda" qaz kəmərinin pasportunda müvafiq qeydlər aparmaq.

**100. Qaz kəmərlərinin çəkilmə dərinliyi nə qədər olmalıdır?**

Qaz kəmərlərinin çəkilmə dərinliyi qaz kəmərinin və ya futlyarın üstündən yerin səthinə qədər 0,8 m-dən az olmamaqla nəzərdə tutulmalıdır.

Nəqliyyat vasitələrinin hərəkəti nəzərdə tutulmayan yerlərdə qaz kəmərlərinin çəkilmə dərinliyinin 0,6 m-ə qədər azaldılmasına yol verilir.

**101. Qaz kəmərlərinin avtomobil və dəmir yolları ilə kəsişmələri hansı bucaq altında nəzərdə tutulmalıdır?**

Qaz kəmərlərinin dəmir və tramvay yolları ilə, həmçinin avtomobil yolları ilə kəsişmələri, bir qayda olaraq, $90^0$- li bucaq altında nəzərdə tutulmalıdır.

**102. Yeraltı qaz kəmərlərindən onların dəmir və tramvay yolları ilə kəsişdiyi yerlərdə minimum məsafələr nə qədər olmalıdır?**

Yeraltı qaz kəmərlərindən onların dəmir və tramvay yolları ilə kəsişdiyi yerlərdə minimum məsafələr aşağıdakı kimi qəbul edilməlidirlər:

- körpulərə, borulara, tunellərə və dəmir yollarında piyadalar üçün nəzərdə tutulmuş korpülərə və tunellərə qədər – 30 m;
- tramvay yolları üçün yoldəyişənlərə qədər – 3 m, dəmir yolları ucun 10 m;
- kontakt şəbəkəsinin dayaqlarına qədər – 3 m.

Gostərilən məsafələrin azaldılmasına, kəsişən qurğuların tabeçiliyində olduğu təşkilatlarla razılığı əldə edildikdən sonra yol verilir.

Qaz kəmərlərinin ümumi dəmir yolları şəbəkəsi keçidlərində fərqləndirici sütuncuqların (nişanların) qoyulması zərurəti və onların sənədləşdirilməsi Azərbaycan Respublikası Nəqliyyat Nazirliyinin razılığı ilə həll edilir.

**103. Yeraltı qaz kəmərlərinin nəqliyyat yollarının altından keçiril-məsi zamanı hansı qaydalara əməl edilməlidir?**

Bütün təzyiqli yeraltı qaz kəmərlərinin dəmir yolu və tramvay yolları ilə, I, II, və III – dərəcəli avtomobil yolları ilə, həmçinin şəhərin hüdudlarında sürətli yollarla, maqistral küçələrlə və ümumşəhər əhəmiyyətli yollarla kəsişdiyi yerlərdə cəkilməsi polad futlyarlarda nəzərdə tutulmalıdır. Qaz kəmərlərinin magistral küçələrlə və rayon əhəmiyyətli yollarla, həmçinin yerli əhəmiyyətli küçə və yollarla kəsişdiyi yerlərdə futlyarların qoyulma zərurəti nəqliyyatın hərəkətinin intensivliyindən asılı olaraq layihə təskilatları tərəfindən həll edilir. Bu halda oz davamlılığına və uzun ömürlüyünə görə qoyulan şərtlərə cavab verən qeyri metal futlyarların nəzərdə tutulmasına yol verilir.

Futlyarların ucları kipləşdirilməlidir. Futlyarların bir ucunda muhafizə qurğusunun altına çıxan nəzarət borucuğu nəzərdə tutulmalıdır,

qəsəbələrarası qaz kəmərlərində isə torpaq yatağının kənarından 50 m-dən az olmamaqla kənara çıxarılan, nümunə götürmək üçün qurğusu olan, sorucu şam nəzərdə tutulmalıdır. Futlyarların borulararası boşluğunda qaz təchizatı sistemlərinə xidmət etmək üçün təyin edilmiş istismar olunan rabitə, telemexanika, telefon və elektrik mühafizə drenaj kabellərinin çəkilməsinə yol verilir.

**104. Futlyarın ucları hansı məsafələrdə kənara çıxarılmalıdır?**

Futlyarın ucları aşağıda göstərilən məsafələrdən az olmamaqla kənara çıxarılmalıdır:

- dəmir yolunun torpaq yatağının axırıncı sukənaredici (kuvetlərdən, xəndəklərdən) qurğularından – 3m;
- dəmir yolunun kənar relsindən – 10m; sənaye muəssisələrinin dəmir yolu xəttindən isə – 3m;
- tramvay xətlərinin kənar relsindən – 2m;
- hərəkət ucun nəzərdə tutulan yolun kənarından – 2m;
- avtomobil yollarının kənarından – 3,5m.

Butun hallarda futlyarın ucları torpaq tökümünün dabanından 2 m-dən az olmamaqla kənara cıxarılmalıdır.

**105. Qaz kəmərlərinin təhlükəsiz istismarını təmin etmək üçün açma armaturu harada yerləşdirilməlidir?**

Açma armaturunun quraşdırılması yeri şəhərin, qəsəbənin, yaxud kənd yaşayış məntəqəsinin qaz ilə təmin edilməsi lahiyəsində təyin edilməlidir. Açma armaturu elə yerləşdirilməlidir ki, qəza şəraitində ayrı-ayrı mikrorayonlar, yaxud sahələrin tezliklə kəmərdən açılması mümkün olsun

**106. Bir xəndəkdə iki və daha artıq qaz kəməri quraşdırıldıqda (bir və yaxud müxtəlif səviyyələrdə) onların arasındakı minimal məsafə nə qədər olmalıdır?**

Bir xəndəkdə iki və ya daha artıq qaz kəməri quraşdırıldıqda (bir və yaxud müxtəlif səviyyələrdə) onların arasındakı məsafə quraşdırma və təmir üçün şərait yaradılmasına imkan verməlidir və bu məsafə 300 mm-ə qədər diametri olan borular üçün 0,4 m, 300 mm-dən yuxarı diametri olan borular üçün isə 0,5 m –dən az olmamalıdır.

**107. 3 kqq/sm$^2$ (0,3 Mpa) qədər təzyiqli qaz kəmərləri quraşdırılmış xəndəkdə digər kommunikasiyalar arasındakı minumum məsafə nə qədərdir?**

Xəndəkdə yerləşdirilən 3 kqq/ sm$^2$ (0,3 Mpa) qədər təzyiqli qaz kəməri ilə başqa yeraltı kommunikasiyalar (kabel xətlərindən başqa) arasındakı horizontal məsafə 0,8 m-dən az olmamalıdır.

**108. Yeraltı polad qaz kəmərləri və onların üzərindəki avadanlıqların kipliyinin və izoliyasiyasının vəziyyəti necə yoxlanılır?**

Bütün təzyiqli yeraltı polad qaz kəmərləri, atmaturlar və s. istismar prosesində onların kipliyini, həm də izoliyasiyasının və borunun xarici səthinin vəziyyətini təiyin etmək məqsədi ilə dövrü olaraq yoxlanılmalıdır. Bütün təzyiqli qaz kəmərlərində kipliyin yoxlanılması beş ildə bir dəfədən az olmayaraq aparılmalıdır .

**109. Qaz kəmərlərinin üstü açılmadan kiplik və izoliyasiyasının vəziyyətini necə yoxlamaq olar?**

Qazın sızmasını və izoliyasiyasının zədələnməsinin kəmərin üzərini açmadan da xüsusi cihazlar vasitəsi ilə yoxlanıla bilər. Bu məqsədlə burğac üsulu ilə qaz kəmərlərinin kipliyi yoxlanılır. Paylayıçı küçə qaz kəmərlərində burğaç yoxlama quyusu boru birləşmələrinin yaxınlığında, qaz kəmərinin divarından 0,3-0,5 metr məsafədə, qaz kəmərinin üst səthinin yerləşdiyi dərinliyə müvafiq dərinlikdə qazılır; qış vaxtı torpaq donan zaman isə daha artıq dərinlikdə, torpağın donmuş qatını keçənə qədər qazılmalıdır. Paylayıcı küçə qaz kəmərlərində boruların birləşməsi sxemi olmadığı hallarda, həmçinin də həyət və məhəllə paylayıcı qaz kəmərlərində hər 2 metrdən bir quyu qazılmalıdır. Hissetmə qabiliyyəti həcmə görə 0,01 %-də az olmayan yüksək keyfiyyətli cihazlardan istifadə etdikdə quyular arasındakı məsafəni 5 metrə qədər artırmaq olar.

**110. Qaz kəmərinin kipliyinin, borunun xarici səthinin və izoliyasiyasının vəziyyətinin yoxlanılmasının nəticələri necə sənədləşdirilir?**

Qaz kəmərinin kipliyinin, borunun xarici sətinin və izoliyasiyasının vəziyyətinin yoxlanılmasının nəticəsi qaz kəmərinin pasportunda qeyd edilməli və qaz kəmərinin təmir növü və müddətləri müəyyən edilərkən nəzərə alanmalıdır. Əgər yoxlama zamanı zədələnmə aşkar edilərsə

(izoliyasiyyanın pis vəziyyətdə olması, korroziya ilə zədələnmə), qaz kəmərinin gələcəkdə daha artıq zədələnməsinin qarşısını almaq və aşkar edilmiş zədələrin aradan qaldırılması üçün tədbirlər hazırlanmalıdır.

**111. Quyularda quraşdırılmış siyirtmə, kran, kompensator və başqa armaturlara hansı müddətdən bir texniki xidmət göstərilməlidir.**

Qaz kəmərlərindəki quyularda quraşdırılmış siyirtmə, kran, kompensator və başqa armaturlara qaz təsərrüfatı müəssisəsinin baş mühəndisisnin, yaxud bu müəssisənin vəzifəsini yerinə yetirən təşkilatın təsdiq etdiyi cədvələ uyğun olaraq ildə azı bir dəfə texniki xidmət göstərilməlidir.

**112. Yeraltı qaz kəmərləri ilə başqa yeraltı kommunikasiyalar və qurğular arasındakı horizontal məsafə nə qədər olmalıdır?**

Yeraltı qaz kəmərləri ilə başqa yeraltı kommunikasiyalar və qurğular arasındakı horizontal məsafə aşağıdakı cədvəldə göstərilmiş kəmiyyətdən az olmamalıdır. Eyni zamanda Yeraltı qaz kəmərlərinin qaynaq olunmuş birləşmələrindən yer altında birləşmələrindən yer altında kəsişən mühəndis kommunikasiyalarının (planda) divarına qədər məsafə 1 metrdən az olmamalıdır.

<table>
<tr><th rowspan="3">Qaz kəmərində Qazın təzyiqi kqq/sm2</th><th colspan="5">Yeraltı qaz kəmərlərindən horizontal üzrə binalara və tikintilərə qədər olan məsafə (metrlə)</th></tr>
<tr><th>Binaların və tikintilərin özülünə, yolüstü körpülər və tunellərə qədər</th><th>Kontakt şəbəkələrin və rabitə dayaqlarının hasarlarına qədər</th><th colspan="2">Qıraq yolundan</th><th></th></tr>
<tr><th></th><th></th><th>1520 mm enli dəmir yolu Xəttinin oxuna qədər, Lakin xəndəyin Dərinliyindən az Olmamaq şərtilə Bəndin aşağısına qədər</th><th>Tramvay xəttinin oxuna qədər</th><th>Yolun qıraq daşına qədər</th></tr>
<tr><td>Alçaq təzyiqli (0,05-ə qədər)</td><td>2</td><td>1</td><td>3,8</td><td>2,8</td><td>1,5</td></tr>
<tr><td>Orta təzyiqli (0,05-dən 3-ə qədər)</td><td>4</td><td>1</td><td>4,8</td><td>2,8</td><td>1,5</td></tr>
<tr><td>(3-dən 6-ya qədər)</td><td>7</td><td>1</td><td>7,8</td><td>3,8</td><td>2,5</td></tr>
<tr><td>(6-dan 12-yə qədər)</td><td>10</td><td>1</td><td>10,8</td><td>3,8</td><td>2,5</td></tr>
</table>

**113. Yeraltı qaz kəmərləri ilə başqa yeraltı kommunikasiyalar və qurğular arasındakı şaquli məsafə nə qədər olmalıdır?**

Yeraltı qaz kəmərləri ilə başqa yeraltı kommunikasiyalar və qurğular arasındakı şaquli məsafə aşağıdakı cədvəldə göstərilmiş kəmiyyətdən az olmamalıdır.

Müxtəlif təzyiqli yeraltı qaz kəmərilərinin başqa yeraltı tikintilərlə kəsişdikdə vertikal üzrə (işıqda) məsafələr «**L**»

| | L, m |
|---|---|
| Su kəməri, kanalizasiya, su axıdıcısı, telefon kanalizasiyası və s. | 0,15 |
| İstilik şəbəkəsi kanalı | 0,20 |
| Elektrik kabeli, zirehli rabitə kabeli | 0,50 |
| Gərcinliyi 110- kV olan yağ doldurulmuş kabel. | 1,0 |

**114. Yeraltı qurğularla kəsişən qaz kəmərlərinin çəkilməsi zamanı hansı tələblər gözlənilməlidir?**

Kommunikasiya kanalları (tunellər), piyada tunelləri, kollektorlar və başqa bunlara uyğun yeraltı qurğular ilə kəsişən qaz kəmərləri, habelə tikintilərdən keçən qaz futliyara salınmalı və korroziyaya (paslanmaya) qarşı örtüklə izolə edilməlidirlər. Futliyarın ucları kəsişdikləri tikilinin xarici divarlarından hər iki tərəfə ən azı 2 m-ə qədər çıxarılmalıdır, təbii yaxud süni düzəldilmiş və sıxılmış torpağa oturdulmalı, qətranlı liflərlə kipləşdirilməli və üzərinə bitum tökülməlidir.

Qaz kəmərinin kəsişmə yerindəki və bundan hər iki tərəfə 5 m məsafədəki bütün qaynaq birləşmələri fiziki nəzarət üsulları ilə yoxlanılmalıdır.

Kollektorun, tunelin, quyunun və s. divarlarından futliyar keçdiyi yerlərə diqqətlə kipləşdirilmələdir Təzyiqi 6 kqq/sm$^2$ (0,6 MPa-dan) artıq olan qaz kəmərlərinin göstərilən tikintilərin divarlarından keçirilməsinə icazə verilmir.

Qaz kəmərləri istilik xətləri ilə kəsişdikləri yerlərdə onların istilik xətləri ilə kəsişdikləri kameraların tikinti konstruksiyalarından, keçidsiz kanallarından və taxçalarından keçirilməsinə icazə verilmir.

Qaz kəmərləri ilə istilik şəbəkələrinin kameraları və taxçaları arasındakı məsafə horizontal (işıqda) 0,3 m-dəm az olmamalıdır.

**115. Yeraltı qaz kəmərində, açıcı mexanizmlər qurulmuş quyular hansı tələblərə cavab verməlidir ?**

Yeraltı qaz kəmərində, açıcı mexanizmlər qurulmuş quyular tikinti xəttindən, binanın divarından, sənaye, yaxud kommunal müəssisənin hasarından 2 metrdən az olmayan məsafədə habelə ona xidmət etmə üçün əlçatan yerdə yerləşdirilməlidir. Çöl şəraitində quyuların ağzı yerin səhtindən 0,4-0,5 metr hündürdə olmalı və asanlıqla açılan, qıfıllı qapaqla örtürməlidir.

**116. Yerüstü qaz kəmərinin elektrik xətləri ilə kəsişdikləri yerlərdə armaturların kondensat yığıçılarının və başqa qurğuların qoyulmasına icazə verilirmi?**

Yerüstü qaz kəmərinin elektrik xətləri ilə kəsişdikləri yerlərdə hər iki tərəfdən 10 metirdən yaxın məsafədə armaturların kondensat yığıçılırının və başqa qurğuların qoyulmasına icazə verilmir.

**117. Yerüstü qaz kəmərlərinin binaların divarı boyu və dirəklər üzərində çəkilməsi zamanı nəyə diqqət yetirilməlidir?**

Alçaq və orta təzyiqli qaz kəmərlərini, oda davamlığı IV dərəcədən aşağı olmayan yaşayış və ictimai binaların xarici divarları boyu, hər cür təzyiqli qaz kəmərlərinin isə ayrı qoyulmuş yanmayan dirəklərin (dayaqların) üzəri ilə çəkmək olar. Boruların şərti diametri 50 mm-dək olan alçaq təzyiqli qaz kəmərlərinin oda davamlılığı V dərəcə olan yaşayış binalarının (taxtadan olan) xarici divarları boyu çəkmək olar.

**118. Dayaqlar üzərində qoyulan yerüstü qaz kəmərlərinin binalara və tikililərə qədər olan üfüqi (işıqla) məsafə minimum nə qədər olmalıdır?**

Dayaqlar üzərində qoyulan Yerüstü qaz kəmərlərinin binalaraın divarlarına qədər olan üfüqi (işıqla) məsafə, aşağıdakı cədvəldə göstərilmiş kəmiyyətdən az olmamalıdır.

| Aşağıdakı cədvəldə göstərilmiş kəmiyyətdən az olmamalıdır. | Qazın təziyqi kqq/sm2 | | |
|---|---|---|---|
| | **0,5-ə qədər** | **0,05-dən 3-ə qədər** | **3-dən 6-ya qədər** |
| İstehsalı yanğın təhlükəsinə görə aşağıda göstərilən kateqoriyalara aid olan istehsalat və anbar binaları: | | | |
| A, B və V | 5 | 5 | 5 |
| Q və D | 2 | 2 | 2 |
| Tezalışan və yanar mayelərin açıq anbarları və yana bilən materiallar anbarı: | | | |
| Sənaye müəssisələri ərazisində | 10 | 10 | 20 |
| Sənaye müəssisələrindən kənarda | 20 | 20 | 40 |
| Yaşayış və ictimai binalar | 2 | 5 | 5 |
| Dəmir yolu və tramvay xətləri (yuxarıdakı rels qədər) | 3 | 3 | 3 |
| Yeraltı kommunikasiyalar: su kəməri,kanalizasiya, qızdırma boruları, telefon kanalizasiyası,elektrik kabel blokları (qaz kəməri dayağı özülünün qırağından) | 1 | 1 | 1 |
| Açıq elektrik yarımstansiyasının hasarı | 10 | 10 | 10 |
| Hava elektrik xəttlərinin naqilləri | Hava elektrik xətti dayağının hündürlüyündən az olmamalıdır. | | |
| Həçinin, darısqal şəraitdə | Qaz kəmərinin mühafizə torpaqlayıcısı olmaq şərti ilə TN və Q 11-37-76 11cədvəlində göstərilənlərdən az olmamalıdır | | |
| Yollar (yolqırağı daşdan,xəndəyin qıraq hissəsinə, yaxud yol qırağı bəndin aşağı hissəsinə qədər) | 1,5 | 1,5 | 1,5 |
| Açıq od olan tikintilər və əridilmiş metalın buraxıldığı yerlər. | 10 | 10 | 10 |

Əgər dayağın hündürlüyü elektrik xəttinin hündürlüyündən artıqdırsa, qaz kəməri ilə elektrik xətti arasındakı məsafə qaz kəməri dayağının hündürlüyündən az olmamalıdır.

**119.Bir neçə yerüstü qaz kəməri, yaxud qaz kəməri ilə başqa boru kəmərləri eyni dayaq üzərində birlikdə çəkilə bilərmi?**

Bir neçə yerüstü qaz kəməri, yaxud qaz kəməri ilə başqa boru kəmərləri birlikdə çəkildikdə, əgər qaz kəmərinin və onun dayaqlarının saxlama qüvvəsi buna imkan verirsə, alçaq və orta təzyiqli qaz kəmərlərinə başqa qaz kəmərlərinin və ya boru kəmərlərinin bərkidilməsinə icazə verilir. Belə bərkitmənin mümkün olub-olmaması layihələşdirici təşkilat təyin etməlidir. Bu məqsədlər üçün dirsəklərin (kronşteynlər) qaynaq edilməsinə ancaq sənaye müəssisələri ərazisində olan qaz kəmərlərində icazə verilir. Dirsəklər (kronşteynlər) boru divarlarının qalınlığı 6 mm-dən az olmayan qaz kəmərlərinin dairəvi tirlərinə,yaxud qabırğalara qaynaqla bənd edilməlidir. 6 mm-dən az olmayan qaz kəmərlərinin dairəvi tirlərinə, yaxud qabırğalara qaynaqla bənd edilməlidir.

**120.Nəm qaz nəql edən daxili qaz kəmərlərinin çəkilməsi mailliyi necə nəzərdə tutulmalıdır?**

Nəm qaz nəql edən daxili qaz kəmərlərinin çəkilməsi mailliyi 3%-dən az olmamalıdır.

**121.AzDTN 2.13-1 standarta əsasən yaşayış məskənləri ərazisindən kənarda polietilen borulardan qaz kəmərlərinin hansı maksimal işçi təzyiq həddinə qədər çəkilməsinə icazə verilir?**

AzDTN 2.13-1 standarta əsasən yaşayış məskənləri ərazisindən kənarda polietilen borulardan qaz kəmərlərinin maksimal işçi təzyiq həddi - 6 atm-dir.

**122.Yerüstü boru qaz kəmərləri hansı hündürlükdə çəkilməlidir?**

- Yerüstü boru qaz kəmərləri nəqliyyat vasitələri keçməyən, adamlar gəzən yerlərdə yer səthindən minimum – 2.2 m,
- nəqliyyat vasitələri və adamlar keçməyən yerlərdə – 0.5 m,
- nəqliyyat vasitələri keçən yerlərdə minimum – 4.5 m,
- dəmir yolu keçən yerlərdə minimum – 5.6 m,
- elektrik dəmir yolu keçən yerlərdə minimum – 7.3 m hündürlükdə çəkilməlidir.

**123. Hansı hallarda sənaye müəssislərinə odarizə olunmamış qaz verilə bilər?**

Sənaye müəssisələrinin istehsalat qurğularına odarizə olunmamış qaz o şərtlə verilə bilər ki, müəssisəyə gələn qaz kəməri yaşayış məskənlərinin

ərazlərindən kənarda olsun, qaz avadanlıqları və qaz kəmərləri yerləşən otaqlarda qaz yığılmasını xəbər verən xəbərdaredici cihazlar qoyulsun və odarizə olunmamış qazın təhlükəsiz istifadə edilməsini təmin edən digər əlavə tədbirlər həyata keçirilsin.

**124. Sənaye müəssisələrinin və ayrılıqda yerləşən qazanxanaların istilik qurğuları üçün maksimum hansı təzyiqdə qaz tələb oluna bilər?**

Sənaye müəssisələrinin və ayrılıqda yerləşən qazanxanaların istilik qurğuları üçün təzyiqi 1,2 MPa-ya (12 kqq/$sm^2$-ə) qədər olan qazdan istifadə olunmasına o zaman yol verilir ki, istehsalat texnologiyasının sərtlərinə gorə həmin obyektlər üçün göstərilən təzyiqdə qaz tələb olunsun.
İstehsalat binalarına sonradan əlavə edilmiş tikililərdə yerləşən qazanxanalarda təzyiqi 0,6 MPa-ya (6 kqq/$sm^2$-ə) qədər olan qazdan istifadə olunmasına yol verilir.

**125. Qazpaylayıcı stansiyalardan (QPS) cıxan qazın yeraltı qaz kəmərlərinə verilərkən temperaturu nə qədər olmalıdır?**

Qazpaylayıcı stansiyalardan (QPS) çıxan qazın yeraltı qaz kəmərlərinə verilərkən temperaturu mənfi $10^0$S-dən, yerüstü və yer səthindən yuxarı çəkilən qaz kəmərlərinə verildikdə isə tikinti aparılan rayonun xarici havasının hesabi temperaturundan aşağı olmamalıdır.
Xarici havanın hesabi temperaturu СНиП 2.01.01 normativ sənədinin tələblərinə uyğun olaraq 0,92 təminatı ilə ən soyuq beş günün temperaturu qədər qəbul edilir.
Şişən suxurlarda çəkilən yeraltı qaz kəmərlərinə qazın QPS-dən mənfi temperaturda verilməsi zamanı qaz kəmərlərinin dayanıqlığını təmin edən tədbirlər nəzərdə tutulmalıdır.

**126. Qaz kəmərlərinin su maneələrindən keçidləri necə həyata keçirilməlidir?**

Qaz kəmərlərinin su maneələrindən sualtı keçidləri hidroloji, muhəndis geoloji və topoqrafiya axtarış işlərinin göstəricilərinə əsasən nəzərdə tutulmalıdırlar.
Qaz kəmərlərinin sualtı kecid trassasının, çay məcrasının eninin az olduğu və sahili yuyulmayan, dayanıqlı və düzxətli hissəsindən keçirilməsi nəzərdə tutulmalıdır. Sualtı keçid trassalarının istiqaməti, bir qayda olaraq,

çayın mərkəzi dinamik oxuna perpendikulyar nəzərdə tutulmalı və bu keçidlər çayın məcrasının qaya və daşlı sahillərindən kənarlasdırılmalıdır. Su maneələrinin orta mövsumi axın səviyyəsinə muvafiq olaraq, bu maneələrin eni 75 m və daha cox olduqda qaz kəmərlərinin sualtı keçidləri, bir qayda olaraq, iki xətli borulardan ibarət olmaqla bu boruların hər birinin hesabi qaz sərfinin 0,75 misli qədər qaz keçirmə qabiliyyətinə muvafiq nəzərdə tutulmalıdır. Qaz kəmərlərinin ikinci (ehtiyat) xəttinin nəzərdə tutulmamasına asağıdakı hallarda yol verilir:

- həlqəvi qaz kəmərləri olduğu halda, sualtı keçid bağlanıldıqda qaz istehlakçılarının fasiləsiz qaz ilə təchiz edilməsi mumkun olarsa;
- sənaye istehlakçılarına dalanlı qaz kəməri çəkildiyi halda, sualtı keçidin təmir olunduğu muddətdə bu istehlakçıların basqa yanacaq növunə keçmək imkanı olarsa.

Qaz kəmərləri təchizatında fasiləyə yol verməyən istehlakçılara çəkilmiş olduğu halda, su maneələrinin eni 75m-dən az olduqda və ya 10% təminatlı sərfə uyğun suyun yuxarı səthi (SYS) üzrə suların daşqın ərazilərinin eni 500m-dən artıq olduqda, həmçinin daşqın sular ilə ərazinin basılma muddəti 20 gündən çox davam etdikdə, həmçinin dayanıqlı dibi və sahili olmayan dağ çayları və digər su maneələri olduqda, bu kəsişmələrdə ikinci (ehtiyat) boru xəttinin çəkilməsinə yol verilir.

Sualtı qaz kəməri keçidlərinin uzunluğunu müəyyən edərkən, keçidin sərhəddi 10% təminatlı sərfə uyğun su maneələrində suyun yuxarı səthinin (SYS) qiymətlərindən asağı olmamaq şərti ilə müəyən edilən sərhədlərə uyğun qəbul edilir. Bağlayıcı qurğuların yerləşdirilməsi bu sahənin sərhədlərindən kənarda nəzərdə tutulmalıdır.

**127. Sualtı keçidlərdə istifadə olunan boruların divarının qalınlığı nə qədər olmalıdır?**

Sualtı keçidlərdə istifadə olunan boruların divarının qalınlığı 5 mm-dən az olmamaq sərti ilə hesabi qiymətlərdən, bir qayda olaraq, 2 mm çox ölçüdə qəbul edilməlidir. Diametri 250 mm-dən aşağı olan qaz kəmərlərinin su altından qalxmasına qarşı əks təsir göstərmək məqsədilə boru divarı qalınlığının artırılmasına yol verilir.

**128. Su altından paralel qaz kəmərləri çəkilərkən onların oxları arasındakı məsafələr nə qədər olmalıdır?**

Su altından paralel qaz kəmərləri çəkilərkən onların oxları arasındakı məsafələr 30 m-dən az olmamaq sərti ilə yerinə yetirilməlidir. Gəmiçiliyə yararlı olmayan və sahili yuyulmayan çaylarda, həmçinin əhalinin məskunlaşdığı ərazilərin hududlarında olan keçidlərdə iki kəmərin bir xəndəkdə
çəkilməsinə yol verilir. Bu halda qaz kəmərlərinin arasındakı məsafə 0,5 m-dən az olmamalıdır.

Su hövzəsi ərazilərindən qaz kəmərləri çəkilərkən onların arasındakı məsafənin, bu kəmərlərin xətti hissələrindəki məsafə qədər qəbul edilməsinə yol verilir.

**129. Qaz kəmərlərinin sualtı keçidlərdə kəsişdiyi su maneələrinin dibinə qədər dərinliyi necə nəzərə alınmalıdır?**

Qaz kəmərlərinin sualtı keçidlərdə kəsişdiyi su maneələrinin dibinə qədər dərinliyə salınmaqla nəzərdə tutulmalıdır. Ballastlasdırılmış qaz kəmərinin yuxarı layihə səthi çay dibinin proqnozlaşdırılan profilindən 0,5 m, gəmiçiliyə yararlı çaylarda isə 1 m aşağı səviyyədə, tikintinin
qurtarmasından sonra 25 il muddətində çay dibinin mumkun ola bilən yuyulmasını nəzərə almaqla qəbul edilməlidir. Gəmiçiliyə yararlı olmayan çayların hövzələrində su altından keçidlər tikilərkən, həmçinin məcrası qaya və daş qruntlarda olan ərazilərdə qaz kəmərlərinin qoyulma dərinliyinin azaldılmasına yol verilir, lakin ballastlaşdırılmış qaz kəmərlərinin yuxarı səviyyəsinin ölçüləri istənilən halda, istismarın hesabi muddəti üçün çayın müəyyən olunmuş yuyulma dərinliyinin dibindən aşağı olması şərtilə qəbul edilməlidir.

**130. Qaz kəmərlərində bağlayıcı qurğular harda nəzərdə tutulmalıdır?**

Qaz kəmərlərində bağlayıcı qurğular aşağıdakı yerlərdə nəzərdə tutulmalıdır:

- yaşayıs evlərinin, ictimai, istehsalat binalarının girişlərində və ya bir-birinə bitişik binalar qrupunda qaz sərfedən xarici qurğuların girişində;
- həlqələnmiş qaz kəməri olduqda, iki və daha artıq QTM olan sistemlərdə, QTM-ə girişlərdə və QTM-dən çıxışlarda;

- qaz kəmərlərindən ayrı-ayrı mikrorayonlara, məhəllələrə, bir sahədə yerləşən evlər qrupuna və ya 400-dən cox mənzili olan evlərə ayrılan qollarda;
- qaz təchizatının etibarlığını və təhlükəsizliyini təmin etmək məqsədilə, qaz kəmərlərinin ayrı-ayrı hissələrinin bağlanılması üçün;
- su maneələrinin iki və çox xətlə kəsişdiyi yerlərdə, həmçinin su maneələrinin suyun orta axın səviyyəsində eni 75m və çox olduğu və bir xətlə kəsişdiyi yerlərdə;
- I və II dərəcəli avtomobil yolları və ümumi dəmir yolu şəbəkəsi ilə kəsişən yerlərdə.

**131. Bağlayıcı qurğuların qoyulmamasına hansı hallarda yol verilir?**

Bağlayıcı qurğuların qoyulmamasına aşağıdakı hallarda yol verilir:

- müəssisələrin QTM-dən qabaqda, paylayıcı qaz kəmərlərindən müəssisəyə ayrılan qol üzərində olan bağlayıcı qurğu QTM-dən 100 m-dən artıq olmayan məsafədə yerləşdikdə;
- ümumi dəmir yolu şəbəkələri və I və II dərəcəli avtomobil yolları ilə kəsişmələrdə keçid sahəsində qazın verilməsini bağlamaq üçün, dəmir yolu və avtomobil yolundan 1000 m-dən artıq olmayan məsafədə bağlayıcı qurğu (xətti siyirtmələr, QTM və QPS-dən sonra bağlayıcı qurğu) yerləsdikdə.

**132. Xarici qaz kəmərləri üzərində qoyulan bağlayıcı qurğular harda yerləşdirilməlidir?**

Xarici qaz kəmərləri üzərində qoyulan bağlayıcı qurğular quyularda, yerüstu skaflarda və ya hasarlanmış sahələrdə, həmçinin binaların divarlarında yerləsdirilməlidir.

Yeraltı qaz kəmərləri üzərində bağlayıcı qurğuların yerləsdirilməsi, bir qayda olaraq, quyularda nəzərdə tutulmalıdır.

Bağlayıcı qurğuların yerləşdirilməsi onlara xidmət etmək üçün əlverişli olan yerdə nəzərdə tutulmalıdır. Paralel çəkilən qaz kəmərlərində qoyulan bağlayıcı qurğular bir-birinə nisbətən elə qarşılıqlı məsafədə yerləşdirilməlidirlər ki, onların sökülüb-yığılması və onlara xidmət edilməsi üçün əlverişli şərait təmin olunsun.

Bağlayıcı armaturların sökülüb-yığılmasını təmin etmək üçün, quyularda kompensasiya qurğuları nəzərdə tutulmalıdır.

**133. Binaların divarlarında qoyulmaq üçün nəzərdə tutulan bağlayıcı qurğular pəncərə və qapı yerlərindən hansı məsafələrdə yerləsdirilməlidirlər?**

Binaların divarlarında qoyulmaq üçün nəzərdə tutulan bağlayıcı qurğular pəncərə və qapı yerlərindən aşağıdakı məsafələrdən az olmamaqla yerləşdirilməlidirlər:

- alçaq təzyiqli qaz kəmərləri üçün üfüqi xətt uzrə, bir qayda olaraq, – 0,5m;
- orta təzyiqli qaz kəmərləri üçün üfüqi xətt üzrə – 3m;
- II kateqoriyalı yuksək təzyiqli qaz kəmərləri üçün üfüqi xətt üzrə – 5m.

## III FƏSİL
## DAXİLİ QAZ AVADANLIQLARI VƏ XƏTLƏRİNİN TİKİNTİSİ VƏ İSTİSMARI HAQQINDA

**1. Yaşayış evlərinin qaz təchizatı sistemlərinin quraşdırılması və istismarı qaydaları hansılardır?**

Yaşayış evlərinin qaz təchizatı mənbəyi QTŞ, QTM və fərdi tənzimləyicilərin çıxışından ayrılan aşağı təzyiqli qaz kəmərləridir. Yaşayış evlərinin qaz təchizatı (qaz sərfini ölçən sayğacdan sonra) qazpaylayıcısı ilə istehlakçının sərhəddindən sonra yaşayış mənzillərinə çəkilən qaz xətləri və onlar üzərindəki qurğulardan ibarətdir. Bu xətlər bir qayda olaraq polad borulardan istifadə edilməklə çəkilir. Çəkilən qaz xətləri üçün borunun divarının qalınlığı 3 mm-dən, xarici yerüstü və yer səthindən yuxarı çəkilən qaz kəmərləri üçün isə 2 mm-dən az olmamaqla qəbul edilməlidir. Nəzərdə tutulan boruların, onların istehsal olunduğu zavodda hidravlik sınaqdan keçirilməsi, boruların mövcud standartlara və ya tikinti şərtləri tələblərinə uyğun olan həcmdə hidravlik təzyiqə davamlı olması haqqında sertifikatı olmalıdır. Yaşayış binalarının daxilində çəkilən qaz kəmərləri bir qayda olaraq açıq nəzərdə tutulmalıdır.

**2. Yaşayış evlərinin qaz təchizatı sistemlərinin quraşdırılması zamanı hansı tələblərə riayət olunmalıdırı?**

Binaya qaz kəməri yeraltı gəlib yerüstünə çıxan yerdə və mənzilə, otaqlara giriş yerlərində qaz kəmərlərini deformasiyadan, yaxud mexaniki zədədən qorunmaq üçün futlyara (patrondan) keçirilməlidir. Qaz kəməri mənzilə ancaq yaşayış olmayan otaqdan keçməklə 2 m hündürlük üzrə daxil edilir və mənzilin divarına bir-birindən münasib məsafədə yerləşən polad qarmaqlarla bərkidilir. Qaz kəməri üzərindəki bağlayıcı armaturlar divarda açıqda olmaqla hökmən korroziyadan qorunması üçün 2 dəfədən az olmayaraq yağlı boya ilə rənglənməlidir. Bina daxilində qaz kəmərləri ilə divar üstü açıq elektrik xətləri arasındakı məsafə 25 sm, divar içi örtülü xətlərlə isə 5 sm-dən aşağı olmamalıdır. Əgər qaz kəməri divar üstü açıq kabellə kəsişərsə, kəsişmə nöqtəsində sağa və sola 10 sm ölçüdə dielektrik materialla izolyasiya olunmalıdır. İşin icra olunmasında kəmərin mümkün

qədər başqa mühəndis kommunikasiyaları ilə kəsişməsindən yayındırılması tövsiyə olunur. Qaz cihazına daxil olana qədər cihaza yaxın 40 sm-dən aşağı olmamaqla kəmər üzərində nəzarət kranı quraşdırılmalıdır. Binanın xarici divarları boyu çəkilən qaz kəmərlərində pəncərə və balkonların altında flyans birləşmələri və armaturlar olmamalıdır.

**3. Binaların və qurğuların daxilində çəkilən qaz kəmərləri necə olmalıdır?**

Binaların və qurğuların daxilində çəkilən qaz kəmərləri, polad borulardan nəzərdə tutulmalıdır.

Səyyar aqreqatların, daşına bilən qaz odluqlarının, qaz cihazlarının, NÖC və avtomatika cihazlarının birləsdirilməsi üçün, rezin və rezin parçalı şlanqların nəzərdə tutulmasına yol verilir. Şlanqlar seçilərkən onların həmin təzyiqdə və temperaturda nəql edilən qaza davamlığı nəzərə alınmalıdır.

Boruların birləşdirilməsi, bir qayda olaraq, qaynaqla nəzərdə tutulmalıdır. Sökülə bilən (yivli və flyanslı) birləşmələrin nəzərdə tutulmasına ancaq bağlayıcı armaturlar, qaz cihazları, NÖC, qaz tənzimləyicilər və digər avadanlıqlar quraşdırılan yerlərdə yol verilir.

Qaz kəmərlərində sökülə bilən birləşmələrin qoyulması, onların yoxlanılması və təmiri üçün əlverişli olan yerdə nəzərdə tutulmalıdır.

**4. Qaz kəmərləri digər boru kəmərləri ilə bir yerdə ümumi dayaqlarda çəkilərsə hansı tələblər gözlənilməlidir?**

Qaz kəmərləri digər boru kəmərləri ilə bir yerdə ümumi dayaqlarda çəkilərsə qaz kəmərləri onlardan yuxarıda, baxılmaq və təmir işləri aparmaq üçün əlverişli olan məsafədə yerləşdirilməlidirlər.

**5. Sənaye və kənd təsərrüfatı müəssisələrinin, istehsalat xarakterli məişət müəssisələrinin istehsalat otaqlarında, qaz kəmərlərində hansı yerlərdə bağlayıcı qurğular nəzərdə tutulmalıdır?**

- qaz kəmərinin otaqların daxilinə girişində;
- hər aqreqata ayrılan qollarda;
- odluqların və fitillərin qabağında;
- üfürmə boru kəmərlərində, onların qaz kəmərlərinə birləşdirildiyi yerlərdə.

Otaqların daxilində qaz kəmərinin girişindən 10m-dən uzaq olmamaqla yerləşdirilmiş qaz sayğacı və ya QTQ olarsa, qaz sayğacından və ya QTQ-dən qabaq olan siyirtmə və ya kran girişdə bağlayıcı qurğu kimi hesab edilir.

Beton döşəmələrdə kanallarda və ya divarların şırımlarında çəkilən qaz kəmərlərində armaturların qoyulmasına yol verilmir.

**6. Yasayış evlərində qaz kəmərlərinin çəkilməsi zamanı hansı tələblər nəzərə alınmalıdır?**

Yasayıs evlərində qaz kəmərlərinin çəkilməsi, yaşayış olmayan otaqlarda nəzərdə tutulmalıdır.

Mövcud olan və yenidənqurma işləri aparılan yaşayış evlərində başqa imkan olmadıqda, alçaq təzyiqli qaz kəmərlərinin yaşayış otaqlarından tranzit kimi çəkilməsinə yol verilir. Tranzit çəkilən

qaz kəmərlərinin yaşayış otaqlarından keçən hissəsində yivli birləşmələr və armaturlar olmamalıdır. Qaz dayaqlarının yaşayış otaqlarından və sanitar qovşaqlarından çəkilməsinə yol verilmir.

Daxili qaz kəmərləri, o cumlədən kanallarda çəkilənlər rənglənməlidirlər. Rənglənmək üçün suyadavamlı lak-boya materialları nəzərdə tutulmalıdır.

**7. Yaşayış evlərində və ictimai binalarda (ictimai iaşə muəssisələri və istehsal xarakterli məişət xidməti müəssisələri istisna olmaqla) çəkilən qaz kəmərlərində bağlayıcı qurğular harada nəzərdə tutulmalıdır?**

- beş mərtəbədən yüksək olan mərtəbələrə xidmət edən dayaqları bağlamaq üçün;
- sayğaclardan qabaqda (əgər sayğaca gedən qazı bağlamaq üçün qaz kəmərinin girişində qoyulmuş bağlayıcı qurğudan istifadə etmək mümkün deyilsə);
- hər bir qaz cihazının, soba və ya qurğunun qarşısında;
- istilik sobalarına və ya cihazlarına ayrılan qollarda.

Xörək hazırlanan qazanlara, restoran pilətələrinə, istilik sobalarına və digər anoloji avadanlıqlara çəkilən qaz kəmərlərində ardıcıl olaraq iki bağlayıcı qurğu nəzərdə tutulmalıdır**:**

- birini – cihazın (avadanlığın) tam bağlanılması üçün;
- digərini – odluğun bağlanılması ucun.

O cihazların ki, konstruksiyasında (qaz pilətələri, su qızdırıcıları, soba odluqları və s.) odluqların qarsısında bağlayıcı qurğular nəzərdə tutulub, həmin cihazlara çəkilən qaz kəmərlərində bir bağlayıcı qurğu qoylmalıdır. Beş və az mərtəbəli yaşayış evlərinin dayaqlarından qazın verilməsini (binaların girişlərində) kəsmək üçün bağlayıcı qurğuların qoyulması yerli konkret şəraitdən, o cümlədən qəza-bərpaetmə və digər işlərin aparıldığı hallarda, bağlanılacaq mərtəbələrin və mənzillərin sayından asılı olaraq layihə təskilatı tərəfindən həll edilir.
Dayaqların bağlanılması üçün nəzərdə tutulan qurğular imkan daxilində binanın xaricində qoyulmalıdırlar.

**8. Adamlar keçən yerlərdə qaz kəmərlərinin hündürlüyü nə qədər olmalıdır?**

Adamlar keçən yerlərdə, qaz kəmərlərinin çəkilməsi döşəmədən qaz kəmərlərinin altına qədər, istilik izolyasiyası olduqda isə izolyasiyanın altına qədər 2,2 metrdən az olmayan hündürlükdə nəzərdə tutulmalıdır.

**9. Yasayış binalarında nəzarət sistemi və siqnalizasiya qoyulması nə vaxt nəzərdə tutulmalıdır?**

Yasayış binalarında, mərtəbələrin sayından asılı olmayaraq, qaz pilətələri, su qızdırıcıları, isitmə və digər aparatlar mətbəxlərdə, yaşayış və qeyri-yaşayış otaqlarında qoyularkən qazın verilməsi dayandırıldıqda və havada təbii qaz alovunun yayılmasının aşağı qatılıq həddindən 10%-dən yuxarı qatılıq həddinə çatdıqda, avtomatik açılma ilə qaz toplanmasına qarşı nəzarət sistemi və siqnalizasiya qoyulması nəzərdə tutulmalıdır.

**10. Yanma məhsullarının kənarlaşdırılması üçün tüstü bacaları nəzərdə tutulan otaqlara olan tələblər hansılardır?**

Yanma məhsullarının kənarlaşdırılması tüstü bacalarına nəzərdə tutulan qaz su qızdırıcısı, həmçinin istilik qazanı və ya istilik aparatının yerləşdirilməsi üçün təyin edilmis otaqların hundurluyu 2m-dən az olmamalıdır. Otaqların həcmi bir cihaz qoyulduqda 7,5 $m^3$-dən və iki istilik cihazı qoyulduqda 13,5 $m^3$-dən az olmamalıdır.
Qazanlar, aparatlar və qaz su qızdırıcıları qoyulan mətbəxlərdə və ya otaqlarda ventilyasiya kanalları olmalıdır. Havanın daxil olması üçün bitişik otaqlara çıxan divarın və ya qapının aşağı hissəsində barmaqlıq və

ya qapı ilə döşəmə arasında boşluq en kəsiyi 0,02 $m^2$-dən az olmayan ara nəzərdə tutulmalıdır.

**11. Otaqların isidilməsi üçün cihazlar qoyulduqda hansı tələblər nəzərə alınmalıdır?**

Otaqların isidilməsi üçün yanma məhsullarının tüstü bacalarına kənarlaşdırılması ilə qaz kaminlərinin, kaloriferlərin və zavodda hazırlanmış digər cihazların nəzərdə tutulmasına yol verilir. Həmin qurğuların qaz odluqları təhlükəsizlik avtomatikası ilə təchiz olunmalıdırlar.

O otaqlarda ki, qaz kaminlərinin və ya kaloriferlərin qoyulması nəzərdə tutulur, həmin otaqlarda nəfəslikli pəncərə və ya sorucu ventilyasiya kanalları olmalıdır.

**12. İctimai binaların qaz təchizatına olan tələblər hansılardır?**

Normativ sənədlərə əsasən qazlaşdırılmasına yol verilən müvafiq ictimai binaların qaz cihazları, yanma məhsullarının kənarlaşdırılması ilə nəzərdə tutulmalıdır.

Həmin binalarda ikidən çox olmamaqla məişət qaz pilətələrinin (tüstü bacaları olmadan), həmçinin laboratoriya odluqlarının nəzərdə tutulmasına yol verilir.

Adamlar toplana bilən otaqların altında yerləşdirilmiş, (yemək və ticarət zalları, foye və s.) mətbəxlərdə avadanlıq kimi saatlarla fasiləsiz işləməyə hesablanmamaq sərti ilə, bir qaz plitəsinin və bir qaz su qızdırıcısının və ya su qaynadıcısının qoyulmasına Respublika Gigiyena və Epidiomologiya Mərkəzi və Azərbaycan Respublikası Fövqəladə Hallar Nazirliyinin Dövlət Yanğın Təhlükəsizliyi Xidməti ilə razılaşdırmaqla yol verilir.

Yuxarıda göstərilən otaqlarda MKHQ balonlarının qoyulmasına yol verilmir.

Qaz avadanlıqlarının qoyulması nəzərdə tutulan otaqlarda təbii işıqlandırma və iş vaxtı üç dəfədən az olmayan, is vaxtından kənar isə bir dəfə hava mübadiləsini təmin edən, hesabatla təyin olunan daimi axın-sorma ventilyasiyası olmalıdır.

**13. Məisət qaz cihazlarının qarsısında qazın təzyiqi nə qədər olmalıdır?**

Məisət qaz cihazlarının qarsısında qazın təzyiqi aşağıda göstərilən cədvəlin 4-cu bəndində göstərilən təzyiqdən artıq olmamaqla, cihazların pasport gostəricilərinə uyğun olaraq qəbul edilməlidir:

| S/s | Qaz istehlakcıları | Qazın təzyiqi, MPa (kqq/sm2) |
|---|---|---|
| 1 | Sənaye və kənd təsərrufatı müəssisələrinin istehsalat binaları, həmçinin ayrılıqda yerləşən qazanxanalar və istehsalat xarakterli məişət xidməti müəssisələri (hamamlar, camaşırxanalar, kimyəvi təmizləmə fabrikləri, çörək və şirniyyat məhsulları müəssisələri və s.) | 0,6 (6) |
| 2 | Bənd 1-də göstərilmiş istehsalat xarakterli məişət xidməti müəssisələri basqa məqsədlər üçün nəzərdə tutulmuş istehsalat binalarına əlavə edilmiş tikililərdə yaxud onların daxilində yerləsdirildikdə | 0,3 (3) |
| 3 | Qeyri-istehsalat xarakterli məişət xidməti müəssisələri və ictimai binalar | 0,005 (0,05) |
| 4 | Yaşayıs binaları | 0,003 (0,03) |

**14. Sənaye, kənd təsərrüfatı və kommunal müəssisələrində daimi xidmət işçiləri olmadan qaz avadanlıqlarının istismarına hansı hallarda icazə verilə bilər?**

Daimi xidmət işçiləri olmadan qaz avadanlıqlarının istismarına aşağıdakı şərtlər yerinə yetirildikdə icazə verilə bilər:

- avadanlıqlar giriş qapıları siqnalizasiya qurğuları ilə təmin edilmiş, ayrıca bağlı binalarda yerləşdirildikdə;
- bina partlayış təhlükəsi istisna olunan işıqlandırma sistemi ilə təmin edildikdə;
- qaz yanacağı ilə işləyən avadanlıqlar müvafiq layihələndirmə norma və qaydalarına uyğun olaraq təhlükəsizlik avtomatikası, avtomatik nəzarət və tənzimləmə vasitəsi ilə təchiz edildikdə.

**15. Sənaye, kənd təsərrüfatı və kommunal müəssisələrin qaz avadanlıqlarına nələr daxildir?**

Sənaye, kənd təsərrüfatı və kommunal müəssisələrinin qaz avadanlıqlarının tərkibinə qaz kəmərləri, qaz tənzimləyici məntəqələr və ya qurğular və qazdan yanacaq kimi istifadə edən aqreqatların (qazanlar, sobalar (peçlər) və s.) qaz avadanlıqları daxildirlər.

**16. Yeni tikilmiş istilik qazanxanalarının istismara buraxılmasına hansı işlər yerinə yetirildikdən sonra icazə verilir ?**

Yeni tikilmiş istilik qazanxanalarının istismara buraxılmasına aşağıdakı işlər yerinə yetirildikdən sonra icazə verilir:

- qaz kəmərlərinin və qaz avadanlıqlarının təhlükəsizlik avtomatikası və nəzarət ölçü cihazlarının layihəyə uyğunluğu və tam istismara yararlığı təmin edildikdə;
- tüstü kənaredici və ventilyasiya qurğularının layihəyə uyğunluğu, binanın partlayış təhlükəsizliyini təmin edən elektrik işıqlandırılması ilə təmin olunması;
- örtüyün və divarların qaz keçirməzliyi barədə (mövcud divarlara bitişik tikilmiş qazanxanalar üçün) akt təqdim edildikdə;
- Qaz təchizatı müəssisəsinin nümayəndəsi və qazanxananın təhlükəsiz istismarına cavabdeh məsul şəxslərin iştirakı ilə tərtib olunmuş qəbul aktının təsdiq olunmuş surəti mövcud olduqda;
- xidmət heyətinin biliklərinin yoxlanılması haqqında müvafiq sənəd (protokol) təqdim edildikdə.

**17. Müəssisələrdə qaz avadanlıqlarının texniki xidməti və təmiri işləri kimlər tərəfindən yerinə yetirilir?**

İstismar prosesində qaz avadanlıqlarının texniki xidməti və təmiri “Qaz təsərrüfatında texniki təhlükəsizlik qaydaları” və “Qaz təsərrüfatında təhlükəsizlik qaydaları”nın tələblərinə əsasən, müəssisələrin işçiləri və ya müqavilə əsasında Qaz təchizatı müəssisəsi tərəfindən yerinə yetirilməlidir.

**18. İctimai və yaşayış binalarının aşağı təzyiqli daxili qaz xətləri kipliyə hansı təzyiqdə və müddətdə sınaqdan keçirilir ?**

СНИП 3.05.02-88 əsasən İctimai və yaşayış binalarının aşağı təzyiqli daxili qaz xətləri kipliyə 0,05 atm təzyiq altında 5 dəq. müddətində sınaqdan keçirilməlidir.

**19. İctimai və yaşayış binalarının aşağı təzyiqli daxili qaz xətləri möhkəmliyə hansı təzyiqdə və müddətdə sınaqdan keçirilir ?**

СНИП 3.05.02-88 əsasən İctimai və yaşayış binalarının aşağı təzyiqli daxili qaz xətləri möhkəmliyə 1,0 atm təzyiq altında 1saat müddətində sınaqdan keçirilməlidir.

**20. Binaların daxilində qaz kəmərlərinə qoşulmalar necə aparılmalıdır?**

Qaz kəmərlərinin binaların və otaqların içərisində işçi təzyiq altında olan qaz kəmərlərinə qoşulması qəti qadağandır.

Bu zaman binaya (iş aparılan sahəyə) qazın verilməsi dayandırılmalı, istismarda olan boru kəməri sahəsi qazdan azad edildikdən və hava ilə üfürüldükdən sonra qoşulma işlərini yerinə yetirmək mümkündür.

Qaz kəmərlərinin hava ilə üfürülməsi "Qaz təsərrüfatında texniki təhlükəsizlik qaydaları"na əsasən yerinə yetirilməlidir.

**21. Qaz təchizatı obyektlərinin istismara buraxılması necə həyata keçirilir?**

Qaz təchizatı obyektlərinin istismara buraxılması və qazın verilməsi təsdiq edilmiş qəbul aktına və Dövlət Qaz Nəzarəti İdarəsindən alınmış xüsusi icazəyə əsasən, bir qayda olaraq, müvafiq əmrlə həyata keçirilir.

**22. Qaz-hava qarışığı çıxarılan otaqlarda hansı təhlükəsizlik tələblərinə riayət olunmalıdr ?**

Qaz avadanlıqlarından qaz-hava qarışığı çıxarılan otaqlarda (yerlərdə), açıq oddan və elektrik cihazlarından istifadə etmək qəti qadağandır.

**23. Qazlaşdırılmış obyektlərin istismara qəbul ediməsi barədə komissiya üzvlərinə və FHN-nin SİTGDMN Agentliyinə ən azı neçə gün əvvəl məlumat verilir ?**

Qazlaşdırılmış obyektlərin istismara qəbul ediməsi barədə ən azı komissiya üzvlərinə 2 gün və FHN-nin SİTGDMN Agentliyinə isə 5 gün əvvəl məlumat verilməlidir.

**24. Mənzillərdə istifadə edilən məişət qaz cihazlarının təhlükəsiz istismar olunmasına kimlər cavabdehdir ?**

Azərbaycan Respublikası Nazirlər Kabinetinin 12.05.2011-ci il tarixli 80 №-li qərarı ilə təsdiq edilmiş "Qazdan istifadə Qaydaları"əsasən

mənzillərdə istifadə edilən məişət qaz cihazlarının təhlükəsiz istismar olunmasına mənzil sahibləri cavabdehdirlər.

**25. Qaz avadanlıqlarının keyfiyyətli xidmətinə, təmirinə və təhlükəsiz istismarına kimlər cavabdehdir ?**

Qaz avadanlıqlarının keyfiyyətli xidmətinə, təmirinə və təhlükəsiz istismarına Qaz istismar sahəsi cavabdehdir**.**

**26. Yaşayış evlərində qaz plitələrinin qoyulması üçün hansı texniki tələblər ödənilməlidir?**

Yaşayış evlərində qaz plitələrinin qoyulması nəfəslik pəncərəsi, sorucu ventilyasiya kanalı və təbii işıqlandırması olan, hündürlüyü 2.2 metrdən az olmayan mətbəx otaqlarında nəzərdə tutulmalıdır. Bu halda mətbəx otaqlarının həcmi aşağıda göstərilənlərdən az olmamalıdır:

- İki odluqlu qaz plitələri üçün - 8 $m^3$;
- Üç odluqlu qaz plitələri üçün - 12 $m^3$;
- Dörd odluqlu qaz plitələri üçün - 15 $m^3$.

**27. Məişət qaz cihazlarının qarşısında qazın təzyiqi nə qədər saxlanıla bilər?**

Məişət qaz cihazlarının qarşısında qazın təzyiqi 0,03 atm-dən (300 mm su sütunundan) artıq olmamaqla, cihazların pasport göstəricilərinə uyğun olaraq qəbul edilməlidir.

**28. Yaşayış evlərinində təbii qazla işləyən su qızdırıcılarının quraşdırılması üçün hansı texniki tələblər ödənilməlidir?**

Təbii qazla işləyən su qızdırıcıları qoyulan mətbəxlərdə və ya otaqlarda ventilyasiya kanalları olmalıdır. Havanın daxil olması üçün (nəzərə almaq lazımdır ki, 1 $m^3$ metan qazın odluqda tam yanması üçün 9.5 $m^3$ hava tələb olunur) bitişik otaqlara çıxan divarın və ya qapının aşağı hissəsində barmaqlıq və ya qapı ilə döşəmə arasında boşluq en kəsiyi 0.02 $m^2$-dan az olmyan ara nəzərdə tutulmalıdır.

**29. Qaz kəməri ilə razetka və elektrik açarları arasında məsafə ən azı nə qədər olmalıdır?**

Qaz kəməri ilə razetka və elektrik açarları arasında məsafə 0.5 metrdən az olmamalıdır.

**30. Hansı binaların vanna otaqlarında təbii qazla işləyən su qızdırıcılarının quraşdırılmasına icazə verilmir?**

İsti su ilə təchiz edilən mehmanxanaların. sanatoriyaların, istirahət evlərinin vanna otaqlarında, həmçinin isti su ilə təchiz edilən yaşayış otaqlarında təbii qazla işləyən su qızdırıcılarının quraşdırılmasına icazə verilmir.

**31. Qaz cihazları tüstü bacalarına hansı borularla birləşdirilməlidir və birləşdirici borulardan biri digərinin içərisinə nə qədər daxil olmalıdır?**

Qaz cihazları tüstü bacalarına metal borularla birləşdirilməlidir. Birləşdirici borular tüstü bacasına kip birləşdirilməlidir. Birləşdirici qollar biri digərinə diametrinin 0,5 hissəsi qədər daxil olmalıdır.

**32. Uşaq bağçalarının yataq və qrup otaqlarının altında qaz cihazlarının quraşdırılmasına icazə verilirmi ?**

Uşaq bağçalarının yataq və qrup otaqlarının altında qaz cihazlarının quraşdırılmasına icazə verilmir.

**33. Qazla işləyən sobaların odluq hissəsinin qarşısında ən azı nə qədər keçid məsafəsi olur ?**

Qazla işləyən sobaların odluq hissəsinin qarşısında ən azı 1 m. keçid məsafəsi olur.

**34. Yaşayış binalarında qaz xətləri hansı borularla çəkilir** ?

Yaşayış binalarında qaz xətləri yalnız metal borularla çəkilməlidir.

**35. Yaşayış binalarında və fərdi yaşayış evlərinin daxili qaz xətlərində və dik orularında tıxac qoymaq olarmı ?**

Yaşayış binalarında və fərdi yaşayış evlərinin daxili qaz xətlərində və dikborularında tıxac qoymaq olmaz.

**36. Binalarda qaz dayaqlarının harada çəkilməsinə yol verilmir?**

Binalarda qaz dayaqlarının yaşayış otaqlarından və sanitar qovşaqlarından çəkilməsinə yol verilmir.

**37. Hündürlüyü 10 mərtəbəyə (daxil olmaqla) qədər olan yaşayış binalarında qaz kəməri dayaqlarının çəkilməsi necə aparıla bilər?**

Hündürlüyü 10 mərtəbəyə (daxil olmaqla) qədər olan yaşayış binalarında qaz kəməri dayaqları binanın daxili (yaşayış otaqlarından və sanitar qovşaqları istisna olmaqla) və ya binanın fasadı ilə aparıla bilər.

**38. Hündürlüyü 10 mərtəbədən yuxarı olan yaşayış binalarında qaz kəməri dayaqlarının çəkilməsi necə aparıla bilər?**

Hündürlüyü 10 mərtəbədən yuxarı olan yaşayış binalarında qaz kəməri dayaqlarının çəkilməsi binanın fasadı ilə aparılmalıdır.

**39. Axımlı su qızdırıcıları yanmayan divarda quraşdırıldıqda divarla su qızdırıcısı arasında minimal məsafə nə qədərdir ?**

Axımlı su qızdırıcıları yanmayan divarda quraşdırıldıqda divarla su qızdırıcısı arasında minimal məsafə ən azı 2 sm. olmalıdır.

**40. Axımlı su qızdırıcıları çətin yanan divarda quraşdırıldıqda divarla su qızdırıcısı arasında minimal məsafə nə qədərdir ?**

Axımlı su qızdırıcıları çətin yanan divarda quraşdırıldıqda divarla su qızdırıcısı arasında minimal məsafə ən azı 3 sm olmalıdır.

**41. Tutumlu su qızdırıcıları yanmayan divardan hansı minimal məsafədə quraşdırılır ?**

Tutumlu su qızdırıcıları yanmayan divardan ən azı 15 sm aralı quraşdırımalıdır.

**42. Qaz ilə işləyən su qızdırıcıları quraşdırılmış vanna otaqlarında qapı ilə döşəmə arasındakı boşluğun sahəsi nə qədərdir ?**

Qaz ilə işləyən su qızdırıcıları quraşdırılmış vanna otaqlarında qapı ilə döşəmə arasındakı boşluğun sahəsi ən azı 0,02 $m^2$ olmalıdır.

**43. Aşağı təzyiqli qaz xətlərinin başqa qayda ilə çəkilməsi mümkün olmadıqda yaşayış otaqları ilə çəkilə bilərmi ?**

Yaşayış otaqlarından tranzit şəkildə yivli birləşmə və armatur qoyulmadan metal borularla qaz kəmərinin çəkilməsinə icazə verilir.

**44. Yanma məhsullarının kənarlasdırılması üçün tüstü bacalarına olan tələblər hansılardır?**

Konstruksiyalarında yanma məhsullarının kənar edilməsi tüstü bacaları nəzərdə tutulan qaz cihazlarından, sobalarından və digər qaz avadanlıqlarından yanma məhsullarının kənarlaşdırılması

hər cihazdan, aqreqatdan və ya sobadan ayrılmış xüsüsi tüstu bacası ilə nəzərdə tutulmalıdır.

Mövcud binalarda yanma məhsullarının bacaya girişləri müxtəlif səviyyələrdə olmaq şərti ilə bir bacaya ikidən artıq olmamaqla binanın eyni və ya muxtəlif mərtəbələrində yerləşdirilmiş suqızdırıcıları və ya istilik sobalarının birləşdirilməsinin nəzərdə tutulmasına yol verilir. Bu halda

bacaya girişlər biri-digərindən 0,75m-dən yaxın olmamalıdır və ya bacada 0,75m-dən az olmayan hündürlükdə eyni səviyyədə bölünmələr düzəldilməlidir.
Mövcud binalarda bacalar olmadıqda əlavə (yana qoyulan) bacaların nəzərdə tutulmasına yol verilir.

**45. Tüstü bacasının en kəsiyi minimum nə qədər olmalıdır?**

Ona birləşdirilən qaz cihazının borusunun (yanma məhsullarının atılması üçün) en kəsiyinin sahəsindən az olmamalıdır.

**46. Ventilyasiya kanalları hansı müddətdən bir təmizlənməlidir ?**

Azərbaycan Respublikası Nazirlər Kabinetinin 12.05.2011-ci il tarixli 80 № - li qərarı ilə təsdiq edilmiş "Qazdan istifadə Qaydaları"na əsasən Tüstü bacalarının, havalandırma və havadəyişmə xətlərinin və tüstü bacalarının girişlərinin vəziyyətinin vaxtlı-vaxtında, xüsusilə qış aylarında mütəmadi olaraq yoxlanılmasını və ildə bir dəfədən az olmayaraq təmizlənməsini təmin etməli və görülmüş işləri müvafiq qaydada sənədləşdirməli;

**47. Cihazlardan və sobalardan tüstü bacasına çəkilən birləşdirici borularda döngələrin sayı ən çox nə qədər ola bilər ?**

Cihazlardan və sobalardan tüstü bacasına çəkilən birləşdirici borularda döngələrin sayı 3 ədəddən artıq olmasına icazə verilmir.

**48. Komissiya tərəfindən qəbul edilmiş obyekt hansı müddət ərzində istismara qəbul edilmədikdə yenidən kipliyə yoxlanılır ?**

Komissiya tərəfindən qəbul edilmiş obyekt 6 ay müddətinə istismara qəbul edilmədikdə yenidən kipliyə yoxlanılmalıdır .

**49. Sənaye, kənd təsərrüfatı və kommunal müəssisələrinin qaz avadanlıqlarına hansı müddətdən bir texniki xidmət göstərilir ?**

Sənaye, kənd təsərrüfatı və kommunal müəssisələrin qaz avadanlıqlarına ayda bir dəfən gec olmamaqla texniki xidmət göstərilməlidir.

**50. İctimai təyinatlı və əhaliyə məişət xidməti müəssisələrindəki, habelə yaşayış evlərinin qaz kəmərlərinin hava ilə üfürülərək nəzarət üçün yoxlanılması hansı müddətdə və təzyiq altında aparılır və təzyiq düşməsi nə qədər ola bilər?**

İctimai təyinatlı və əhaliyə məişət xidməti müəssisələrindəki, habelə yaşayış evlərinin qaz kəmərlərinin hava ilə üfürülərək nəzarət üçün

yoxlanılması 5 dəqiqə müddətində və 05 atm təzyiq altında aparılır və təzyiq düşməsi 20 mm su süt.ola bilər.

**51. Sənaye, kənd təsərrüfatı və kommunal müəssisələrində qızdırıcı qazanların daxili qaz kəmərləri hava ilə üfürülərək nəzarət üçün yoxlanılması hansı müddətdə və təzyiq altında aparılır və təzyiq düşməsi nə qədər ola bilər ?**

Sənaye, kənd təsərrüfatı və kommunal müəssisələrində qızdırıcı qazanların daxili qaz kəmərləri hava ilə üfürülərək nəzarət üçün yoxlanılması 1saat müddətdə və 0,1 atm, təzyiq altında aparılır və təzyiq düşməsi 60 mm su süt-na qədər ola bilər.

**52. Məişət (diafraqmalı) qaz sayğaclarının maksimal işçi təzyiqi nə qədərdir ?**

Məişət (diafraqmalı) qaz sayğaclarının maksimal işçi təzyiqi 0,05atm-ə (5000 mm su süt) qədərdir.

**53. Qeyri standart qaz cihazlarının qarşısında neçə bağlayıcı kran (ventil) quraşdırılmalıdır?**

Qeyri standart qaz cihazlarının qarşısında 2 ədəd bağlayıcı kran (ventil) quraşdırılmalıdır

**54. Tüstü bacalarının və ventilyasiya kanallarının saz vəziyyətdə saxlanılmasına kimlər cavabdehdir ?**

Azərbaycan Respublikası Nazirlər Kabinetinin 12.05.2011-ci il tarixli 80 №-li qərarı ilə təsdiq edilmiş "Qazdan istifadə Qaydaları"na əsasən ildə bir dəfədən az olmayaraq tüstü və havadəyişmə xətlərinin növbəti yoxlamalarını və təmizləmələrini aparmadan qazdan istifadə etmək qadağandır. Qaz Təsərrüfatında Təhlükəsizlik qaydalarına əsasən tüstü bacalarının və ventilyasiya kanallarının saz vəziyyətinə binaların sahibləri cavabdehdir.

**55. Qaz yanacağı ilə işləyən qazan aqreqatlarında və onlardan çıxan tüstü bacalarında partlayıcı klapanlar harda və necə nəzərdə tutulmalıdır?**

Qaz yanacağı ilə işləyən qazan aqreqatlarında və onlardan çıxan tüstü bacalarında partlayıcı klapanlar nəzərdə tutulmalıdır.

Buxarın təzyiqi 0,07 MPa-dan (0,7 kqq/sm$^2$-dən) yuxarı olan buxar qazanlarında və suyun temperaturu 115$^0$ S-dən yuxarı olan suqızdırıcı

qazanlarda partlayıcı klapanların qoyulması buxar və suqızdırıcı qazanların quruluşunu və təhlukəsiz istismarını tənzimləyən qaydalara uyğun olaraq nəzərdə tutulmalıdır.

Buxarın təzyiqi 0,07 MPa-dan (0,7 kqq/sm2-dən) artıq olmayan buxar qazanları və suyun temperaturu $115^0$S-dən artıq olmayan suqızdırıcı qazanları üçün, həmçinin qazan aqreqatlarının tüstü bacaları üçün partlayıcı klapanların sayı, onların yerləşdirilməsi və ölçüləri layihə təşkilatı tərəfindən təyin edilməlidir.

Tüstü qazı bir tərəfə hərəkət edən qazanların kərpic hörgülərində (obmurovkalarında), şaquli slindrik qazanlar, paravoz tipli və lokomobillərin qazanları üçün, həmçinin tüstü bacalarında tüstü sorucularından qabaqda partlayıcı-qoruyucu klapanların nəzərdə tutulmamasına yol verilir.

**56. Dəm qazı hansı halda yaranır ?**

Kimyəvi adı karbon-monooksid (CO) olan dəm qazı təmiz halda gözə görünməyən, rəngsiz, iysiz, dadsız, havadan yüngül, suda pis həll olunan qazdır. Bu qaz üzvi maddələrin, o cümlədən təbii qazın, neft məhsullarının və odun yanacağının natamam yanması nəticəsində əmələ gəlir.

Dəm qazı natamam yanma məhsulu olub güclü zəhərləyici xassəyə malikdir. İnsanlar yüksək konsentrasiyalı dəm qazı olan mühitdə çox qaldıqda zəhərlənmə daha güclü, ölüm isə bir o qədər sürətli olur. Havada dəm qazının miqdarı 0,08% olduqda başağrısı, başgicəllənmə və boğulma başlayır. Dəm qazının miqdarı nəfəs aldığımız havada 0,32% olduqda 30 dəqiqə ərzində, 1,2% olduqda isə 2-3 dəqiqə ərzində (2-3 nəfəs almadan sonra) ölüm baş verir.

## IV FƏSİL
## QƏZALARIN LƏĞVİ, MƏHDUDLAŞDIRILMASI VƏ QAZ TƏHLÜKƏLİ İŞLƏR HAQQINDA

**1. Qəzaların ləğvi üzrə ilkin tədbirlər hansılardır?**

- zədələnmiş qaz kəməri sahəsinin istismarda olan qaz kəmərindən açılması;
- təbii qazla qazlaşmiş (qaz toplanmış) otaqların havasının dəyişdirilməsi və mayeləşdirilmiş qaz toplanmış otaqların, partlayış təhlükəsi istisna olunan üsulla məcburi ventilyasiyası;
- siqaret (papiros) çəkilməsi, kibrit yandırılması, elektrik lampasının və elektrik cihazlarının qoşulması və açılması, açıq odla istilik cihazlarından, peçlərdən, ağ neft plitələrindən istifadə edilməsi və sair bu kimi halların qadağan edilməsi;
- otağa (binaya) açıq odla daxil olmamaq üçün binanın girişində xəbərdarlıq yazısı olmalıdır;
- lazım olan hallarda qaz toplanmış otaqlardan sakinlərin köçürülməsi.

**2. Qəza məlumatlarının qəbulu necə aparılmalıdır?**

Qəza məlumatlarının qəbulu qəza-dispetçer xidməti tərəfindən bütün gün ərzində aparılmalı və xüsusi nömrələnmiş və möhürlənmiş jurnalda vaxt göstərilməklə qeyd olunmalıdır.

Qaz təsərrüfatında baş verən qəzalar, qaz sızmaları və qaz kəmərlərinin, armaturların, qaz cihazlarının nasazlıqları haqqında məlumatları Qaz təchizatı müəssisələrinə xəbər vermək üçün qəza-dispetçer xidmətinin telefon nömrələri, əhaliyə və digər istehlakçılara çatdırılması təmin edilməlidir.

**3. Qəza vəziyyətlərinin məhdudlaşdırılması və ləğvi üzrə işlər hansı sənəd əsasında həyata keçirilir?**

Qəza vəziyyətlərinin məhdudlaşdırılması və ləğvi üzrə işlər qəzaların aradan qaldırılması və məhdudlaşdırılması planı ilə müəyyənləşdirilməli və əlaqəli idarələrin (yanğın mühafizəsi, təcili yardım, polis, kabel xətlərinin istismarı ilə məşğul olan təşkilatlar, su-kanalizasiya xidməti) qarşılıqlı köməyi ilə yerli şəraitdən asılı olaraq, qaz təsərrüfatı

müəssisəsinin təsdiq etdiyi, nümunəvi plan əsasında hər bir xidmət tərəfindən işlənib hazırlanmalı və yerli aidiyyəti orqanlarla razılaşdırılmalıdır.

4. **Qəza vəziyyətinin qarşısının alınması və onun məhdudlaşdırılması planına nələr daxildir?**
   - qəza vəziyyətlərinin xəbərdarlığı və məhdudlaşdırılması tədbirləri;
   - insanların və qiymətli malların xilas edilməsi tədbirləri;
   - tədbirlərin yerinə yetirilmə qaydaları.

5. **Təmir-bərpa işləri necə təşkil edilir?**

Təmir-bərpa işləri Qaz təchizatı müəssisəsinin rəhbərliyi tərəfindən imzalanmış sərəncama əsasən, istismar işçiləri tərəfindən yerinə yetirilir. Həmin işlərin icrası üçün icazə-buraxılış tərtib olunmalı və qəza xidməti ilə razılaşdırılmalıdır.

6. **Qəza haqqında məlumatı qəbul etmiş növbətçi dispetçeri nə etməlidir?**

Qəza haqqında məlumatı qəbul etmiş növbətçi dispetçeri, qəza xidməti gələnə qədər təhlükəsizliyi təmin etmək məqsədilə, xəbər verən şəxsi məlumatlandırmalı və təcili qəza briqadasını obyektə göndərməlidir.

Daxil olmuş məlumatlar və bildirişlər dərhal qəza məlumatları kitabinda qeyd olunmalıdır: kitabda məlumatın qeyd olunma vaxtı (tarix, saat və dəqiqə), zədələnmənin xarakteri (məlumat verənin sözlərinə əsasən), qəza yerinə briqadanın çıxma və çatma vaxtı, yerinə yetirilmiş işlər haqqında məlumatlar, işlərin qurtarması və briqadanın geriyə qayıtma vaxtları qeyd olunmalıdır.

Qəzaların ləğv edilməsi üçün göndərilən işçilərə, xüsusi blanklarda kartoçkalar (sifarişlər) açılır və həmin kartoçkada qəza haqqında məlumat verənin imzası ilə qəzaların aradan qaldırılması təsdiq edilir. Qəza briqadası çağırışda olduqda, sifarişlər telefonla verilə bilər.

7. **Qəza xidməti briqadası qəza yerinə hansı müddət ərzində çıxmalıdır?**

Qəza xidməti briqadası qəza yerinə, partlayış, yanğın, otaqlara qaz toplanması barədə xəbər verildikdən sonra 5 dəqiqədən gec olmayaraq çıxmalıdır. Bu halda qəza xidməti maşınından, xüsusi hallarda qəza xidməti maşını olmazsa başqa imkanlardan istifadə edilməlidir.

8. **Mənzildə və ya pilləkan qəfəsində qaz iyi gəlir çağırışı zamanı nə edilməlidir?**

Mənzildə və ya pilləkən qəfəsində "qaz iyi gəlir" qəza çağırışına gələn qəza briqadası, məlumat verənin göstərdiyi yerlərdə, eləcə də ona qonşu yerlərdə zirzəmilərdə havanın tərkibində qazın olmasını yoxlamalı, aşkar olunmuş çatışmazlıqları ləğv etməlidir.

Otaqlarda qaz sızması ləğv edildikdən və otağın havası dəyişdirildikdən sonra, təkrarən otaqda, qonşu binaların otaqlarında və zirzəmilərində qazın mövcudluğu yoxlanılmalıdır.

"Qaz iyi gəlir" qəza çağırışı ilə göstərilən otaqlarda qazın olması aşkar edilmədikdə, pilləkən qəfəsində və binanın zirzəmisində qazın mövcudluğu yoxlanılmalıdır.

Yoxlamaq üçün hava nümunəsi təbii qaz üçün yuxarı zonadan, mayeləşdirilmiş qazlar üçün isə aşağı zonadan (döşəmədən 30 cm-dən artıq olmayan hündürlükdən) götürülməlidir.

9. **Qaz sızmasının yeraltı qaz kəmərindən olması məlum olarsa hansı tədbirlər görülməlidir?**

Qaz otağa yeraltı qaz kəmərindən (qazpaylayıcı kəmərdən və ya qaz girişindən) keçdikdə, qazın sızmasını aşkar etmək üçün qəza briqadası, sızma yerindən 50 metr radiusunda yerləşən bütün qonşu yeraltı qurğularını və binaları (ilk növbədə zirzəmiləri) müayinədən keçirməlidir.

Qaz kəmərinin zədəli yerlərinin müəyyənləşdirilməsi qəzanın qarşısının alınması və məhdudlaşdırılması planı ilə aparılmalıdır.

Qaz toplanmış otaqlarda, eləcə də 50 metr radiusunda yerləşən binalarda və yeraltı qurğularda qazın mövcudluğu qəza vəziyyəti ləğv olunan bütün müddət ərzində müvafiq cihazla vaxtaşırı yoxlanılmalıdır.

10. **Qəza yerinə gələn rəhbər işçi, qəzanın aradan qaldırılmasına rəhbərlik edənin düzgün göstəriş vermədiyini hiss etdikdə hansı qərarı qəbul etməlidir?**

Qəza yerinə gələn rəhbər işçi, qəzanın aradan qaldırılmasına rəhbərlik edənin düzgün göstəriş vermədiyini hiss etdikdə, qəzaya rəhbərlik edəni bu işdən kənarlaşdırmalı və qəzanın tam məhdudlaşdırılması və ləğvi ilə əlaqədar olan bütün işlərə özü və ya onun göstərişi ilə digər məsul şəxs rəhbərlik etməlidir.

Qəza vəziyyətini ləğv etmək üçün qəza yerinə gələn təmir-bərpa xidmətinin növbətçi heyətinin rəhbəri ondan əvvəlki növbə rəhbəri tərəfindən qəzanın vəziyyəti və onun ləğv edilməsi üzrə qəbul edilmiş tədbirlər haqqında məlumatlandırılmalıdır.

**11. Qəza vəziyyətinin ləğvi üzrə işlər nə zaman başa çatmış hesab oluna bilər?**

Qəza vəziyyətinin ləğvi üzrə işlər o zaman başa çatmış hesab oluna bilər ki, qaz sızmaları aşkar edilib aradan qaldırılır və qazın otaqlara, qurğulara keçə bilməsi ehtimalı istisna olunur.

**12. Qəza xidmətinə keçən ay ərzində daxil olmuş sifarişlər barəsində hansı tədbirlər görülməlidir?**

Qaz təchizatı müəssisəsinin qəza, təmir-bərpa xidməti keçən ay ərzində daxil olan bütün qəza sifarişlərini (məlumatlarını) müntəzəm olaraq əsaslı surətdə təhlil etməli, qaz kəmərlərində, armatur və avadanlıqlarda baş verən bütün nasazlıqların, eləcə də qəza və bədbəxt hadisələrin səbəblərini araşdırmalıdır. Qəza vəziyyətlərinin aradan qaldırılması üzrə əldə olunmuş təcrübəni ümumiləşdirməli və bunun əsasında qəzaların məhdudlaşdırılması və ləğvi planında düzəlişlər aparmalı, eləcə də qaz təchizatı sistemlərinin təkmilləşdirilməsi və qəza vəziyyətləri əmələ gətirə bilən səbəblərin aradan qaldırılması üzrə tədbirlər işləyib hazırlamalıdır.

**13. Qəza, təmir-bərpa heyəti ilə tədris-təlim məşğələləri necə aparılmalıdır?**

Qəza, təmir-bərpa heyəti ilə tədris-təlim məşğələləri (dərsləri) Qaz təchizatı müəssisəsinin baş mühəndisi tərəfindən müntəzəm olaraq təsdiq olunmuş proqram və qrafik üzrə keçirilməlidir.

Bu məşğələlərin (dərslərin) təyin olunmuş vaxtlarda keçirilməsinə nəzarət, müəssisənin rəhbəri tərəfindən aparılmalıdır.

**14. Qaz təhlükəli işlərin görülməsinə kimlər buraxılır ?**

18 yaşından yuxarı, xüsusi təlim keçmiş, qaz təhlükəli işlərin aparılması texnologiyasını öyrənərək imtahan verən, mühafizə vasitələrindən istifadə etməyi və həkimə qədər ilk tibbi yardım göstərmək qaydalarını bilən işçilər buraxılır.

**15. Qaz təhlükəli işlər nəyə deyilir ?**

Qazlı mühitdə və ya qazın ətrafa yayılma ehtimalı olan şəraitdə görülən işlərə qaz təhlükəli işlər deyilir.

**16. Qaz təhlükəli işlər üçün “icazə-tapşırıq”ların verilməsi kimlərə həvalə olunur ?**

“Qaz təsərrüfatında təhlükəsizlik qaydaları”nın tələblərinə uyğun olaraq imtahan vermiş və müəssisə rəhbərinin əmri ilə təyin edilmiş şəxslər qaz təhlükəli işlər üçün icazə-tapşırıqlar verə bilər.

**17. Qaz təhlükəli işlər bir qayda olaraq ən azı neçə nəfər tərəfindən icra olunur ?**

Qaz təhlükəli işlərin yerinə yetirilməsi ən azı 2 nəfər tərəfindən yerinə yetirilməlidir.

**18. Qaz təhlükəli işlərin yerinə yetirilməsi zamanı işə cəlb olunmuş işçilərə kim göstəriş verə bilər ?**

Qaz təhlükəli işlərin yerinə yetirilməsi zamanı işə cəlb olunmuş işçilərə yalnız işin rəhbəri tərəfindən göstəriş verilə bilər.

**19. Rəhbər və vəzifəli şəxslər qaz təhlükəli işləri yerinə yetirən fəhlələrə göstərişi kimin vasitəsi ilə verə bilər ?**

Rəhbər və vəzifəli şəxslər qaz təhlükəli işləri yerinə yetirən fəhlələrə göstərişi yalnız işə məsul şəxs vasitəsilə verə bilərlər.

**20. Qaz təhlükəli işləri “icazə-tapşırıq” olmadan aparmaq olarmı ?**

Sabit tərkibli işçilərlə eyni şəraitdə yerinə yetirilən və dövri təkrar olunan qaz təhlükəli işlər tapşırıq-icazə sənədi tərtib edilmədən aparıla bilər. Bu işlər təsdiq edilmiş müvafiq təlimat üzrə aparılır. Müəssisələrdə baş mühəndis tərəfindən təhlükəli işlərin siyahısı hazırlanır və təsdiq edilir. Bu siyahıda tapşırıq-icazə sənədi tərtib edilmədən yerinə yetirilə bilən işlər göstərilir.

**21. “İcazə-tapşırıq”larda əsasən nələr qeyd edilir ?**

İcazə-tapşırıqlarda əsasən aşağıdakılar qeyd edilir:

Müəssisənin adı, tapşırıq almış şəxsin vəzifəsi, soyadı, adı, atasının adı, işin yeri və xüsusiyyəti, briqadanın tərkibi, işin başlanma və qurtarma tarixi və vaxti, işin aparılmasında əsas əməliyyatların texnoloji ardıcıllığı, əsas təhlükəsizlik tədbirləri və rəhbər təlimatlar, briqadada olan əsas FMV, təmirdən qabaq qaz tərkibinin təhlili nəticələri, tapşırıq-icazə verən şəxsin

imzası, tapşırıq alan şəxsin vəzifəsi və imzas, briqada tərkibinin təlimatlandırılması və işlərin qurtarması üzrə işin rəhbərinin qərarı

**22. Qaz təhlükəli işlərdə hansı alətlərdən istifadə olunmalıdır?**

Qaz olan yerlərdə işləyən zaman qığılcım yaranmasına imkan verməyən əlvan metalldan hazırlanmış çəkic və kürə işlədilməlidir. Qara metaldan olan alətlərin və başqa vasitələrin işlək hissəsinə qalın qatla solidol, yaxud başqa texniki yağlar çəkilməlidir. Qaz olan yerlərdə qığılcım verə bilən elektrik qurğusundan və başqa elektrik alətləindən istifadə edilməsi qadağandır.

**23. Quyularda və çənlərdə qaz təhlükəli işləri görən işçilər hansı ayaqqabılardan istifadə etməlidir?**

Quylarda, çənlərdə və bu kimi yerlərdə işləyən işçilər qaztəhlükəli işlər görərkən dəmir nalı və mıxları olmayan ayaqqabılardan istifadə etməlidirlər. Əks halda ayaqqabılar üzərinə qaloş geyinilməlidir.

**24. Qaz təhlükəli işlərin yerinə yetirilməsi üçün tərtib edilmiş "icazə-tapşırıq"lar və onların qeydiyyatının aparıldığı jurnal neçə il saxlanılır ?**

Qaz təhlükəli işlərin yerinə yetirilməsi üçün tərtib edilmiş "icazə-tapşırıq"lar 1 il və onların qeydiyyatının aparıldığı jurnalı isə 5 il saxlanılmalıdır.

**25. Hansı qaz təhlükəli işlər mühəndis-texniki işçinin bilavasitə rəhbərliyi olmadan aparıla bilər?**

Ayrı-ayrı məişət qaz cihazlarının birləşdirilməsi, qaz balonlu qurğuların istismara verilməsi, diametri 32 mm-dən artıq olmayan alçaq təzyiqli qaz kəmərlərində qaynaq və qaz ilə kəsmə tətbiq etmədən təmir işlərinin aparılması, quyuların nəzərdən keçirilməsi və havanın dəyişdirilməsi, kondensat yığan tutumlardan kondensatın nasosla sorulub çıxarılması, həmçinin də istismar olunan qaz cihazlarına və daxili qaz avadanlıqlarına xidmət edilməsi ilə bağlı qaz təhlükəli işlər mühəndis-texniki işçinin rəhbərliyi olmadan aparıla bilər. Bu halda işlərə rəhbərliyi həmin işlərin görülməsi üçün ayrılmış fəhlələrdən daha ixtisaslı olanına tapşırılmasına yol verilir.

**26. Hansı qaz təhlükəli işlər iş planı əsasında aparılmalıdır?**

Qazlaşdırılan şəhərlərin, qəsəbələrin və kənd yaşayış məntəqələrinin qaz şəbəkələrinin istismara buraxılması və qazın verilməsi, təzyiqi 6 $kqq/sm^2$ (0.6Mpa)-dan artıq olan qaz kəmərinə qazın verilməsi, yüksək və orta təzyiqli qaz kəmərinə “qaz altında” birləşdirmə üzrə işlər, QPM və QPS-lərdə qaynaq və qazla kəsmə tətbiq etməklə aparılan işlər, qaynaq və qazla kəsmə tətbiq etməklə orta və yüksək təzyiqli qaz kəmərlərində “qaz altında” aparılan təmir işləri orta və yüksək təzyiqli qaz kəmərlərində istehlakçının qaz kəmərindən açılması ilə əlaqədar qazın təzyiqinin azaldılması və yenidən qaldırılması, ümumilikdə müəssisəyə veilən qazın açılması və sonradan yenə verilməsi işləri tapşırıq üzrə və qaz təsərrüfatı müəssisəsinin baş mühəndisi tərəfindən təsdiq edilmiş xüsusi plana uyğun, həmin işləri müəssisə öz qüvvəsi ilə apardıqda isə həmin müssisənin baş mühəndisi tərəfindən təsdiq edilmiş xüsüusi plana uyğun aparılır.

**27. Qaz təhlükəli işləri icrası barədə tərtib olunmuş planda nələr qeyd olunmalıdır?**

İş planında işlərin aparılmasının dəqiq ardıcıllığı işçilərin yerləşdirilməsi, mexanizmlərə və vasitələrə tələbat göstərilir, həmin işlərin maksimum təhlükəsiz aparılmasını təmin edən tədbirlər nəzərdə tutulur.

İş planında həmçinin qaz təhlükəli hər bir işin aparılmasına cavabdeh olan şəxslər, ümumi rəhbərlik edən və işlərin yerinə yetirilməsi ardıcıllığını təyin edən və bu işlərin əlaqələndirilməsinə cavabdeh olan şəxs də göstərilməlidir.

Plana uyğun olaraq bu qaz təhlükəli işin aparılmasına cavabdeh olan şəxsə ayrıca tapşırıq verilməli, həmin tapşırıqda işləri yerinə yetirən zaman əsas təhlükəsizlik tədbirləri və işin texnoloji ardıcıllığı göstərilməlidir.

**28. Qaz təhlükəli işlərin icrası barədə tərtib olunmuş plana hansı sənədlər əlavə olunmalıdır?**

İş planına və tapşırığa işlərin aparılması yeri və xüsussiyyətləri göstərilməklə, icra certyoju və ya onun əksi əlavə edilir. Qaz təhlükəli işlərə başlamazdan əvvəl onların aparılmasına cavabdeh olan şəxs icra cizgisinin, yaxud onun surətinin işlərin aparılacağı yerdə obyektin faktiki yerləşməsinə uyğunluğunu yoxlamalıdır.

**29. Hansı hallarda qaz təhlükəli işlər icazə tapşırıqsız yerinə yetirilə bilər?**

Qəza ilə əlaqədar işlər bilavasitə insanların həyatına, maddi nemətlərə dəyə biləcək təhlükə aradan qaldırılana qədər tapşırıqsız aparılır. Təhlükə aradan qaldırıldıqdan sonra qaz kəmərlərinin və qaz avadanlıqlarının texniki saz vəziyyətə gətirilməsi üzrə işlər tapşırıq (sərəncam) üzrə aparılmalıdır.

**30. Ezamiyyətə gələn şəxslərə qaz təhlükəli işlərin aparılmasına dair tapşırıq hansı müddətə verilir?**

Ezamiyyətə gələn şəxslərə qaz təhlükəli işlərin aparılmasına dair tapşırıq (sərəncam) bütün ezamiyyət müddətinə verilməlidir. İşlərin icrasına nəzarəti onlara cavabdeh olan şəxs aparmalıdır.

**31. Tapşırıq üzrə yerinə yetirilən işlər bir gündən artıq müddətdə yerinə yetirilirsə, onların aparılmasına cavabdeh olan şəxs işin gedişi barədə kimə məlumat verməlidir?**

Tapşırıq (sərəncam) üzrə yerinə yetirilən qaz təhlükəli işlər bir gündən artıq müddətdə yerinə yetirilirsə, onların aparılmasına cavabdeh olan şəxs, işlərin gedişi barədə bu işlərin aparılmasına tapşırıq verən şəxsə hər gün məlumat verilməlidir.

**32. İstismar olunan qaz kəmərlərinə yeni qaz kəməri qoşulduqda və ya təmir edildikdə qazın təzyiqi nə qədər olmalıdır?**

İstismar olunan qaz kəmərlərinə yeni qaz kəməri qoşulduqda və ya təmir edildikdə qazla kəsmə və qaynaq işləri zamanı qazın təzyiqi 40 mm-dən 150 mm su sütunu intervalında olmalıdır. Həmin intervaldan kənarlaşma zamanı qaynaq işləri dayandırılmalıdır. İşlərin aparıldığı yerdə təzyiqə nəzarət olunması üçün manometr qoyulmalıdır.

## V FƏSİL
## QAYNAQ İŞLƏRİ HAQQINDA

1. **Qaynaq işinə başlamazdan əvvəl hansı təhlükəsizlik tədbirləri görülməlidir?**

Qaynaq aparatının və qaynaq edilən metalın yerlə birləşmələrinin kipliyi və kabellər yoxlanmalı, iş gedən ərazi yanan maddələrdən təmizlənməlidir.

2. **Qaynaqçı yeraltı qaz kəmərlərində damğanı qaynaq tikişindən hansı məsafədə vurmalıdır?**

Qaynaqçı ona verilmiş şifrəni yeraltı qaz kəmərinin qaynaq tikişindən 30÷50 mm məsafədə vurmalıdır. Bu şifr və ya nömrənin qoyulması metalı üst əritmə üsulu ilə damğa vurmaqla yaxud metalı zədələməyən başqa üsullarla aparıla bilər.

3. **Emalatxanalarda işləyən qaynaqçıların yerinə yetirdikləri işlərin keyfiyyəti hansı müddətdən bir yoxlanılır?**

Emalatxanalarda işləyən qaynaqçıların yerinə yetirdikləri qaz kəməri elementlərinin qaynaq edilməsi işlərinin keyfiyyəti hər ay qaynaq nümunələrinin mexaniki sınağı ilə təyin edilməlidir.

4. **Qaynaqçı üçün tərtib edilmiş formulyarlarda nələr qeyd edilməlidir?**

Qaynaq quraşdırma işləri aparan təşkilatda hər bir qaynaqçı üçün formulyar tərtib edilməlidir. Bu formulyarda qaynaqçının ixtisas dərəcəsi barədə məlumat, biliyinin dövri olaraq yoxlanılmasının yekunları, qaynaqçının qaynaq etdiyi sınaq birləşmələrinin, qaz kəməri xəttində qaynaq etdiyi birləşmələrin sınağının nəticələri və qaynaqçının işini xarekteriza edən digər məlumatlar göstərilmişdir.

5. **3 kq/sm$^2$-ə qədər təzyiqli qaz kəmərlərində qaynaq birləşmələrinin keyfiyyəti fiziki üsullarla yoxlanılması zamanı mənfi nəticələr əldə edilərsə hansı tədbirlər görülməlidir?**

3 kq/sm$^2$-ə qədər təzyiqli qaz kəmərlərində qaynaq birləşmələrinin keyfiyyəti fiziki üsullarla yoxlanılması zamanı mənfi nəticələr əldə edilərsə normadan 2 qat artıq birləşmələr yenidən yoxlanılmalıdır. Təkrar yoxlama zamanı nümunələrdən birində belə mənfi nəticə alınsa

qaynaqçının obyektdə apardığı bütün birləşmələr fiziki nəzarət üsulu ilə yoxlanılır və qaynaqçı işdən kənar edilir.

6. **Qaynaq aparılarkən hansı təhlükəsizlik tədbirlərinə diqqət yetirilməlidir?**

Qaynaq zamanı diqqət yetirilməlidir:

- Əlcəyin, ayaqqabının və paltarın daim quru olmasına;
- Qaynaq apararkən qövsün yanması zamanı genaratorun və ya transfarmotorun sıxaclarında gərginliyin sabit cərayan üçün 110v və dəyişən cərəyan üçün isə 70v-dan artıq olmamasına;
- Üzün və başın qorunması üçün istifadə edilən xüsusi şitdə və ya şlem –maskada olan şüşənin yararlı vəziyyətdə olmasına;
- Qaynaq şlakının yalnız qoruyucu eynək taxdıqdan sonra metal şotka ilə yoxlanılmasına;
- Metal ərintilərinin qığılcımlarından qorunmaq üçün qaynaq yerinin əvvəlcədən təmizlənməsinə;
- lazım olmadıqda elektrottutucunu (derjateli) cərəyan altında qalmamasına.

7. **Qaynaq işlərinə başlamazdan əvvəl qaynaqçı təhlükəsizliyin təmin edilməsi məqsədilə hansı işləri yerinə yetirməlidir?**

İşin aparılmasına mane olan əşyaları və tezalışan materilları iş yerindən kənarlaşdırmalı, qaynaq aqreqanı münasib yerdə yerləşdirməli, qaynaq aqreqatının, ölçü cihazlarının, fərdi mühafizə və qoruyucu vasitələrin işlək vəziyyətdə olmasını yoxlamalı, kontaktların möhkəmliyinə və naqillərin izolyasiyasının zədələnmədiyinə əmin olmalı, işıqlanmanın 150лк-dən aşağı olmadığına nəzər yetirməli və iş yerini yanğınsöndürmə vasitəsi ilə təmin etməlidir

8. **Qaz kəmərləri çəkilmiş və qazdan istifadə edən aqreqatlar olan binalarda quyularda qaynaq işləri zamanı hansı təhlükəsizlik tədbirləri görülməlidir?**

Qaz kəmərləri çəkilmiş və qazdan istifadə edən aqreqatlar olan binalarda quyularda, kollektorlarda və s. yerlərdə qaynaq işləri aparılmasına başlamazdan əvvəl qazın olması yoxlanılmalıdır. Havadakı qazın miqdarı aşağı partlayış həddinin 1/5-dən artıq olmamalıdır. Sınaq üçün nümunə pis ventilyasiya olunan yerdən götürülməlidir.

Qaynaq işlərinin aparıldığı bütün müddətdə binalar yaxşıca ventilyasiya olunmalıdır, quyular və kollektorlarda isə 1saatda havanı 3 dəfə dəyişdirə bilən ventilyator və kompressor vasitəsilə hava vurmaqla ventilyasiya olunmalıdır.

**9. Neçə növ qaynaq vəziyyətləri mövcuddur və hansılardır?**

3 cür qaynaq vəziyyəti mövcuddur:

- döşəmə
- tavan
- üfüqi.

**10. Qaynaq aqerqatı (sak) ilə qaynaq transformatorunun iş prinsipi necə fərqlənir?**

Qaynaq aqerqatı (sak) özü elektrik istehsal edir və onu tənzimləyərək qaynaqçıya verir. Qaynaq transformatoru isə elektriki şəbəkədən alır və tənzimləyərək qaynaqçıya verir.

**11. Neçə növ qaynaq şovu var və hansılardır?**

Qaynaq şovu üç növdür və aşağıdakılardır:

- kök
- dolğu
- üzlük.

**12. Qalın metallarda qaynaq şovu neçə növdür və hansılardır?**

Qalın metallarda dörd növ qaynaq şovu vardır:

- kök
- isti qaynaq
- dolğu
- üzlük.

**13. Qaynağın daxili qüsurları hansı nəzarət üsulu ilə müəyyən edilir?**

Rentgen şüası ilə.

**14. Qaynaq çubuğunu seçərkən hansı amillərə əsaslanmaq lazımdır?**

Qaynaq avadanlığının sabit və ya dəyişkən cərəyanla işləməsi, qaynaq çubuğunun metal hissəsinin kimyəvi tərkibinin qaynaq ediləcək metala uyğun olması, qaynaq çubuğunun örtüyünün qaynaq vəziyyətinə (bucağına) uyğun seçilməsi.

**15. Əl ilə qövşü qaynaqda neçə qat qaynaq tikişi qoyulmalıdır?**

Əl ilə qövsü qaynaqda 3 qat tikiş qoyulmalıdır.

**16. Qaynaq aparatı cərəyan mənbəyinə qoşulma və ayrılma ardıcıllığı necədir?**

Qaynaq aparatı elektrik cərəyanına qoşulan zaman ilk növbədə “0” (-)-a, sonra isə “Faza” (“+”)-ya qoşulmalıdır. Açıldıqda isə əksinə, yəni ilk növbədə “Faza” (“+”)-dan sonra isə “0” (“-“) -dan açılmalıdır.

**17. Tikişətrafı metalın yanmasına səbəb nədir?**

Tikişətrafı metalın yanmasına cərəyanin cox olması səbəb olur.

**18. Tərpənməyən boru kəməri vəziyyətinə görə necə cür tikiş ilə qaynaq edilir?**

Tərpənməyən boru kəməri vəziyyətinə görə üç cür tikiş ilə qaynaq edirlir:

- düz
- döngəli (və ya əyri)
- tavan üzrə (aşağıdan yuxarı).

**19. Hansı hallarda qaynaq tikişində qüsurlar yaranır?**

Qaynaq edilən metalların kimyəvi tərkibi fərqli olduqda, qaynaq çubuğu düzgün seçilmədikdə, qaynaq rejimi (sürət və gərginlik) düzgün seçilmədikdə qaynaq tikişində qüsurlar yaranır.

**20. Qaynaq aparatlarının naqillərinə olan tələblər hansılardır?**

Qaynaq aparatlarının elektrik naqilləri, çoxsimli mis materialdan hazırlanmış naqildən olmalıdır və bu naqillər onlara düşən elektrik qüvvəsinə davam gətırməlidirlər.

**21. Qazla kəsmədə və qaynaqda işlədilən avadanlıq və vasitələr hansılardır?**

Qaz generatoru, qaynaq odluğu və oksigen kəskisi, təzyiq nizamlayıcılari (reduktor), rezin şlanqlar.

**22. Əl ilə elektrik-qövs qaynağında əsas parametrlər hansı hesab edilir?**

Əsas parametr qaynaq cərəyanı hesab edilir.

**23. Sabit cərəyanla qaynaq etdikdə hansı avadanlıqdan istifadə edilir?**

Qaynaq generatoru və daxili yanma mühərriklərindən istifadə edilir.

**24. Əsas örtüklü elektrodlar qaynaqdan əvvəl nə üçün qurudulur?**

Rütubəti uzaqlaşdırmaq məqsədilə qurudulur.

**25. Sabit cərəyanın qısa yazılışı necədir?**

DC - sabit cərəyanın qısa yazılışıdır.

**26. Dəyişən cəryanın qısa yazılışı necədir?**

AC - dəyişən cərəyanın qısa yazılışıdır.

**27. Cərəyan şiddəti hansı ölçü vahidi ilə ifadə edilir?**

Cərəyan şiddəti amperlə ifadə edilir.

**28. Elektrik–qövs qaynağında istifadə edilən maskadakı şüşə ekran qaynaqçını nədən qoruyur?**

İnfraqırmızı və Ultrabənövşəyi şuadan mühafizəni təmin edir.

**29. Qaynaq elektrodları saxlanan otaqlarda havanın temperaturu minumum nə qədər olmalıdır?**

Qaynaq elektrodları saxlanan otaqlarda havanın temperaturu minumum $+18^0$ C olmalıdır.

**30. Qaynaq elektrodunun saxlama müddəti nə qədərdir?**

Qaynaq elektrodunun saxlama müddəti 6 aydır.

**31. Poladları hansı temperatura qədər qızdırdıqda maqnitliyi itir?**

Poladları $723^0$ C temperatura qədər qızdırdıqda maqnitliyi itir.

**32. Qaynaq elektrodu nəyə görə seçilir?**

Qaynaq elektrodu materialın qalınlığına görə seçilir.

**33. Qaynağın hansı fəza vəziyyətində cərəyan şiddətini azaltmaq məqsədəuyğun hesab edilir?**

Tavan qaynağı vəziyyətində cərəyan şiddətini azaltmaq məqsədəuyğun hesab edilir.

**34. Qaynaq tikişində ən önəmli qüsur hansı sayılır?**

Kök tikişinin natamam ərimməsi ən önəmli qüsur sayılır.

**35. Qaynaq metalındakı karbon elementinin miqdarı onun hansı xüsusiyyətini artırır?**

Zərbəyə qarşı davamlığını artırır.

**36. Elektrik cərəyanı nəyə deyilir?**

Sərbəst elektronların istiqamətlənmiş hərəkətinə elektrik cərəyanı deyilir.

**37. Cərəyanın neçə növü vardır?**

Cərəyanın iki növü vardır:

- dəyişən cərəyan
- sabit cərəyan

**38. Poladların qaynaq olma qabiliyyətini pisləşdirən nədir?**

Poladın tərkibində karbonun və ligerləyici elementlərin miqdarının çox olması.

**39. Hansı qida mənbələri ilə eyni vaxtda bir neçə qaynaqçı işləyə bilər?**

BKCM-1000 adlanan qida mənbəyi ilə eyni vaxtda bir neçə qaynaqçı işləyə bilər.

**40. Dielektriklər nəyə deyilir?**

İçərisində sərbəst elektronlar olmayan cisimlərə dielektriklər deyilir.

**41. Şərti diametri 250-400 mm olan boruları uc-uca qaynağa hazırlamaq üçün qaynaq tikişi yerinə borunun çevrə uzunluğu boyu neçə ədəd kiçik qaynaq hissələri (prixvatkalar) verilməlidir və uzunluğu neçə mm olmalıdır?**

Şərti diametri 250-400 mm olan boruları uc-uca qaynağa hazırlamaq üçün qaynaq tikişi yerinə borunun çevrə uzunluğu boyu 3 ədəd kiçik qaynaq hissələri (prixvatkalar) verilməlidir və uzunluğu 50 mm olmalıdır.

**42. Poladların tərkibində ən çoxu neçə faiz karbon olur?**

Poladların tərkibində ən çoxu 2% karbon olur. Dəmir – karbon ərintisində karbonun miqdarı 2%-ə qədər olduqda, bunlara – poladlar deyilir.

**43. Çuqunların tərkibində ən azı neçə faiz karbon olur?**

Çuqunların tərkibində ən azı 2% karbon olur. Dəmir – karbon ərintisində karbonun miqdarı 2%-dən yuxarı olduqda - bunlara çuqunlar deyilir.

**44. Legirləyici elementlər hansılardır?**

- Xrom
- Vanadium
- Titan
- Nikel

**45. Qaynaq rejiminin parametrləri hansılardır?**

- Cərəyanın qiyməti;
- Cəryanın növü və qütbülüyü;
- Elektrodun diametri;
- Qövsün gərginliyi və qaynağın sürəti.

**46. TCD-500 qaynaq transformatoru ilə eyni vaxtda neçə qaynaqçı işləyə bilər?**

TCD-500 qaynaq transformatoru ilə eyni vaxtda bir qaynaqçı işləyə bilər.

**47. Çuqunların qaynaqlanması üçün əsasən hansı qaynaq üsulundan istifadə olunur?**

Çuqunların qaynaqlanması üçün əsasən əl elektrik qövs qaynaq üsulundan istifadə olunur.

**48. Qaynaqdan əvvəl əsas metalın qızdırılması nə üçün aparılır?**

Qaynaqdan əvvəl əsas metalın qızdırılması aparılır soytmanı ləngitmək və çatların qarşısını almaq üçün aparılır.

**49. Örtüklü elektrodların nəm olması qaynaqda nəyə səbəb ola bilər?**

Örtüklü elektrodların nəm olması qaynaqda Qaz boşluqlarına səbəb ola bilər.

**50. Qaynaq zamanı temperaturun sürətlə artmasının deformasyaya təsiri nədir?**

Qaynaq zamanı temperaturun sürətlə artması deformasiyanı artırır.

**51. Hansı qaynaq tikişi çətin qaynaq tikişi adlanır?**

Tavan qaynaq tikişi çətin qaynaq tikişi adlanır.

**52. Diametri 2,5 mm olan elektrod üçün təqribən neçə amper cərəyan lazımdır?**

Diametri 2,5 mm olan elektrod üçün təqribən 80A cərəyan lazımdır.

**53. Qaynaq zamanı elektrik qaynaq aparatları, transformatorlar və qaynaq ediləcək konustruksiyalar nəyə birləşdirilməlidr?**

Qaynaq zamanı elektrik qaynaq aparatları, transformatorlar və qaynaq ediləcək konustruksiyalar **n**aqillə yerə birləşdirilməlidir.

**54. Elektrod örtüyü qaynaq prosesində hansı işləri yerinə yetirir ?**

Elektrod örtüyü qaynaq prosesində qövsun sabit yanmasını təmin edir, havanın oksigenindən və azotundan qoruyur, həmçinin ərimiş metalı lazımı elementlərlə ligerləyir.

**55. Qaz qaynağında istifadə olunan asetilin qazını necə alırlar?**

Kalsimum-karbidə su ilə təsir etməklə asetilin qazı alınır.

**56. Qaz qaynağında yanar qazları hansı qazla birlikdə yandırırlar?**

Oksigen qazı ilə birlikdə yandırırlar.

**57. Asetilen generatoru nəyə deyilir?**
Kalsium-karbidi su ilə parçalamaqla asetilen alınan aparata asetilen generatoru deyilir.
**58. Asetilen generatoru ilə alov törədici mənbə arasındakı məsafə nə qədər olmalıdır?**
Asetilen generatoru ilə alov törədici mənbə arasındakı məsafə 10 m-ə qədər olmalıdır.
**59. Sıxılmış oksigen qazı üçün şlanq hansı rəngdə olmalıdır?**
Sıxılmış oksigen qazı üçün şlanq göy rəngdə olmalıdır.
**60. Asetilen qazı üçün şlanq hansı rəngdə olmalıdır?**
Asetilen qazı üçün şlanq qırmızı rəngdə olmalıdır.
**61. Asetilen qazını ($C_2H_2$) almaq üçün hansı materialdan istifadə olunur?**
Asetilen qazını almaq üçün Karbid ($CaC_2$) materialından istifadə olunur.
**62. Balona doldurulmuş oksigen qazının ($O_2$) təzyiqi nə qədər olur?**
Balona doldurulmuş oksigen qazının təzyiqi 150 atm (kqq/$sm^2$) olur.
**63. Balona doldurulmuş asetilen qazının ($C_2H_2$) təzyiqi nə qədər olur?**
Balona doldurulmuş asetilen qazının təzyiqi 19 atm (kqq/$sm^2$) olur.
**64. Oksigen balonu ilə asetilen geniratoru arasınfakı məsafə minumum nə qədər olmalıdır?**
Oksigen balonu ilə asetilen geniratoru arasınfakı məsafə minumum 5 m olmalıdır.
**65. Qaz yandırıcılarının ucları hansı materialdan hazırlanır?**
Qaz yandırıcılarının ucları Mis materialdan hazırlanır.
**66. Asetilenin normal şəraitdə verilə bilən işçi təzyiqi nə qədərdir?**
Asetilenin normal şəraitdə verilə bilən işçi təzyiqi 1,5 bar-dır.
**67. Metalların qaz alovlu qaynağı üçün hansı alətdən istifadə edilir?**
Qaz alov yandırıcısından istifadə edilir.
**68. Metalların qaz qaynağı zamanı qaz alovu nə ilə tənzimlənir?**
Qaz alov yandırıcısı ilə tənzimlənir.

**69. Metalın qalınlığından aslı olaraq qaz alov yandırıcısının hansı hissəsi dəyişdirilir?**

Metalın qalınlığından aslı olaraq qaz alov yandırıcısının ucluq hissəsi dəyişdirilir.

**70. Qaz qaynağında qaynaq olunan metalın qalınlığından aslı olaraq neçə üsuldan istifadə edilir?**

Qaz qaynaq işlərində 2 üsuldan istifadə edilir.

- Sol qaynaq üsulu (Qalınlığı 3 mm-dən az olan polad materialları, Al, Cu və tökmə poladları qaynaq etmək məqsədi ilə istifadə edilir)
- Sağ qaynaq (qalınlığı 3 mm-dən çox olan polad materialları qaynaq etmək məqsədi ilə istifadə olunur)

**71. Sağ qaynaq üsulunda alov yandırıcısı hansı istiqamətdə hərəkət etdirilir?**

Sağ qaynaq üsulunda alov yandırıcısı Soldan sağa istiqamətində hərəkət etdirilir.

**72. Lehimləmə zamanı əsas metal əridilirmi?**

Lehimləmə zamanı əsas metal əridilmir.

**73. Qaz qaynağında yandırıcı qaz olaraq aşağıdakılardan hansılar sayılır?**

Qaz qaynağında Oksigen yandırıcı qaz sayılır.

**74. Asetilen generatorları tiplərinə görə neçə qrupa bölünür?**

Asetilen generatorları tiplərinə 2 (iki) qrupa bölünür. Quruluş tipinə görə stasionar və səyyar (daşına bilən). Stasionar tipli generatorların məhsuldarlığı 3 $m^3$/saat olur.

**75. Balonlara doldurulmuş qazların təzyiqi nə vasitəsi ilə tənzimlənir?**

Balonlara doldurulmuş qazların təzyiqi Reduktor vasitəsi ilə tənzimlənir.

**76. Texniki oksigen qazı təmizlik dərəcəsinə görə neçə çeşiddə istehsal olunur?**

Texniki oksigen qazı təmizlik dərəcəsinə görə 3 (üç) çeşiddə istehsal olunur.

- 1 - ci çeşidli oksigen – tərkibində azı 99,7 ⁰/₀ xalis oksigen vardır.
- 2 - ci çeşidli oksigen – tərkibində azı 99,5 ⁰/₀ xalis oksigen vardır.
- 3 - cü çeşidli oksigen – tərkibində azı 99,2 ⁰/₀ (həcmcə) xalis oksigen vardır.

**77. Kalsium-karbid parçalarının ölçülərinə görə neçə cürə çeşidlənir?**

Kalsium-karbid parçalarının ölçülərinə görə 4 cürə çeşidlənir.

- 2x8
- 8x15
- 15x25
- 25x80

**78. Texniki asetilen hansı QOST-un tələblərinə cavab verməlidir?**

QOST- 5457-60 tələblərinə cavab verməlidir.

**79. Ölçüləri 8-15 mm olan 1-ci növ 1kq karbidi su ilə parçaladıqda neçə litr asetilen alınır?**

Ölçüləri 8-15 mm olan 1-ci növ 1kq karbidi su ilə parçaladıqda 260 litr asetilen alınır.

**80. Ölçüləri 15-25 mm olan 2-ci növ 1kq karbidi su ilə parçaladıqda neçə litr asetilen alınır?**

Ölçüləri 15-25 mm olan 2-ci növ 1kq karbidi su ilə parçaladıqda 250 litr asetilen alınır.

**81. Ölçüləri 8-15 mm olan 2-ci növ 1kq karbidi su ilə parçaladıqda neçə litr asetilen alınır?**

Ölçüləri 8-15 mm olan 2-ci növ 1kq karbidi su ilə parçaladıqda 240 litr asetilen alınır.

**82. Ölçüləri 15-25 mm olan 1-ci növ 1kq karbidi su ilə parçaladıqda neçə litr asetilen alınır?**

Ölçüləri 15-25 mm olan 1-ci növ 1kq karbidi su ilə parçaladıqda 270 litr asetilen alınır.

**83. İstehsalatda istifadə olunan Kalsium karbid hansı QOST-un tələblərinə cavab verməlidir?**

İstehsalatda istifadə olunan Kalsium karbid QOST- 1460-56 tələblərinə cavab verməlidir.

**84. Qaz qaynaq geniratorları istehsal edilən asetelien qazının təzyiqindən aslı olaraq neçə qrupa bölünür?**

Generatorlar hasil edilən asetilenin təzyiqindən aslı olaraq 2 qrupa bölünür.

- Alçaq təzyiqli generatorlar 0,1 kq/sm$^2$ daxil olmaqla;
- Orta təzyiqli generatorlar 0,1-0,7 kq/sm$^2$, 0,7-1,5 kq/sm$^2$ daxil olmaqla.

**85. Poladları hansı temperatura qədər qızdırdıqda maqnitliyi yox olur?**

Poladları $723^0$ C temperatura qədər qızdırdıqda maqnitliyi yox olur.

**86. Qaynaq metalında oksigenin ($O_2$) artması qaynağın keyfiyyətinə necə təsir edir?**

Möhkəmlik və axıcılıq həddini azaldır.

**87. Sol qaynaq üsulunda alov yandırıcısı hansı istiqamətdə hərəkət etdirilir?**

Sol qaynaq üsulunda alov yandırıcısı sağdan sola istiqamətində hərəkət etdirilir.

**88. Qaz qaynaq üsulu qalınlığı neçə mm-ə kimi metalların qaynağı üçün sərfəli sayılır?**

Qaz qaynaq üsulu qalınlığı 2 - 4 mm-ə kimi metalların qaynağı üçün sərfəli sayılır.

**89. Yumuşaq lehim ərintiləri hansılardır?**

Qalay və qurğuşun yumuşaq lehim ərintiləridir.

**90. Sağ qaynaq üsulunda alov yandırıcısı ilə elektrod məftilinin hərəkət ardıcıllığını göstər?**

Əvvəlcə alov yandırıcısı və arxasınca elektrod məftili ardıcıllığı ilə olur.

**91. Qoruyucu qazlar mühütündə qaynaq üsulunun üstünlükəri hansılardır?**

Qoruyucu qazlar mühütündə qaynaq üsulunun üstünlükəri yüksək keyfiyyətli qaynaq tikişinin alınması və prosesin bütün vəziyyətlərdə aparılmasının mümkün olmasıdır.

**92. Asetilen və oksigen alovunda maksimum temperatur hansı zonada yaranır?**

Asetilen və oksigen alovunda maksimum temperatur bərpaedici zonada yaranır.

**93. Metal və ərintilərin qaynaqlanma qabiliyyətinə əsas təsir edən element hansıdır?**

Metal və ərintilərin qaynaqlanma qabiliyyətinə əsas təsir edən element Karbondur.

**94. Qaz qaynağı aparılan yerdə neçə ədəd oksigen balonunun saxlanılması qadağan deyil?**

Qaz qaynağı aparılan yerdə 2 (iki) ədəd oksigen balonunun saxlanılması qadağan deyil.

**95. Asetilen generatoru kalsium karbid ilə doldurulduqdan sonra, odluğu yandırmamışdan əvvəl nə edilməlidir?**

Qazqolder və şlanqlardakı havanı şlanqlarda olan qazlarla üfürmək lazımdır.

**96. Qaz qaynaq işləri zamanı şlanqlar nədən qorunmalıdır?**

Şlanqlar yüksək temperaturun təsirindən və mexaniki zədələnmədən qorunmalıdır.

**97. Qaynaq işləri zamanı odluq həddən artıq qızarsa nə edilməlidir?**

Odluğu söndürüb su ilə soytmaq lazımdır.

**98. Qaz qaynağı zamanı asetilen generatorundan, oksigen balonlarından, şlanqlardan, qaz xətlərindən və lil çalalarından neçə metr məsafədə siqaret çəkmək və açıq alovdan istifadə etmək qadağandır?**

10 m-dən az məsafədə siqaret çəkmək və açıq alovdan istifadə etmək qadağandır.

**99. Kameranın sayına görə təzyiq nizamlayıcıları necə olur?**

Kameranın sayına görə təzyiq nizamlayıcıları 1 və 2 olur.

**100. Oksigen qaz təzyiq nizamlayıcısında neçə ədəd manometr olur?**

Oksigen qaz təzyiq nizamlayıcısında 2 ədəd manometr olur.

**101. Asetilen qaz təzyiq nizamlayıcısında manometrin sayı nə qədərdir?**

Asetilen qaz təzyiq nizamlayıcısında 2 ədəd manometr olur.

**102. Kiçik odluqlar üçün şlanqın diametri nə qədərdir?**

Kiçik odluqlar üçün şlanqın diametri 5,5 mm-dir.

**103. Adi odluqlar üçün şlanqın diametri neçə mm-dir?**

Adi odluqlar üçün şlanqın diametri 9,5 mm-dir.

**104. Kəskilər üçün şlanqın diametri neçə mm-dir?**

Kəskilər üçün şlanqın diametri 17,5 mm-dir.

**105. Şlanqlar iş yerlərində ayda neçə dəfə suya salınıb kipliyə yoxlanmalıdır?**

Şlanqlar iş yerlərində ayda 1 dəfə suya salınıb kipliyə yoxlanmalıdır.

**106. Qazı odluğa və kəskiyə çatdırmaq üçün hansı növ şlanqdan istifadə olunur?**

Qazı odluğa və kəskiyə çatdırmaq üçün vulkanlaşdırılmış, kətan araqatlı rezindən hazırlanmış xüsusi şlanqlardan istifadə olunur.

**107. Qaynaqçı alov şualarından və ərintinin sıçramasından qorunması üçün nədən istifadə etməlidir?**

Qaynaqçı alov şualarından və ərintinin sıçramasından qorunması üçün xüsusi şüşələrdən hazırlanmış işıq süzgəcli eynəkdən istifadə etməlidir.

**108. Qaynaqda hansı fəal qoruyucu qazlardan istifadə olunur?**

Qaynaqda fəal qoruyucu qazlardan olan karbon və hidrogen qazlarından istifadə olunur.

**109. Qaynaq üçün hansı inert qazlardan istifadə olunur?**

Qaynaq üçün Arqon və helumdan istifadə olunur.

**110. Qoruyucu qaz mühütündə hansı qazlardan daha çox istifadə olunur?**

Qoruyucu qaz mühitində Arqon karbon qazından daha çox istifadə olunur.

**111. Flüsün kimyəvi xassələri üzrə hansı növü var?**

Flüsün kimyəvi xassələri üzrə silikatlar əmələ gətirənlər növü var.

**112. Metal nədir?**

Parlaqlığa malik, elektriki və istiliyi yaxşı keçirən, döyülə bilən bərk cisimdir.

**113. Hansı çuqun qaynaq olunmur?**

Ağ çuqun qaynaq olunmur.

**114. Əlamətlərinə görə metallar neçə cür olur?**

Metallar əlamətlərinə görə iki növə ayrılır:

- əlvan metallar
- qara metallar.

**115. Poladlar tərkibində olan ligerləyici elementlərin faizlə miqdarına görə neçə qrupa bölünür?**

Poladlar tərkibində olan ligerləyici elementlərin faizlə miqdarına görə 3 qrupa bölünür.

- aşağı legirli poladlar – legirləyici elementlərin miqdarı 2.5 % - ə qədər;
- orta legirli poladlar – legirləyici elementlərin miqdarı 2.5 – 10 % arasında;
- yüksək legirli poladlar – legirləyici elementlərin miqdarı 10 % - dən yuxarı.

**116. Azkarbonlu poladın faizlə miqdarı nə qədərdir?**

Azkarbonlu poladın faizlə miqdarı 0,25%-dir.

**117. Orta karbonlu poladın faizlə miqdarı nə qədərdir?**

Orta karbonlu poladın faizlə miqdarı 0,25-0,6%-dir.

**118. Qaynaq tikişləri fəzada yerləşmə vəziyyətinə görə neçə yerə bölünür?**

Qaynaq tikişləri fəzada yerləşmə vəziyyətinə 4 yerə bölünür.

- Aşağı
- Üfqi
- Şaquli
- tavan

**119. Lehimləmə zamanı hissələr bir-birinə nə vasitəsilə birləşdirilir?**

Lehimləmə zamanı hissələr bir-birinə Lehim materialı vasitəsilə birləşdirilir.

**120. Qaynaq işi zamanı asetilen generatoru ilə alov törədici mənbə arasındakı məsafə neçə metr olmalıdır?**

Qaynaq işi zamanı asetilen geniratoru ilə alov törədici mənbə arasındakı 10 metr olmalıdır.

**121. Asetilenin kimyəvi işarəsi necədir?**

Asetilenin kimyəvi işarəsi $C_2H_2$ –dir.

**122. Diametr üzrə hansı polietilen borular muftasız qaynaqlanır ?**

225 mm diametrli polietilen boruları muftasız qaynaq edilir.

**123. Plastik kütləli boruların qaynağı zamanı hansı qaynaq üsulundan istifadə edilir?**

Plastik kütləli boruların qaynağı zamanı qızdırılmış alətlə qaynaq üsulundan istifadə edilir.

**124. Hazırlandığı plastik kütlə markasına görə hansı boru möhkəm sayılır?**

Hazırlandığı plastik kütlə markasına görə PEVP-100 markalı boru möhkəm sayılır.

**125. Sarı zolaqlı plastik borular hansı maddələrin nəqli üçün nəzərdə tutulmuşdur?**

Sarı zolaqlı plastik borular Qazın nəqli üçün nəzərdə tutulmuşdur.

**126. Qızdırıcıda istilik relesi ilə nəyi tənzimləyirlər?**

Qızdırıcıda istilik relesi ilə Temperaturu tənzimləyirlər.

**127. Viniplastı hansı temeraturda qaynaq edirlər?**

Viniplastı $200^0$-$220^0$ C temeraturda qaynaq edirlər.

**128. Qaynaqlanan hissələrin uclarının müxtəlif çirklərdən təmizlənməməsi qaynaq tikişinin möhkəmliyinə necə təsir edə bilər?**

Qaynaqlanan hissələrin uclarının müxtəlif çirklərdən təmizlənməməsi qaynaq tikişinin möhkəmliyin azaldar.

**129. Hansı qaynaq birləşməsində boruların ucları daha çox qızır?**

Uc-uca qaynaq birləşməsində boruların ucları daha çox qızır.

**130. Diametr üzrə hansı polietilen borular mufta ilə qaynaqlanır?**

Diametr üzrə 25 mm-lik polietilen borular mufta ilə qaynaqlanır.

**131. Polietilen boruların istismarı zamanı qaynaq tikişində yaranan qüsurlar necə bərpa edilir?**

Polietilen boruların istismarı zamanı qaynaq tikişində yaranan qüsurlar kəsilərək bərpa edilir.

**132. Üc-uca qaynaqlanan polietilen plastik kütlə borularının qaynaq tikişlərinin keyfiyyətinə hansı fiziki üsulla nəzarət etmək olar?**

Üc-uca qaynaqlanan polietilen plastik kütlə borularının qaynaq tikişlərinin keyfiyyətinə ultrasəs üsulu ilə nəzarət etmək olar.

**133. Qaynaq birləşmələrində ən təhlükəli qüsurlar hansıdır?**

Qaynaq birləşmələrində ən təhlükəli qüsurlar termostruktur dəyişmələridir.

**134. Plastik kütlələr qara metaldan neçə dəfə yüngüldür?**

Plastik kütlələr qara metaldan 5-6 dəfə yüngüldür.

**135. Plastik kütlə borularının qaynağında məsaməliyin əmələ gəlməsinin əsas səbəbi nədir?**

Plastik kütlə borularının qaynağında məsaməliyin əmələ gəlməsinin əsas səbəbi əridilmiş ucların uzun müddət havada qalması və oturtma təzyiqinin kifayət qədər olmamasıdır.

**136. Plastik kütlə borularının qaynaq rejim parametrləri hansılardır?**

Plastik kütlə borularının qaynaq rejim parametrləri qızdırılma temperaturu, qızdırma müddəti, oturtma təzyiqi və soyuma müddətidir.

**137. Qaynaq tikişlərində hansı vəziyyətdə yerləşən qüsurlar daha təhlükəlidir?**

Qaynaq tikişlərində Gərilmə qüvvələrinə perependikuliyar yerləşən qüsurlar daha təhlükəlidir.

**138. Çöl şəraitində borular xəndəyin harasında qaynaqlanırlar?**

Çöl şəraitində borular xəndəyin kənarında qaynaqlanırlar.

**139. Qaynaq birləşməsində hansı qüsur əmələ gələ bilər?**

Qaynaq birləşməsində məsaməlik, bitişməzlik, batıqlar, termostruktur dəyişməsi qüsurları əmələ gələ bilər.

**140. İzi qalmayan qaynaq üsulu hansıdır?**

Ultrasəslə edilən qaynaq izi qalmayan qaynaq üsuludur.

## II BÖLMƏ
## QAZIN ALQI-SATQISI, ÖLÇÜ VASİTƏLƏRİ və QAZ TƏSƏRRÜFATI MÜƏSSİSƏLƏRİNDƏ QAZ SƏRFİ və QAZPAYLAYICI ŞƏBƏKƏLƏRDƏ TEXNİKİ İTKİLƏRİN TƏYİN OLUNMASI METODİKASI HAQQINDA

### I FƏSİL
### QAZIN ALQI-SATQISI HAQQINDA

**1. Ölkə ərazisində təbii qazın alqı-satqısı necə tənzimlənir?**

Ölkə ərazisində təbii qazın alqı-satqısı "Qaz təchizatı haqqında" Azərbaycan Respublikasının Qanununa əsasən Azərbaycan Respublikası Nazirlər Kabinetinin 12.05.2011-ci il tarixli 80 №-li qərarı ilə təsdiq edilmiş “Qazdan istifadə Qaydaları” ilə tənzimlənir. Bu qaydalar qaz paylayıcısı ilə istehlakçı arasında qaz təchizatı üzrə münasibətləri (qazın alqı-satqı müqaviləsi əsasında), şəbəkəyə qoşulma və şəbəkədən ayırma şərtlərini, qazın keyfiyyəti (təzyiq və təchizatın etibarlılığı), qazın dəyərinin ödəmə şərtlərini müəyyən edir.

**2. Qaz paylayıcısı kimdir?**

Qaz paylayıcısı - alqı-satqı müqaviləsi əsasında istehlakçıların qoşulduğu qazpaylayıcı boru və qurğu şəbəkəsi vasitəsilə qazın çatdırılmasını, satışını və bu fəaliyyətlərlə əlaqədar xidmətləri həyata keçirən hüquqi şəxsdir.

Qaz təhlükəli olduğu üçün onun buraxılması, tələblərə uyğun olaraq yerinə yetirilməlidir. Qaz kəmərlərinə, QPM-ə (Qaz paylayıcı məntəqə) və qazla işləyən obyektlərin qaz avadanlıqlarına qazın buraxılması üzrə işlərin qaz təsərrüfatı müəssisələrinin ixtisaslaşdırılmış işə buraxılma-sazlama təşkilatları tərəfindən (paylayıcılar, əmtəə operatorları) aparılmasına icazə verilir.

**3. İstehlakçı kimdir?**

Alqı-satqı müqaviləsi əsasında qazı satın alan və qazdan yanacaq və ya xammal kimi istifadə edən hüquqi və ya fiziki şəxs istehlakçı adlanır.

**4. Qaz paylayıcısı tərəfindən istehlakçının qazla təchiz edilməsi nəyə əsasən həyata keçirilir?**

Qaz paylayıcısı tərəfindən istehlakçının qazla təchiz edilməsi qazın alqı-satqı müqaviləsinə əsasən həyata keçirilir. Həmin müqaviləyə qaz paylayıcısı ilə istehlakçı arasında qazpaylayıcı şəbəkənin balans mənsubiyyəti sərhədini müəyyən edən akt əlavə edilir.

Qaz paylayıcısı və istehlakçının müəyyənləşdirilən vəzifələri və hüquqları, habelə istehlakçılara verilən qazın keyfiyyəti (təzyiq və təchizatın etibarlığı), həcmi, dəyərinin ödəmə şərtləri və digər məsələlər qazın alqı-satqı müqaviləsində göstərilir.

**5. "Qazdan istifadə Qaydaları"nın tələblərinin yerinə yetirilməsinə dövlət nəzarəti hansı təşkilatlar tərəfindən həyata keçirilir?**

"Qazdan istifadə Qaydaları"nın tələblərinin yerinə yetirilməsinə dövlət nəzarətini öz səlahiyyətləri daxilində qazdan səmərəli istifadə və qaz qurğularının etibarlı istismarı sahəsi üzrə Azərbaycan Respublikasının Sənaye və Energetika Nazirliyi, texniki təhlükəsizlik sahəsi üzrə isə Azərbaycan Respublikasının Fövqəladə Hallar Nazirliyi tərəfindən həyata keçirirlər.

**6. Qazpaylayıcısının əsas vəzifəsi nədir?**

Qazpaylayıcısının əsas vəzifəsi qanunvericiliyin və beynəlxalq standartların tələblərinə uyğun olaraq Azərbaycan Respublikası ərazisində qaz şəbəkəsinin təhlükəsiz istismarını təmin etmək, ətraf mühitə ziyan vurmamaq, təbii qazdan istifadə edən bütün istehlakçıları fasiləsiz, keyfiyyətli və təhlükəsiz qaydada təbii qazla təchiz etməkdir.

**7. Qaz təsərrüfatında balans mənsubiyyəti sərhədi dedikdə nə başa düşülür?**

Balans mənsubiyyəti sərhədi dedikdə qaz paylayıcısı tərəfindən qazın istehlakçıya çatdırılma məntəqəsində qaz paylayıcısı və istehlakçı arasında müqavilə ilə qazpaylayıcı şəbəkənin balans mənsubiyyətini müəyyənləşdirən ayırma nöqtəsi başa düşülməlidir.

**8. Qaz qurğusu dedikdə nə başa düşülür?**

İstilik enerjisinin alınması və məişət ehtiyacları üçün qazın yanacaq və müxtəlif növ məhsulların istehsalı üçün xammal kimi istehlakı prosesində

istifadə olunan, dövlət standartlarının tələblərinə cavab verən və uyğunluq sertifikatı olan məişət və sənaye qaz qurğuları.

**9. Qaz qurğuları istismara qəbul olunduqdan və qazpaylayıcı şəbəkəyə qoşulduqdan sonra neçə gün müddətində qazın alqı-satqısı barədə müqavilə imzalanmalıdır?**

Qaz qurğuları istismara qəbul olunduqdan və qazpaylayıcı şəbəkəyə qoşulduqdan sonra 5 (beş) iş günü müddətində qaz paylayıcısı ilə istehlakçı arasında qazın alqı-satqısı barədə müqavilə imzalanır və həmin andan etibarən istehlakçıya qazın verilməsi müqaviləyə uyğun təmin edilir.

**10. İstehlakçıya tələb edilən qazın həcmi necə müəyyən edilir?**

İstehlakçıya tələb olunan qazın həcmi onun istismar edəcəyi qaz qurğularının texniki pasport göstəricilərində maksimal saatlıq qaz sərfinə uyğun olaraq müəyyən edilir.

**11. Sənaye qurğusu olan istehlakçı tələb edilən qazın həcmini artırmaq və ya azaltmaq istədikdə nə etməlidir?**

Sənaye qurğusu olan istehlakçı qazın alqı-satqı müqaviləsində göstərilən həcmi artırmaq və ya azaltmaq istədikdə, bu barədə qaz paylayıcısına yazılı müraciət etməlidir.

**12. İstehlakçılar tərəfindən sərf olunmuş qazın miqdarı necə hesablanır?**

İstehlakçılar tərəfindən sərf olunmuş qazın miqdarının qeydə alınması nəzarət-ölçü cihazlarının (qaz sayğaclarının) aylıq göstəricilərinə əsasən aparılmalıdır.

**13. Sayğacların quraşdırılması və istismarı işləri necə tənzimlənir?**

Sayğacların quraşdırılması, nizamlama və sazlama işləri, istismara qəbulu, eləcə də onların texniki vəziyyətinə nəzarət Qaz təchizatı müəssisəsinin struktur bölmələri tərəfindən təlimata uyğun həyata keçirilməlidir.

**14. Ölçü qovşaqları və ya sayğacların Dövlət yoxlanışı hansı müddətdən bir aparılmalıdır?**

Ölçü qovşaqları və ya sayğacların Dövlət yoxlanışı Azərbaycan Respublikasının Standartlaşdırma, Metrologiya və Patent üzrə Dövlət Agentliyinin müəyyən etdiyi müddətlərdə aparılmalıdır.

**15. Ölçü qovşaqları və ya sayğacların Dövlət yoxlanışından keçirilməsi hansı təşkilatın səlahiyyətlərindədir?**

Qaz sərfini qeydə almaq üçün tətbiq edilən müxtəlif növ sayğaclar və sərfölçənlər Azərbaycan Respublikasının Standartlaşdırma, Metrologiya və Patent üzrə Dövlət Agentliyi tərəfindən yoxlanılmalı və plomblanmalıdır.

**16. Qaz təchizatı müəssisəsi işçilərinin qaz ölçü cihazlarına günün hansı vaxtlarında baxış keçirə bilər?**

Qaz istehlakçıları günün bütün vaxtlarında Qaz təchizatı müəssisəsi işçilərinin qaz ölçü cihazlarına baxış keçirməsini təmin etməlidir.

**17. İstehlakçıların qaz sərfini ölçmə cihazları müvəqqəti (az müddətdə) fəaliyyət göstərmədikdə qazın həcmi necə təyin edilir?**

İstehlakçıların qaz sərfini ölçmə cihazları müvəqqəti (az müddətdə) fəaliyyət göstərmədikdə və ya nasaz olduqda, eləcə də sayğaclarda Dövlət yoxlama damğası olmadıqda, sərf olunan qazın qeydə alınması müəssisənin sayğacsız işlədiyi vaxt ərzində, qaz istifadə edən qurğuların ümumi məhsuldarlığı ilə müəyyən edilir.

**18. İstehlakçıların qaz sərfinin qeydiyyatı necə aparılmalıdır?**

**A**y ərzində 100 min kub metrdən artıq qaz istifadə edən istehlakçıların qaz sərfinin qeydiyyatı gündəlik aparılmalıdır. Aylıq qaz sərfi 100 min kub metr və az olan yaşayış məntəqələri, müəssisələr, idarələr, istilik qazanxanaları və fərdi istixanalar üzrə qaz sərfinin çıxarışı təsdiq olunmuş qrafikə uyğun olaraq ayda bir dəfə aparılır.

**19. Qaz kəmərində təzyiq və kəmərin en kəsiyinə görə qaz axını sərfi necə hesablanır?**

Qaz kəməri borusunun en kəsiyinə və təzyiqə görə qaz axını sərfi aşağıdakı düsturla hesablanır:

$Q = 3600 \times F \times C$ m3/saat.

Burada: Q-qaz sərfi, $m^3$/saat; F-qaz kəmərinin en kəsik sahəsi, $m^2$

$$F = \pi \times d^2/4, \ m^2$$

$\pi = 3.14$; d - borunun diametri, m; C - qaz kəmərində qazın surətidir, m/san.

$C = 0.65 \sqrt{2g\, H/Y}$ - burada Y - qazın xüsusi çəkisi = 0.7 kq/$m^3$,

g - sərbəstdüşmə təcili = 9.81 m/$san^2$, H - qaz kəmərində təzyiq düşküsü, mm. su süt.

**20. Müəssisə və təşkilatların sayğaclarına texniki xidmət necə həyata keçirilir?**

Müəssisə və təşkilatların sayğaclarına texniki xidməti müəssisə sahibləri və ya müqavilə əsasında Qaz təchizatı müəssisəsi tərəfindən istehsalçı zavodun təlimatına uyğun olaraq (ildə 1 dəfədən gec olmayaraq) aparıla bilər.

**21. Çox mənzilli binalarda və fərdi yaşayış evlərində məişət qaz sayğacları hansı hündürlükdə quraşdırılmalıdır?**

Çox mənzilli binalarda və fərdi yaşayış evlərində məişət qaz sayğacları 1,6 – 1,8 metr hündürlükdə quraşdırılmalıdır.

**22. Qaz paylayıcısı hansı hallarda istehlakçıya qazın verilməsinin dayandırılacağı barədə yazılı bildiriş göndərə bilər?**

Qaz paylayıcısı aşağıdakı hallarda İstehlakçıya qazın verilməsini dayandıra bilər:

- İstehlakçının müvafiq yazılı müraciəti (qaz təchizatının dayandırılmasının səbəbi və müddəti göstərilməklə) olduqda;
- Təmir-profilaktika və qəza işləri görüldükdə, o cümlədən baş verən yanğının və ya qaz sızmasının qarşısı alındıqda;
- İstehlakçının qaz qurğusu Azərbaycan Respublikası Nazirlər Kabinetinin müəyyən etdiyi dövlət standartlarının tələblərinə cavab vermədikdə;
- Paylayıcının İstehlakçıya verdiyi qazın sayğacla müəyyənləşdirilən hesabı istehlakçıya payalayıcı tərəfindən təqdim edildikdən (göndərildikdən) sonra bir ay müddətinə tam ödənilmədikdə;
- Paylayıcı ilə müvafiq müqavilə bağlanmadıqda;
- Məhkəmənin qərarı ilə;

İstehlakçının qaz qurğusu dövlət standartlarının tələblərinə cavab vermədiyi, Paylayıcının İstehlakçıya verdiyi qazın sayğacla müəyyənləşdirilən hesabı istehlakçıya təqdim edildikdən (göndərildikdən) sonra bir ay müddətinə tam ödənilmədiyi və Paylayıcı ilə müvafiq müqavilə bağlanılmadığı hallarda qazın verilməsinin dayandırılacağı barədə İstehlakçıya yazılı bildiriş göndərilə bilər.

**23. Boru kəmərində olan qazın həcmini hesablamaq üçün hansı göstəricilər tələb olunur?**

Boru kəmərinin diametri, uzunluğu və təzyiqi.

**24. Qaz sayğaclarının istismara qəbulu necə aparılır?**

Qaz sayğacı quraşdırıldıqdan sonra sabun köpüyü və ya xüsusi cihazla kipliyə yoxlanılır, giriş və çıxış birləşmələri və ekranı plomblanaraq quraşdırılma aktı yazılır. Sayğaclar və plomblar akt əsasında qeydiyyata alınır və əmrlə balansa götürülür.

**25. AGİS proqramının mənası nədir?**

AGİS Avtomatlaşdırılımış qaz informasiya sistemi sözlərinin qısaldılmış versiyasıdır.

**26. AGİS proqramında əhali abonentləri hansı statuslara ayrılırlar?**

AGİS proqramında əhali abonentləri aktiv və passiv statuslara ayrılırlar.

**27. Abonentin kreditor borcu nə deməkdir?**

Abonent istehlak etdiyi təbii qazın dəyərindən artıq ödəniş etdiyi halda hesabında yaranan borca kreditor borc deyilir.

**28. AGİS kompüter informasiya bazası hansı qrup təbii qaz istehlakçılarına bölünür?**

AGİS kompüter informasiya bazası əhali, qeyri əhali və fərdi istixana qrupu təbii qaz istehlakçılarına bölünür

**29. AGİS proqramında abonent kodunun 3-cü və 4-cü rəqəmləri abonentin ünvanında nəyin kodunu bildirir?**

Abonentin yaşadığı rayonun kodunu bildirir.

**30. AGİS proqramında abonent kodunun 5-ci, 6-cı və 7-ci rəqəmləri abonentin ünvanında nəyin kodunu bildirir?**

Abonentin yaşadığı küçənin kodunu bildirir.

## II FƏSİL
## METROLOGİYA HAQQINDA

**1. Ölçmələr haqqında elm necə adlanır?**
Ölçmələr haqqında elm Metrologiya adlanır.
**2. Metroloqun əsas vəzifəsi nədir?**
Qaz təsərrüfatında istifadə olunan ölçü vasitələrinə metroloji nəzarəti, o cümlədən onların vəziyyətini, iş şəraitini və göstəricilərinin düzgünlüyünü müşahidə etmək və yoxlanmalarını təmin etmək.
**3. Dövlət reyesteri nədir?**
Respublika ərazisində istifadəsinə icazə verilmiş ölçmə vasitələrinin siyahısı.
**4. Temperatur nədir?**
Temperatur, maddənin istilik vəziyyətinin ölçüsüdür. Temperatur dəyişdikdə maddənin xassəsi dəyişir.
**5. Termometr nədir?**
Maddənin temperaturunu ölçmək üçün cihazlardır. Mayeli (civəli), spirtli, rəqəmli və s. formalarda olur.
**6. Manometrlərin hansı diapazonda istismarı tövsiyə olunur?**
Göstəricisinin 3/1 ÷ 3/2 diapazonunda.
**7. Qaz təzyiq tənzimləyicilərinin təyinatı nədir?**
Təzyiqin aşağı salınması və verilmiş həddə saxlanması üçün tətbiq olunan qurğu.
**8. Qazın təzyiqi nədir?**
Borulardakı qazlar həmin boruların səthinə müəyyən miqdarda təzyiq göstərir ki, bu da təzyiq qüvvəsi adlanır. Vahid sahəyə düşən qüvvənin həmin sahəyə təsir qüvəssinə nisbətinə qazların təzyiqi deyilir.
$P = F/S = N/m^2 = Pa$.
burada, P-təzyiq, F-qüvvə. S-səthin sahəsi.
**9. Nisbi xəta nədir?**
Nisbi xəta cihazın mütləq xətasının ölçmədən alınan qiymətə nisbətinin faizlə ifadəsidir.

**10. Atmosfer təzyiqi nədir?**

Yer kürəsinin havadan ibarət olan atmosfer qatı yerə müxtəlif qiymət hədlərində (80kPa (600mm.c.s) - 106kPa (795mm.c.s)) təzyiq göstərir. Normal atmosfer təzyiqi $0^0$C temperaturda 760 mm.civə sütunudur (101325 Pa, 10332 mm.su sütunu, 1,0332 kqq/sm$^2$, 1,0332bar). Dəniz səviyyəsindən yuxarı qalxdıqca hər 12 metrdən bir havanın sıxlığı azalır atmosfer təzyiqi 1mm.civə sütunu (133,3Pa) azalır.

**11. İzafi təzyiq nədir?**

Atmosfer təzyiqini üstələyən təzyiq izafi təzyiq adlanır.

**12. Mütləq təzyiq nə deməkdir?**

Sıfırdan ölçülən təzyiq mütləq təzyiq adlanır. Mütləq təzyiq atmosfer təzyiqi ilə izafi təzyiqin cəmidir. $P_{mütləq} = P_{atm} + P_{izafi.}$

**13. Təftiş yoxlaması nədir?**

Ölçmə vasitələrinin istismara yararlılığını təyin etmək üçün səlahiyyətli təşkilatlar tərəfindən aparılan yoxlamalardır.

**14. Şəhər qaz kəmərlərinin təzyiqə görə təsnifatı hansılardır?**

Aşağı təzyiqli 0,05 kq/sm$^2$-qədər, orta təzyiqli 0,05 – 3,0 kq/sm$^2$, yüksək təzyiqli 3 – 6 kq/sm$^2$, xüsusi hallarda 1,2 MPa qaz kəmərlərinə ayrılır.

**15. Ölçü qovşağında olçü borusunun diametri hansı diapazonda tətbiq olunur?**

50 mm ≤ D ≤ 1000 mm

**16. Manometrlə nəyi ölçürlər?**

Atmosfer təzyiqindən yüksək təzyiqlər (izafi) manometrlər vasitəsilə ölçülür.

**17. Qazın sıxlığı nədir?**

Vahid həcmə düşən qazın kütləsidir (kq/m$^3$).

**18. Flyans birləşmələri üçün hansı araqatlardan istifadə olunur?**

Paronit, yağa-benzinə davamlı rezin, alüminium, mis araqatlar.

**19. Respublika ərazisində normal şəraitin qiyməti ?**

Respublika ərazisində normal şərait kimi $0^o$C (273,15K), 760 mm civə süt. (101,325 kPa), 0 nəmlik qəbul olunmuşdur.

**20. Ölçü qovşağında daraldıcı qurğu (diafraqma) nə üçün tətbiq olunur?**

Təzyiqlər fərqi yaratmaq üçün.

**21. Daraldıcı qurğunun dəliyinin ən aşağı ölçüsü nə qədərdir?**

$d \geq 12,5$ mm

**22. Şeh nöqtəsi nədir?**

Su buxarı ilə doymamış qazı soyutduqda, onun nisbi nəmliyi artır, müəyyən temperaturda isə su buxarı ilə doymuş halda olur. Qazın soyumasının davam etdirilməsi, qazda olan su buxarının kondensasiya olunmasına, su damcılarına çevrilməsinə səbəb olur. Verilmiş təzyiqdə kondensasiyanın başlaması temperaturu - şeh nöqtəsi adlanır.

**23. Respublika ərazisində hansı tip qaz sayğaclarından istifadə edilir?**

- Rotorlu
- Turbinli
- Diafraqmalı (membranlı).

**24. Paronit (QOST 481) hansı təzyiqlərdə araqat kimi istifadə oluna bilər və qalınlığı?**

Təzyiqi 1,6MPa (16kqq/$sm^2$)-ya (daxil olmaqla) qədər olan qaz kəmərlərində birləşmələrin sıxılması üçün və 1-4 mm qalınlıqda Paronit araqat kimi istifadə oluna bilər.

**25. Mütləq temperaturunun qiyməti hansıdır?**

$K = C^o + 273,16$ - Mütləq temperaturunun qiymətidir.

**26. 25 $^oC$-də mütləq temperaturun təyini qaydası və qiyməti ?**

$273,16 + 25 = 298,16$.

**27. Mütləq xəta nə deməkdir?**

Cihazın bir bölgüsünün qiymətinin yarısıdır.

**28. Borunun en kəsiyinin sahəsinin təyini düsturu hansıdır?**

$\pi d^2/4$- Borunun en kəsiyinin sahəsi təyini düsturudur.

**29. Daraldıcı qurğu (diafraqma) nədir?**

Axan mühitin sərfiyyatını ölçmək üçün, daraldıcı qurğu vasitəsilə qaz boru kəmərləri ilə qaz axınının yerli daraldılması nəticəsində təzyiqlər fərqi yaradılır. Axının sərfiyyatının hesablanmasında əsas amillərdən biri olan təzyiqlər fərqi ($\Delta p$) nə qədər yüksəkdirsə axının sərfiyyatı bir o qədər yüksək olur və yaxud əksinə.

**30. Diafraqmanın dövrü dövlət yoxlamasından keçirilmə dövrü necədir?**

İldə bir dəfədən az olmayaraq diafraqmanın dövrü dövlət yoxlamasından keçirilmə dövrüdür.

**31. Korrektor (ölçü çeviricisi) nədir?**

Ölçülən kəmiyyətin işlənməsi, saxlanması, sonrakı çevrilmələri, indikasiyası və ya ötürülməsi üçün əlverişli olan digər kəmiyyətə və ya ölçmə siqnalına çevirməyə yarayan normativ metroloji xarakteristikalara malik texniki vasitədir.

**32. Ölçü diapazonu nədir?**

Ölçmə diapazonunu aşağıdan və yuxarıdan (soldan və sağdan) məhdudlaşdıran kəmiyyət qiymətləri uyğun olaraq ölçmənin aşağı həddi və ya ölçmənin yuxarı həddi adlanır.

**33. Kalibrlənmə nə deməkdir?**

Kalibrlənmənin nəticələri, ölçmə vasitəsinin göstərdiyi ölçülən kəmiyyətin həqiqi qiymətini təyin etməyə və ya ölçmə vasitəsinin göstərişinə düzəliş etməyə və ya bu vasitələrin xətasını qiymətləndirməyə imkan verir.

**34. Ölçmə vasitəsinin ilkin yoxlanması nə deməkdir?**

Tipi təsdiq olunmuş ölçmə vasitələri istehsal olunduqdan, təmirdən çıxdıqdan və idxal olunduqda ilkin dövlət yoxlanmasından keçirilməlidirlər.

**35. Təbii qazın özüalışma temperaturu hansıdır?**

Təbii qazın özüalışma temperaturu 650 $^{o}$C-dir.

**36. Birləşdirici impuls xətlərinin daxili diametrinin minimal qiyməti neçədir?**

Birləşdirici impuls xətlərinin daxili diametrinin minimal qiyməti 6 mm -dir.

**37. G-4, G-6, G-10 markalı mexaniki qaz sayğacların nominal ölçü diapazonu neçə kub metrdir?**

- G-4=4 $m^3$
- G-6=6 $m^3$
- G-10=10 $m^3$.

**38. Dövrü yoxlanma nədir?**

İstismarda olan hər bir ölçmə vasitəsi Standartlaşma, Metrologiya və Patent üzrə Dövlət Komitəsi tərəfindən təsdiq olunmuş müddət ərzində

dövrü yoxlanmadan keçirilməlidir. Dövrü dövlət yoxlanmasından keçməyən cihazların istismarı qadağandır. Yoxlamadan keçirilmiş cihazlara müvafiq yoxlama kleymoları vurulmalıdır.

**39. Nəzarət ölçü cihazları ilə qaz təsərrüfatında hansı qrup fiziki parametrlərə nəzarət edilir?**

- Təzyiq
- Temperatur
- Sərfiyyat.

**40. Qazın təzyiq vahidləri hansılardır?**

- kqq/sm$^2$
- Pa
- Bar
- Atm
- mm.civə sütunu
- mm su sütunu.

**41. 1 kqq/m$^3$ neçə paskaldır?**

1 kqq/m 100000 Pa.-dır.

**42. Bir atmosfer neçə kPa-dır?**

Bir atmosfer 101,325 kPa-dır.

**43. Respublika ərazisində standart təzyiq neçədir?**

Respublika ərazisində standart təzyiq 101,325 kPa (770 mm civə sütunu) qiymətində təyin edilir. QOST 2939-63 tələbərinə uyğun olaraq istehlakçılarla aparılan qarşılıqlı hesabatlarda həcm bu şərtə uyğunlaşdırlmalıdır.

**44. Növbədənkənar yoxlanma nədir?**

İstismar zamanı metroloqlar tərəfindən işində nasazlıqlar aşkar edilmiş ölçmə vasitələri növbədənkənar Dövlət yoxlanmasından keçirilməlidir.

**45. Qazın sıxlığı hansı düsturla hesablanır?**

$\rho = m / v$

ρ- qazın sıxlığı, m-qazın kütləsi, v-qazın-həcmidir.

**46. Pikonometr nədir?**

Təbii qazın laboratoriya şəraitində sıxlığını təyin etmək üçün istifadə olunan qurğu.

**47. Metanın ($CH_4$) aqreqat halı hansıdır?**

Qaz halı.

**48. Təbii qazın axın istiqaməti hansı tərəfədir?**
Yüksək təzyiqdən aşağı təzyiqə doğru.
**49. Temperatur çeviricisinin və ya qoruyucu gilzəninin boruda dərinliyi nə qədərdir?**
0,3 D-dən 0,7 D-yə qədər.
**50. Hansı temperatur şkalaları vardır?**
- Selsi
- Kelvin
- Farenqeyt
- Ryumer.

**51. Barometr-Aneroid nəyi ölçür?**
Atmosfer təzyiqini ölçən cihazdır.
**52. Kalori-nədir?**
Standart atmosfer təzyiqində (101,325 Kpa)1qr suyu 1 kelvin qızdırmaq üçün tələb olunan enerji və ya işin miqdarı.
**53. Xromotoqraf nəyi təyin edir?**
Təbii qazın kopmonent tərkibini təyin edən cihazdır.
**54. Qazın həcmi hansı fiziki parametrlərdən asılıdır?**
Qazın temperaturundan və təzyiqindən.
**55. Avaqadro sabitinin qiyməti neçədir?**
Avaqadro sabitinin qiyməti 22,4.-dir.
**56. Qazın xüsusi cəkisi nə qədərdir?**
Qazın xüsusi cəkisi 0,7675 –dir.
**57. Qazın qurudulmasında hansı üsullar istifadə edilir?**
- Rütubətin maye maddə ilə absorbsiya edilib udulması.
- Rütubətin bərk maddə ilə absorbsiya edilib udulması.
- Qazın soyudulması və ya sıxıldıqdan sonra soyudulması ilə qaza rütubəti udan maye yeritməklə soyudulması.

**58. ROC-407 (107) sərfölçən cihazı nədir?**
Standart daraldıcı qurğuda dəyişən təzyiqlər fərqinə görə qaz sərfini ölçən elektron cihazdır.
**59. Qaz sayğacları hansı qaydada quraşdırılmalıdır?**
Sayğac şaquli vəziyyətdə qaz kəmərinə sərbəst, yəni hər hansı bir əlavə fiziki qüvvə istifadə edilmədən və yer səthindən sayğacın alt hissəsinə

qədər 1,6-1,8 metr hündürlükdə quraşdırılmalıdır (sayğacın zədələnmədən istisna halları nəzərə alınmalıdır).

**60. Qaz sayğaclarının çıxarılma (açılma) səbəbləri hansılardır?**

- Qaz sayğacında gözlə görünən müdaxilə halı aşkar edildikdə;
- Sayğacın hesablayıcı mexanizminə, birləşmələrinə vurulmuş plomblara müdaxilə olunduqda və yaxud onların qırıldığı aşkarlanarsa yenidən Dövlət yoxlamasına göndərilməsi halında;
- Mənzil daxilindən və ya həyətlərdə quraşdırılmış sayğaclar kənara çıxarıldıqda;
- Sayğaclar yeni müasir tipli sayğaclarla əvəz edildikdə;
- Sayğac faktiki sərfiyata uyğun olmadıqda;
- Sayğacın növbəti Dövlət yoxlamasının vaxtı çatdıqda;
- Sayğac düzgün işləmədikdə (sayğacdan qaz keçmədikdə, aşağı sərfiyyatı qeyd etmədikdə, hesablama mexanizmi dayandıqda, işlək vəziyyətdə müəyyən səslər gəldikdə və s.).

**61. ROC-407 (107) sərfölçən cihazında ölçülən parametrlər hansılardır?**

Temperatur, təzyiq, təzyiqlər fərqi və həmçinin vaxt və saatlıq, günlük, aylıq sərfiyyat.

**62. Qaz sayğaclarının birləşmələrinə xüsusi nömrəli plombların vurulması qaydası necədir?**

- Rotor və Turbin Elster markalı elektron sayğacların hesablayıcı mexanizminin örtüyünə, giriş və çıxış flyans birləşmələrinə;
- Diafraqma tipli mexaniki sayğacların (G-2,5, 4, 6, 10, 16 və 25 markalı) hesablayıcı mexanizminə və birləşdirici qaykalarına (giriş və çıxış birləşmələrinə hesablayıcı mexanizminin qapağından keçirilməklə).

**63. Diafraqmanın diametrinin, ölçü borusunun diametrinə nisbəti nə ilə ölçülür?**

Diafraqma diametrinin, ölçü borusunun diametrinə nisbəti β ilə ölçülür.

β= d / D; β

0,1 £ β £ 0,75

d ³ 12,5 mm, 50 mm £ D £ 1000 mm.

**III FƏSİL**
**SMART SAYĞACLAR HAQQINDA**

**1. Smart Sayğac nədir?**

“İTRON” firmasının istehsalı olan Smartkart tipli (əvvəldən ödənişli) diafraqmalı məişət qaz sayğacı təbii, aqressiv olmayan aşağı təzyiqli quru və təmiz qazların uçotunun aparılması üçün istifadə olunur. Sayğac mexaniki ölçmə mexanizmindən, Smartkart ölçmə qurğusundan (elektron hissə), gövdədən, giriş və çıxış yivli birləşmələrdən, bağlayıcı klapandan və gövdənin daxilinə quraşdırılmış iki kameralı membrandan ibarətdir.

**2. Smart Sayğac hansı hissələrdən ibarətdir?**

- giriş və çıxış yivli birləşmələr - yivlər arasında olan məsafə 11 cm-dir;
- hesablayıcı qurğunun qoruyucu örtüyünə vurulan xüsusi plomblar;
- mexaniki hesablayıcı mexanizm - 8 rəqəmli;
- LSD ekranı;
- informasiya düyməsi;
- klapanın açılışı, kredit həcmindən istifadə düyməsi;
- kart yuvası;
- element yuvasının qoruyucu qapağı.

**3. Qallus IV PSC ITRON G4 tipli qaz sayğaclarının texniki göstəriciləri hansılardır?**

- Ölçülən mühit-temperaturun -10 ̊C-dən +55 ̊ C-yə qədər, ən böyük işçi təzyiq 0,5 bar (0,05 MPa) olan təbii qaz, qazabənzər propan, butan və onların qarışığı və s. qeyri aqressiv qazlar
- Sayğaclar ətraf mühitin temperaturu -10 ̊C-dən +55 ̊C-yə qədər olan şəraitdə istismar edilir. Bu şəraitdə sayğacın mexaniki hissələrin, habelə elektron blokunun normal işi təmin olunur.

Elektron blokun işinə məhdudiyyətlər:

- -5 ̊C -dən +35 C-yə qədər--maye kristallik displeydə göstərişlər aydın seçilir.
- 0 ̊C-dən +55 ̊C- yə qədər smart kartın köməyilə sayğacın kreditləşdirilməsi əməliyyatını həyata keçirmək mümkündür.
- Maksimal nəmlik +40 ̊ C-də 95% olmalıdır

- Qaz sərfinin ən böyük qiyməti Qmax= 6,0$m^3$/s
- Qaz sərfinin nominal qiyməti Qnom=4,0$m^3$/s
- Qaz sərfinin ən az qiyməti Qmin=0,040$m^3$/s
- Dövrü həcm -1,2$dm^3$
- Qmax-da təzyiq itkisi -200 Pa-dan çox olmamalıdır.
- Qmin-da təzyiq itkisi -60Pa-dan çox olmamalıdır.
- Hesablayıcı qurğunun tutumu-99999,999
- Şkalanın ən kiçik bölgü qiyməti-0,2$dm^3$
- Buraxıla bilən nisbi xətanın həddi :
  Qmin≤Q<0,1Qmax sərf diapazonunda ----± 3%
  0,1Qmax≤Q≤Qmax sərf diapazonunda ----±1,5%
- Sayğacın kütləsi – 2,3±0,15kq
- Gövdənin materialı – polad
- Qol borunun mərkəzləri arasında məsafə 110±0,15 mm.

**4. Smart Sayğacların quraşdırılma Qaydaları hansıladır?**

Smart Sayğacı şaquli vəziyyətdə boru kəmərlərinə elə birləşdirilməlidir ki, qazın axın istiqaməti ilə sayğacın gövdəsində göstərilən ox işarəsi üst-üstə düşsün. Sayğac elə yerləşdirilməlidir ki, onun hesablayıcı qurğusundan göstərişi görmək əlverişli olsun. Sayğac qaz təzyiqinin reduksiya edilməsi pilləsindən sonra (qazın təzyiqinin nizamlayıcısı) quraşdırıla bilər. Sayğac iki variantda qoşula bilər: baypaslı və baypassız.

**5. Smart Sayğac quraşdırma zamanı tələb olunan təhlükəsizlik qaydaları hansılardır?**

Sayğac quraşdırılarkən öncədən “Quraşdırma və İstismar üzrə təlimat” öyrənilməlidir. Sayğacların quraşdırılması istismara verilməsi, təmiri və yoxlanılması ancaq bu işlərin yerinə yetirilməsinə rəsmi hüququ olan təşkilatlar tərəfindən həyata keçirilə bilər. Sayğaclar quraşdırılan ərazidə qaz verilişi müvəqqəti olaraq dayandırılmalıdır. Sayğacların quraşdırılma prosesi texniki şərtin tələblərinə riayət olunmaqla həyata keçirilməlidir. Sayğacların qol boruları bağlanmış şəkildə boru kəmərinə qaynaq edilməsi qadağandır. Sayğaclar quraşdırıldıqdan sonra mənzildə qaz iyinin olmamasına əmin olmaq lazımdır. Hər ehtimala qarşı giriş qapıları və aynalar açılaraq evin havası dəyişilməlidir. Smart kartla işləyən qaz sayğaclarının sızmanı yoxlama funksiyasından istifadə edərək mənzildə

qaz borularında sızma yoxlanılmalıdır. Əgər sızma olarsa dərhal aradan qaldırılmalıdır. Quraşdırma zamanı qaz qaynaq qurğuları normativ sənədlərdə göstərilən məsafədə qoyulmalıdır. Oddan istifadə edərək sızmanı yoxlamaq qəti qadağandır.

**6. Smart tipli Qallus IV PSC ITRON G4, G6 Sayğacların saxlanma şəraiti necə olmalıdır ?**

Sayğacların uzunmüddətli saxlanıldığı otaqlar quru və qızdırılan olmalıdır. Sayğaclar nəqletmə şəraitinə əməl edilməsi şərtilə istənilən nəqliyyat vasitəsilə (hava, dəmiryolu, avtomobil, dəniz) nəql etdirilə bilər. Quraşdırma zamanı sayğaclar öz qutularında birbaşa günəşin şüaları düşməməsi şərtilə quru sahədə saxlanılmalıdır. Sayğacı əldən salmaq, mexaniki zərbələrə məruz qoymaq qəti qadağandır.

**7. Qallus IV PSC ITRON G4 sayğacın quruluşu və iş prinsipi necədir?**

Qallus IV PSC ITRON G4 tipli qaz sayğacları aşağıdakı hissələrdən ibarətdir:

- Gövdə (alt, üst);
- İki ədəd ölçmə kamerası;
- Kinematik mexanizm;
- Üst qapaqda yerləşdirilmiş bağlayıcı klapan;
- Sayğacın öncədən ödəmə rejimində işini təmin edən elektron blok.

Sayğac quru tipli iki kameralı icra olunmuş ölçmə cihazlarına aiddir. Hər bir kamera girişi və çıxışı arasnda yaranan təzyiq fərqindən hərəkətə gətirilən sintetik və hərəkətli diafraqmadan ibarətdir. Diafraqmanın hərəkəti kinematik mexanizm vasitəsilə hesablayıcı mexanizmin fırlanma hərəkətinə çevrilir. Ölçü kameraları və kinematik mexanizm hermetik gövdəyə qoyulmuşdur. Kinematik qurğu sayğacda kreditin qeydiyyatını təmin edən, eləcə də bağlayıcı klapanı idarə edən elektron blokla əlaqələndirilmişdir. Əgər sayğac öncədən ödəmə rejimində işləyirsə onda sayğacdan qaz keçərkən sayğacın yaddaşına qeyd olunmuş kredit avtomatik olaraq azalır. Sayğacın işinə təsir edən ştatdankənar hallar (daxil olan qazın təzyiqinin və sərfinin maksimal həddə çatması, sızmanın olması, batareyaların quraşdırılması üçün qapağın açılması) olduqda, habelə sayğacda kreditin tam sərf olunması zamanı sayğacın elektron bloku

bağlayıcı klapanı işə salır, qapayır və bununla da qazın verilməsi dayandırılır.

**8. Smart tipli Qallus IV PSC ITRON G4 Qaz sayğaclarının quraşdırılmasından öncə nələri bilmək lazımdır ?**

Sayğacın quraşdırılması üzrə işlərə başlamazdan öncə sayğacın pasportunu və "Quraşdırma və istismar üzrə təlimatı" öyrənmək lazımdır. Quraşdırma işlərinə başlanana qədər sayğaclar qol borularına qapaqlar taxılmış vəziyyətdə, quru və isidilən otaqda saxlanılmalıdır. Sayğacların saxlanma və nəqletdirmə temperaturu -20 ̊C-dən +50 ̊C-yə qədərdir. Sayğaclar bina evlərində mənzilin giriş qapısının yaxınlığında-pilləkən şaxtasında, həyət evlərində isə küçə tərəfdən quraşdırılmalıdır. Sayğaclar xüsusi qutunun içərisində quraşdırılır. Sayğaclar boru kəmərinin aşağı hissəsində kondensat yığıla biləcək yerdə quraşdırıla bilməz. Əgər kondensat yaranması baş verərsə, onda sayğac tərəfdən yuxarıda qaz axını istiqamətində boru kəmərinə kondensat tutucuları qoymaq lazımdır. Qazın sayğacdan qabaq tələb olunan süzülmə dərəcəsi 100mkm-dən az olmamalıdır.

**9. Quraşdırmadan sonra sayğaclarda yarana biləcək ştatdankənar nasazlıqların növləri və onların aradan qaldırılması üsulları hansılardır ?**

Smart-kartla işləyən Qallus IV PSC ITRON G4, G6 qaz sayğacları bir qayda olaraq quraşdırma üçün dövlət yoxlamasından keçdikdən sonra təqdim edilir. Buna baxmayaraq quraşdırmadan sonra sayğacda aşağıda göstərilən mümkün ola biləcək nöqsanlar qarşıya çıxa bilər:

- Bağlayıcı klapanın açılmaması;
- Sayğacın kartı qəbul etməməsi;
- Sayğacın displeyində klapan açıq olması barədə informasiya olmasına baxmayaraq mənzilə qaz daxil olmaması.

1-ci halda klapanın açılmamasına səbəb sayğacın qol borusunun quraşdırma vaxtı əyilməsi səbəb olur. Bu nöqsanın olmaması üçün quraşdırma zamanı xüsusi şablondan istifadə etmək lazımdır. Bu şablon sayğacın qol boruları mərkəzlərarası məsafəni lazımi ölçüdə saxlamağa imkan verir və qol borularında gərginliyin olmamasına səbəb olur.

2-ci halda sayğac kartı qəbul etmirsə deməli sayğacın nömrəsi ilə kartda yazılan sayğac nömrəsi uyğun gəlmir. Yəni LSD displeydə F012 göstərir.
3-cü halda qol borularında sıxılmadan yaranan deformasiya nəticəsində klapanın iş rejimi pozulur.

**10. Smart tipli Qallus IV PSC ITRON G4 Sayğacın normal işləməsinə hansı göstərilən şərtlərə əməl edildikdə nail olmaq olar?**

- Sayğaca 0,5 bardan (atm-dən) artıq təzyiq vermək olmaz.
- Sayğaca hava ilə yanar qazın (təbii qaz, propan, butan və başqa yanar qazlar) qarışığını vermək olmaz.
- Sayğaclardan onun pasportunda göstərilən buraxıla bilən qaz sərfindən artıq (6,0$m^3$/s) qaz buraxmaq olmaz.
- Sayğacın ±60$^0$C temperatura qədər qızmasına səbəb ola biləcək istilik cihazlarının yaxınlığında yerləşdirmək olmaz.
- Sayğac gövdəsini, hesablayıcı qurğunu, elektron blokunu, sayğacın plombunu və ya haloqrammasını (damğasını) pozmaq və zərbələrə məruz qoymaq olmaz.

**11. Smart tipli Qallus IV PSC ITRON G4 Sayğacın elektron blokunun quruluşu, maye kristalik displeydə oxunan məlumatların məzmunu necədir ?**

Sayğacın elektron bloku aşağıdakı hissələrdən ibarətdir:

- Elektron blokunun əsas platası
- Maye kristallik displey
- İki ədəd düymə (üçkünc - İ simvolu yazılmış və dairəvi göy düymə).
- Dairəvi göy düymə smart kart ilə bağlayıcı klapanın açılması üçün, üçkünc düymə isə displeydə əks olunan informasiyanı seçilib oxunması üçün nəzərdə tutulmuşdur.

Bundan başqa elektron blokun tərkibinə litium batareyası, smart kartı oxuyan rider daxildir. Hesablayıcı qurğunun 8 ədəd rəqəmləşdirilmiş barabanları sayğacdan keçən qazın həcmini göstərir ki, bunlardan 5 qara rolik - $m^3$, 3 qırmızı rolik litrlə həcmi göstərir (1$m^3$=1000 litr). Maye kristalik displey sayğacın vəziyyəti, qaz tarifləri və cari kredit barədə məlumatları göstərir.

12. **Qaz sayğaclarının kreditlənmə proseduru və ehtiyat kreditinin istifadə qaydaları hansılardır?**

- Smart kart almış abonent xüsusi bank terminallarında, kartına müəyyən məbləğdə pul yüklədir.
- Kartı sayğaca daxil etməzdən öncə abonent mənzilindəki bütün qaz cihazlarını söndürməli, xüsusən qaz plitələrinə qaz ötürən borulardakı kranları bağlamalıdır
- Smart kart sayğacda yuvaya daxil edilir, müəyyən müddətdə sayğacdan 2 dəfə siqnal səsi gəldikdən sonra sayğacın üz panelindəki dairəvi göy rəngli düymə 5 saniyə müddətində basılı saxlanılır. Sayğac həmin anda sızmanı yoxlama rejiminə keçir və bu zaman sayğacın elektron lövhəsində görünən 190 rəqəmi geriyə doğru azalmağa başlayır. Pəncərədə 0 rəqəmi görünməyincə mənzildəki qaz cihazlarını işə salmaq olmaz. 190 saniyə bitdikdən sonra sayğacda xırıltılı səslə klapanın açılması prosesi başlayır. Səs kəsildikdə klapan tam açılmış sayılır. Əgər sızma yoxlanılan anda sayma yarımçıq dayanarsa bu o deməkdir ki, mənzildə sızma qeyd olunmuşdur. Sızma aradan qaldırılmayıncaya qədər sayğac klapanı açmayacaq. Abonentin sayğacında kredit məbləği olan halda təkrar məbləğ yükləmək üçün kartı yuvaya daxil etdikdən sonra göy düyməni basmaq kifayətdir. Ehtiyat kreditdən istifadə etmək üçün abonent smart kartını yuvaya daxil edir, göy rəngli dairəvi kredit düyməsini basaraq 1 manat məbləğində kredit almaq imkanına nail olur. Kredit ancaq sayğacda cari kredit məbləği tam bitdikdən sonra verilir

13. **Kartdan məlumat oxuyan qurğunun (kart riderin) vəzifəsi nədir?**

Kartdan məlumat oxuyan qurğu qaz sərfi üzrə ödəniş barədə məlumatı oxumaq və sayğacın göstəricilərinin abonentin kartına köçürmək üçün nəzərdə tutulmuşdur. Kart rider sayğacın istismarı vaxtı abonent tərəfindən ehtiyatla istismar edilməlidir. Onun işinin pozulması kreditləmə əməliyyatının pozulması deməkdir. Kart riderə sayğac üçün nəzərdə tutulmuş smart kartdan başqa kənar cisim salmaq qəti qadağandır.

**14. Qazötürücü boru kəmərlərinin forması və qaz axınının xarakteristikası ?**

Diafraqmalı qaz sayğaclarının normal fəaliyyəti üçün qazötürücü boru kəmərlərində sayğaclardan öncə və sonra düz sahənin olmasını tələb etmirlər. Sayğac bilavasitə süzgəcin (filtir) bağlayıcı kranın və ya qaz təzyiqi nizamlayıcısının (reduktor) yaxınlığında quraşdırıla bilər. Qaz axını stabil olmalı, fasiləsiz olmalı, təzyiqin aşağı qalxıb düşməsinə imkan verməmək lazımdır. Kipləşdirici ara qapıları (prokladka) elə hazırlanmalıdır ki, və elə yerləşdirilməlidir ki, onlar boru kəmərlərinin daxili diametrindən kənara çıxmamalı, sayğac birləşməsinin hermetikliyini təmin etmlidir.

**15. 3E sisteminin işləmə prinsipi necədir?**

“Azəriqaz” İB-də  tətbiq olunan İTRON  firmasına məxsus 3E sistemi smart kartın tərtib olunması, qaz istifadəçiləri haqqında məlumatların sistemə daxil edilməsi, terminallarda hər bir abonentə öz smart kartına kredit ödənişlərinin təmin olunmasıni həyata keçirir.

3e Oracle məlumatlar sistemi üzərində qurulmuş proqram olub abonentlərin şəxsi məlumatlarının, habelə ödənişlərin məlumat bazasının yaradılması və sistemləşdirilməsi funksiyasını daşıyır. 3E sisteminin tərkibinə məlumat bazasını özündə birləşdirən server, terminallarda quraşdırılmış, xüsusi proqramla təchiz edilmiş kompüterlər və kart riderlər daxildir.

**16. Smart kartın sistemdə rolu nədir ?**

Smart kart abonentlə sayğac, abonentlə terminal arasında elektron ünsiyyət vasitəsidir. Hər bir qaz istifadəçisi özünə aid olan smart kartla xüsusi ödəmə terminalında müəyyən məbləğdə pul köçürməklə kredit yüklənməsini həyata keçirir. Bundan əlavə qaz sayğaclarının istismarı dövründə yarana biləcək mənfi nöqsanları smart kart vasitəsilə məlumat bazasına ötürmə imkanı vardır. Bu isə az vaxt ərzində heç bir məsafə qət etmədən istənilən abonentin ödənişləri və sayğacın texniki vəziyyəti barədə məlumat almağa, təhlil etməyə və nəticə çıxarmağa imkan verir.

**17. Smart kart hansı hallarda sayğacın ekranında oxuna bilmir?**

Smart kartın sayğaca daxil olunması zamanı kartın oxunmamasının bir neçə səbəbi ola bilər:

- ➢ Abonent tərəfindən smart kartın sayğaca tərsinə salınması;
- ➢ Kartın çipset hissəsinin zədəli olması;
- ➢ Sayğacın kart rider hissəsinin zədəli olması və ya tozlanması;
- ➢ Sayğacın elementinin zəif olması və ya tamamilə bitməsi.

**18. Smart tipli IV PSC ITRON G4 Qaz sayğacının normal fəaliyyətinin əsas göstəriciləri hansılardır ?**

Smart tipli IV PSC ITRON G4 Qaz sayğacının normal fəaliyyətinin təmin olunması üçün onun pasportunda göstərilən texniki şərtlərə ciddi əməl olunmalıdır. Sayğaclar ətraf mühitin temperaturu -10 ̊C-dən +50 5C-yə qədər olan şəraitdə istismar edilməlidir. Bu şəraitdə sayğacın mexaniki hissələrinin, habelə elektron blokunun normal işi təmin olunur. Sayğaclara onun pasportunda göstərilən işçi təzyiqdən artıq təzyiq vermək, habelə maksimal sərfdən artıq sərflə qaz keçirmək olmaz. Sayğaclar xüsusi qutularda quraşdırılmalıdır. Bu sayğaca ətraf mühitin mənfi təsirini aradan qaldırmağa köməklik edir.

**19. Smart tipli IV PSC ITRON G4 qaz sayğaclarının istismara buraxılması qaydaları necədir?**

Sayğaclar işə buraxılmazdan öncə boru kəmərlərindəki bütün kranlar bağlı vəziyyətdə olmalıdır. Bütün variantlarda (baypaslı və ya baypassız) və qaz sərfinin buraxılmasının bütün mərhələlərində sayğacdan keçən qazın sərfinin sayğacın panelində göstərilən maksimal sərfdən (Qmax) artıq olmasına imkan vermək olmaz. Qazın buraxılması üçün aşağıdakı əməliyyatları həyata keçirmək lazımdır:

- ➢ Bütün qaz cihazlarını söndürmək;
- ➢ Sayğacda kreditin olmasına əmin olmaq;
- ➢ Kredit yoxdursa sayğacı kreditləndirmək.

Qaz sayğacının normal işi dedikdə onun hesablayıcı mexanizminin, barabanının fasiləsiz, dayanmadan stabil fırlanması nəzərdə tutulur.

**20. İtron Smart sayğacın elektron ekranında 1 bölməsi nəyi bildirir?**

İtron Smart sayğacın elektron **ekranında 1** bölməsi saygacda cari vaxta qalan təbii qazın miqdarını $m^3$ ilə bildirir.

**21. İtron Smart Saygacların elektron ekranında 2 bölməsi nə demәkdir?**

Smart saygacların elektron ekranında **2** bölməsi abonentin cari vaxta gədər ödədiyi məbləğin cəmini bildirir.

**22. Smart saygaca verilən 1 azn ehtiyyat kredit tam yəni 10 $m^3$ sərf olunanda sayğacın elektron ekranında hansı informasiya görsənir?**

Sayğacın elektron ekranında **"-10"** informasiyası görsənir. Bu zaman sayğacın giriş klapanı bağlı olduguna gorə qaz təminatı smart karta müvafiq məbləg yükləndikdən sonra kredit məbləğini cıxmaq şərti ilə qaz təminatı bərpa olunur.

**23. Smart tipli sayaclarda sarfiyyat göstərilən maksimal həddi kecdikdə nə baş verir ?**

Smart tipli sayaclarda sarfiyyat göstərilən maksimal həddi aşdıqda saygac xususi siqnallar verməklə Sayğacın elektron ekranında ALARIM xəbərdarliqedici məlumat verərək giriş klapanını bağlıyaraq qaz təminatını dəyandırır.

**24. Smart Saygaclarda elektron ekranda Allarım 1 yazısı olduqda bu nəyi bildirir ?**

Bu yazı sayğacın batareya yuvasının açılmasını bildirir. Bu zaman məsul qaz işçiləri tərəfindən abonentin iştirakı ilə sayğaca, mənzildə olan cıhazlara, xətlərə baxış keçirilməli, "Qaz sayğacının çıxarılması, quraşdırılması və istismara qəbulu haqqında" nömrəli "AKT" tərtib olunmalı və yeni qaz sayğacı ilə əvəzlənməlidir. Bu növ sayğaclar növbədənkənar Dövlət yoxlamasından keçirilməli və digər müvafiq tədbirlər görülməlidirdir.

**25. Smart Saygaclarda elektron ekranda Allarım 2 yazısı olduqda bu nəyi bildirir?**

Bu yazı sayğacın batareya səviyyəsinin 30 faiz cıvarında qalmasını bildirir.

**26. Smart Saygaclarda elektron ekranda Allarım 3 yazısı olduqda bu nəyi bildirir?**

Bu yazı sayğacın iterfeysində qisa qapanma oldugunu bildirir.

**27. Smart Saygaclarda elektron ekranda Allarım 5 yazısı olduqda bu nəyi bildirir?**

Bu yazı sayğacın mexaniki göstəricisinin 20 litr geriyə firlanmasını bildirir.

**28. Smart Saygaclarda elektron ekranda fO-44 yazısı olduqda bu nəyi bildirir?**

Bu yazı Sayğacın giriş klapanın tam açılıb-bağlanmadığını, düzgün işləmədiyini bildirir. Bu hal sayğacın düzgün quraşdırılmamasından və ya qol birləşmələr arasında gərilmə olduğu zaman meydana çıxa bilər.

**29. Smart Saygaclarda elektron ekranda F-100 dən F-155 qədər işarəsi olduqda bu nəyi bildirir?**

Bu yazı sayğacın elektron cipində olan zavod qüsurunu bildirir.

**30. Qaz sərfi zamanı smart saygacın mexanizimlərindən gələn səsin norması nə qədərdir?**

Qaz sərfi zamanı smart saygacın mexanizimlərindən gələn səsin norması sayğacdan 50 cm aralı məsafədən 42 db səsin gəlməsi məqsədəuygun hesab edilir.

**31. Smart saygacın üzərində olan Barkodun acılışı necədir?**

- YY - Smart sayğacın buraxılış ilini göstərir.
- CC - Calibir cədvəlində olan məlumatı göstərir.
- AZ1 - Tətbiq ediləcək ölkə kodunu göstərir.
- X-PART versiyasını göstərir.
- 01- istehsalçı zavodun idenfikasiya nömrəsini göstərir.
- 123456 - Smart saygacın nömrəsini bildirir.

**32. Smart saygacın elekton hissənin işləməsi üçün qida mənbəyi kimi nədən istifadə edilir?**

Sayğacda elektron hissənin qidalanması məqsədilə LS26500 markalı 3,6V gücə malik elementdən istifadə olunur. Elementin işləmə müddəti aşağıdakı şərtlər daxilində 9 ildir:

- klapanın işləməsi ay ərzində 4 dəfədən çox olmadıqda;
- istifadə olunmadıqda LCD ekran işləmirsə;
- kartla əməliyyat  həftədə bir dəfədən çox olmayaraq aparıldıqda.

**33. Smart saygaca mütəxəsislər tərəfindən xarici baxış necə aparılmalıdır?**

- sayğacın komplektliyi texniki sənədlərin tələblərinə cavab verməlidir;
- sayğacın üzərindəki markalanma dəqiq və asan oxunmalıdır;
- informasiya düymələri asan işləməlidir, üzərində heç bir zədə olmamalıdır;
- sayğacın boya örtüyü hamar olmalı, üzərində korroziya əlamətləri, cızıq izləri, çatlar olmamalıdır;
- yivli birləşmələrdə deformasiya olmamalıdır;
- sayğacın üzərində qazın hərəkət istiqamətini göstərən ox işarəsi olmalıdır;
- sayğacın klapanının üzərində heç bir zədə və cızıq olmamalıdır.
- istehsalçı zavod (yoxlayıcı müəssisə) tərəfindən hesablama mexanizminin örtüyünə vurulan xüsusi plombların üzərində və plomb yuvası ətrafında zədə, cızıq izləri olmamalıdır;
- sayğacın çıxışında plastmas boruda cızıq, sınıq, deşik əlamətləri, yad-cisimlər olmamalıdır;
- saygacın hesablama mexanizimindən gələn səs 42 db-dən cox olmamalıdır.
- mexaniki və elektron göstəricilər eyni olmalıdır.

Sayğac yuxarıda göstərilən tələblərə uyğundursa elektron hissədə informasiyaların yoxlanılması aşağıdakı ardıcıllıqla davam etdirilir:

- Reserv (qalıq) kreditin həcmi, $m^3$
- Daxil edilmiş toplam kreditin həcmi, $m^3$
- Tarix
- Vaxt
- İstifadə olunmiş qazın ümumi həcmi, $m^3$
- Mənfiyə gedərək borc kimi 10 və ya 16 bölməsinə düşən qaz həcmi, $m^3$

**34. Karta düşməyən məbləğin bərpası üçün hansı sənədlər lazımdır?**

- Abonentin şəxsiyyət vəsiqəsi;
- Ödəniş qəbzi;

- Rayon qaz müəssisəsinin nümayəndələri tərəfindən abonentin ünvanında olan sayğacın göstəricilərini göstərən akt.

**35. Abonentintin əvəz olunmuş sayğacının üzərində istifadə olunmamış məbləğin yeni sayğacın smart kartına qaytarılması necə həyata keçirilir?**

Abonentlərin əvəz olunan sayğaclarının üzərində olan istifadə edilməyən və creditback əməliyyatı vasitəsi ilə köhnə kartına qaytarılmış məbləğin yeni sayğacın balansına qaytarılması zamanı yerli qaz müəsisəsi tərəfindən müfaviq məktub hazırlanır və bu məktub əsasında əvəz edilmiş sayğacın kartında olan məbləğ abonentin mənzilində yeni quraşdırılmış sayğacın kartına köçürülür.

Müdaxilə şübhəli, yanmış, sındırılmış, mexaniki göstəricisi işləməyən, elementi bitmiş sayğacların məbləğləri SOCAR-ın aidiyyəti bölməsinin kalibirləşmə labaratoriyası tərəfindən verilən rəydən və müvafiq araşdırmadan sonra qaytarılması həyata keçirilir.

**36. Sayğaca kənar müdaxilə və onun iş qabiliyyətinin pozulması nə deməkdir ?**

Sayğaca kənar müdaxilə dedikdə müxtəlif vasitələrlə sayğacın hesablayıcı mexanizmini və klapan mexanizminin işini pozmaq nəzərdə tutulur.

## IV FƏSİL
## QAZ TƏSƏRRÜFATI MÜƏSSİSƏLƏRİNDƏ QAZ SƏRFİ və QAZPAYLAYICI ŞƏBƏKƏLƏRDƏ TEXNİKİ İTKİLƏRİN TƏYİN OLUNMASI METODİKASI HAQQINDA (Qaz təsərrüfatı müəssisələrində qaz sərfi və qazpaylayıcı şəbəkələrdə texniki itkilərin təyin olunma metodikası. Azərbaycan Respublikası Dövlət Neft Şirkəti "Neftqazelmitədqiqatlayihə" İnstitutu. Bakı. 11.12.2012)

**1. Qazpaylayici müəssisədə daxili tələbata qaz sərfi *($Q_{DT}$)* hansı hallarda istifadə edilir?**

Daxili tələbata qaz sərfinə aşağıdakılar aiddir:

1. Qazpaylayıcı müəssisəyə aid bina və tikililərinin istilik təchizatı, ventilyasiyası və isti su təchizatına qaz səril (əgər müəssisədə qazlaşdırılmış xüsusi qazanxana və ya qaz yanacağı ilə işləyən avtonom qızdırıcı qurğular varsa);
2. Qazpaylayıcı müəssisəyə aid texnoloji avadanlıqlar quraşdırılmış bina və tikililərinin istilik təchizatı, ventilyasiyası və isti su təchizatına qaz sərfi (əgər müəssisədə qazlaşdırılmış xüsusi qazanxana və ya qaz yanacağı ilə işləyən avtonom qızdırıcı qurğular varsa);
3. Qazlaşdırılmış xüsusi yeməkxanalarda yeməyin hazırlanmasına qaz sərfi;
4. Qazpaylayıcı müəssisələrin mexaniki-təmir emalatxanalarında və tədarük sexlərində qaz istifadə edən avadanlıqların istismarına qaz sərfi;
5. Qazpaylayıcı müəssisələrin texniki kabinetlərində qaz istifadə edən avadanlıqların stendlərinin istismarına qaz sərfi;
6. Qazpaylayıcı müəssisələrin kimya laboratoriyalarında xüsusi cihazların istismarına qaz sərfi;
7. Təlim-məşq mərkəzlərində stend və maketlərin istismarına qaz sərfi;
8. Qazpaylayıcı müəssisənin təqsirindən yaranan qəza hallarının lokallaşdırılması və aradan qaldırılmasına qaz sərfi.

**2. Qazpaylayıcı müəssisənin qaz balansı qaz yanacağının mədaxil və məxaric maddələrini birləşdirən düstür hansıdır?**

Qazpaylayıcı müəssisənin qaz balansı qaz yanacağının mədaxil və məxaric maddələrini birləşdirən düstür üzrə təyin edilir.

$$Q_q - [(Q_{dt} + Q_{te} + Q_i) + Q_{sq}] = 0$$

***(düstur №1)***

burada $Q_q$ - müəssisənin qəbul etdiyi qaz;

$Q_{dt}$ - daxili tələbata qaz sərfi;

$Q_{te}$ - texnoloji ehtiyaclara qaz sərfi;

$Q_i$ - texniki qaz itkiləri;

$Q_{sq}$ - istehlakçılara satılan qaz.

**3. İstismara qəbul edilərkən xarici qaz kəməri və avadanlıqların üfürülməsinə qaz sərfi necə hesablanır?**

“Qaz təsərrüfatında təhlükəsizlik qaydaları”-nın tələblərinə uyğun olaraq istismara qəbul edilən qaz kəməri və avadanlıqların üfürülməsi daxildə olan havanın tam sıxışdırılıb çıxarılmasınadək davam etdirilməlidir.

Qaz kəməri və avadanlıqların üfürülməsinə qaz sərfi qaz ($Q_{üf}$, $m^3$) aşağıdakı düsturun köməyi ilə hesablanır:

$$\mathbf{Q}_{\text{üf}} = \frac{\mathbf{0,0029 \cdot V \cdot k \cdot (P_a + P_q)}}{\mathbf{273} + \boldsymbol{t_q}}$$

***(düstur №2)***

burada *0,0029* - empirik əmsal;

*V* - üfürülən qaz kəməri və avadanlığın daxili həcmi, $m^3$;

*k* - düzəliş əmsalı, *1,25- 1,30;*

$P_a$ - atmosfer təzyiqi, *(1 atm-101325 Pa)Pa;*

$P_q$ - üfürülmə vaxtı qaz kəmərində qazın izafi təzyiqi, *Pa* (aşağı təzyiqli qaz kəməri üçün - işçi, orta və yuxarı təzyiqli qaz kəməri üçün -*0,1 MPa* - dək);

$t_q$ - qazın temperaturu, *°C.*

*(k)* düzəliş əmsalı üfürülmənin başa çatma vaxtının dəqiq təyin edilməsinin texniki çətinliyi ilə əlaqədar qazın real artımını nəzərə alır. İstismarçı müəssisənin texniki təchizatı və heyətin ixtisasından asılı olaraq, həmin əmsal *(k)* azala bilər (məsələn: qazın tərkibində havanın mövcudluğunun ekspress analizi üçün səyyar qazanalizatorlardan istifadə edilərsə).

**4. Xarici qaz kəmərlərinin ayrı-ayrı hissələrinin və avadanlıqların ayrılması ilə hermetikliyinin pozulması və sonradan üfürülməsi ilə yerinə yetirilən təmir işlərinə qaz sərfi necə hesablanır?**

Avadanlıqların və qaz kəməri hissələrinin hermetikliyinin pozulması ilə plan üzrə təmir işlərinin aparılmasında qaz sərfi *($Q_h$, $m^3$)* avadanlıq və kəmərdən qazın çıxarılmasına, həmçinin onların sonradan üfürülməsi və doldurulmasına qaz sərflərinin cəmindən ibarətdir. Bu qaz sərfi aşağıdakı düsturun köməyi ilə hesablanır:

$$\mathbf{Q_h} = \frac{\mathbf{0,0029 \cdot (1 + k) \cdot V \cdot (P_a + P_q)}}{\mathbf{273} + \boldsymbol{t_q}}$$

***(düstur №3)***

burada *0,0029* - empirik əmsal;

*V* - üfürülən qaz kəməri və avadanlığın daxili həcmi, $m^3$

*k* - düzəliş əmsalı, *1,25- 1,30;*

$P_a$ - atmosfer təzyiqi, *(1 aim=101325 Pa);Pa*

$P_q$ - *üfürülmə vaxtı qaz kəmərində qazın izafi təzyiqi, Pa (aşağı təzyiqli qaz kəməri üçün - işçi, orta və yuxarı təzyiqli qaz kəməri üçün* -0,1 MPa - *dək);*

$t_q$ - qazın temperaturu, *°C.*

**5. Yeni tikilən xarici qaz kəmərlərinin fəaliyyətdə olan mövcud qaz kəmərlərinə qoşulmasına qaz sərfi necə hesablanır?**

Yeni tikilən xarici qaz kəmərlərinin təzyiq altında olan mövcud qaz kəmərlərinə qoşulması adətən istehlakçıların təbii qaz təchizatının dayandırılması və ya kəmərdə qaz təzyiqinin təhlükəsizlik qaydalarına uyğun olaraq müvafiq göstəricilərədək azaldılması ilə yerinə yetirilir. Bu halda yeni qoşulan qaz kəmərlərinin üfürülməsinə qaz sərfi ***2 nömrəli*** düsturun, mövcud qaz kəmərlərindən qazın çıxarılması, həmçinin onların sonradan doldurulması və üfürülməsinə qaz sərfi isə ***3 nömrəli*** düsturunun köməyi ilə hesablanır.

Mövcud qaz kəmərinə bir neçə kəmər qoşularsa, onların üfürülməsinə ümumi qaz sərfi aşağıdakı düstur ilə hesablanır:

$$\mathbf{Q_y} = \sum_{\boldsymbol{i}=\mathbf{1}}^{\boldsymbol{n}} \mathbf{Q}_{\boldsymbol{i}}$$

***(düstur №4)***

burada $Q_y$ - yeni qoşulan kəmərlərin üfürülməsinə ümumi qaz sərfi, $m^3$;

$Q_i$ - $i$ saylı kəmərin üfürülməsinə qaz sərfi, $m^3$ (düstur 2-in köməyi ilə hesablanır);

$n$ - veni qoşulan kəmərlərin sayı, *ədəd.*

**6. İstismara qəbul edilən QTM, QTŞ, QTQ-lərin qaz avadanlıqları, digər texnoloji avadanlıqların sazlanması və tənzimlənməsinə qaz sərfi necə hesablanır?**

Yeni qaz avadanlıqları istismara qəbul edilərkən onların sazlanması və tənzimlənməsinə (əgər sazlanma və tənzimlənmə işləri üçün üfürmə şamından istifadə edilərsə) qaz sərfi ($Q_{tən}$, $m^3$) aşağıdakı düsturun köməyi ilə hesablanır:

$$Q_{tən.} = \frac{\mathbf{9,24 \cdot d^2 \cdot \tau \cdot (P_q \ / \ \rho)^{0,5} \cdot (P_{a+}P_q)}}{\mathbf{273 + t_q}}$$

***(düstur №5)***

burada $d$ - üfürülmə şamının daxili diametri, *m;*

$\tau$ - tənzimlənmə və sazlanmanın müddəti, *st;*

$\rho$ - qazın sıxlığı, $kq/m^3$;

$P_a$ - atmosfer təzyiqi, *(1 atm= 101325 Pa);Pa;*

$P_q$ - qaz kəmərində qazın izafi təzyiqi, *Pa;*

$t_q$ - qazın temperaturu, *°C.*

**7. İstismarda olan QTM, QTŞ, QTQ-lərdə təmir-profilaktika işlərinin yerinə yetirilməsinə qaz sərfi necə hesablanır?**

QTM, QTŞ, QTQ-lərin istismarı zamanı avadanlıq və cihazların hermetikliyinin pozulması ilə təmir və profilaktika işlərinin yerinə yetirilməsinə ehtiyac yaranır. QTM, QTŞ, QTQ avadanlıqlıqlarının üfürülməsi və verilmiş rejimə nizamlanması zamanı atmosferə atılan qazın miqdarı ($Q_{av.üf,}$ q/s) aşağıdakı düsturun köməyi ilə hesablanır:

$$\mathbf{Q_{av.üf}} = \mathbf{2,5 \cdot d^2} \cdot \frac{\mathbf{P_{a+}P_q}}{\mathbf{273 + t_q}} \cdot \sqrt{\boldsymbol{P_q \cdot \rho}}$$

***(düstur №6)***

burada $d$ - şamın diametri, *m*, (üfürülmənin yerinə yetirilməsi üçün);

$\rho$ - qazın sıxlığı, $kq/m^3$;

$P_a$ - atmosfer təzyiqi, *Pa (1 atm= 101325 Pa);*

$P_q$ - qaz kəmərində qazın izafi təzyiqi, *Pa;*

$t_q$ - qazın temperaturu, *°C.*

Üfürülmə vaxtı təxminən *0,2 - 0,5 st* davam edir.

Qaz sərfinin ölçü vahidi *"q/s " (1 q/s = 0,001 kq/s).* Qaz sərfinin ($Q_{av.üf}$) *q/s-dən* ($Q^{1}_{av.üf}$) *$m^3$-ə* çevrilməsi düsturu:

$$\mathbf{Q^{1}_{av.üf}} = \frac{\mathbf{0,001 \cdot Q_{avüf} \cdot \tau}}{\boldsymbol{\rho}}$$

***(düstur №7)***

burada *0,001* - qramdan kiloqrama keçid əmsalı;

$\tau$ - qazın sızma müddəti, *s;*

ρ - qazın sıxlığı, *kq /$m^3$*.

**8. Qoruyucu-atqı klapanların (QAK) iş qabiliyyətinin yoxlanılması və sazlanmasına qaz sərfi necə hesablanır?**

QAK-ların iş qabiliyyətinin yoxlanılmasına qaz sərfi hər bir qurğunun konkret buraxıcılıq qabiliyyəti və texnoloji əməliyyata (yoxlamaya) sərf olunan vaxta uyğun təyin olunur.

QAK-ların iş qabiliyyətinin yoxlanılmasına qaz sərfi aşağıdakılardan ibarətdir:

- klapanın sazlanmasına sərf olunan qaz sərfi;
- klapanın iş qabiliyyətinin yoxlanmasına qaz sərfi.

QAK-ların sazlanmasına qaz sərfi ($Q^{s}_{kl}, m^3$) aşağıdakı düsturun köməyi ilə hesablanır:

$$\boldsymbol{Q^{s}_{kl} = Q \cdot \tau / 60}$$

***(düstur №8)***

burad *Q* - QPS, QTM (QTŞ, QTQ) və ya onların hər hansı bir xəttinin saatlıq məhsuldarlığı, *$m^3$/st;*

τ - qoruyucu klapanın sazlanma vaxtı, *dəq;*

*60* - saatı dəqiqəyə çevirmək üçün əmsal.

Qoruyucu klapanın iş qabiliyyətinin yoxlanılmasına qaz sərfi ($Q^{iş}_{kl}, m^3$) aşağıdakı düsturun köməyi ilə hesablanır:

$$\mathbf{Q^{iş}_{kl}} = \mathbf{37,3} \cdot \boldsymbol{F_{kl} \cdot K_{kl} \cdot P \cdot \sqrt{\frac{Z}{T}} \cdot \tau_{kl} \cdot n}$$

***(düstur №9)***

burada $F_{kl}$ - klapanın en kəsik sahəsi, $m^2$;
$K_{kl}$ - klapanın qaz sərfi əmsalı (pasport göstəricilərinə uyğun qəbul edilir);
$P$ - işçi təzyiq, $MPa$;
$Z$ - qazın sıxılma əmsalı;
$T$ - işçi temperatur, $K$;
$\tau_{kl}$ - qoruyucu klapanın işləmə müddəti, $s$;
$N$ - hesabat dövründə qoruyucu klapanın yoxlanma sayı;
$37{,}3$ - empirik əmsal, $m \cdot K^{0{,}5}/MPa \cdot s$.

Giriş təzyiqindən asılı olaraq QAK-ların buraxıcılıq qabiliyyəti haqqında məlumatlar cədvəl 1 - də verilir.

"ПСК - 50” tipli QAK-ın buraxıcılıq qabiliyyəti

Cədvəl 1

| Qaz kəmərində (klapanadək), Pa | Təzyiqlərə (Pa) uyğun qaz atqısı, $m^3/st$ | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|
| | 1000 | 2000 | 3000 | 4000 | 2000 | 3000 | 40000 | 50000 |
| 1500 | 0.03 | - | - | - | - | - | - | - |
| 2000 | 6.9 | - | - | - | - | - | - | - |
| 2500 | 27.0 | 0.5 | - | - | - | - | - | - |
| 3000 | 55.8 | 3,8 | - | - | - | - | - | - |
| 3500 | 77.0 | 31.0 | 0.18 | - | - | - | - | - |
| 4000 | 93.9 | 64,8 | 2,9 | - | - | - | - | - |
| 5000 | 111.0 | 101,4 | 54,3 | 0,8 | - | - | - | - |
| 20000 | - | - | - | - | 0,49 | - | - | - |
| 25000 | - | - | - | - | 12.4 | - | - | - |
| 30000 | - | - | - | - | 58,3 | - | - | - |
| 32500 | - | - | - | - | 75,0 | 0,26 | - | - |
| 35000 | - | - | - | - | 125,0 | 7,0 | - | - |
| 40000 | - | - | - | - | 225.0 | 34,5 | - | - |
| 42500 | - | - | - | - | 250.0 | 60,0 | 0,26 | - |
| 45000 | - | - | - | - | 285,0 | 100,0 | 5,3 | - |
| 50000 | - | - | - | - | 350,0 | 212.5 | 32,3 | - |
| 52000 | - | - | - | - | 370,0 | 235,0 | 50,0 | 1,03 |
| 55000 | - | - | - | - | 400.0 | 290.0 | 100,0 | 9,6 |
| 60000 | - | - | - | - | 450.0 | 368,0 | 226,0 | 47,5 |
| 75000 | - | - | - | - | 625,0 | 480,0 | 430,0 | 325,0 |
| 100000 | - | - | - | - | 850,0 | 745,0 | 670,0 | 580,0 |

**9. Məişət qaz avadanlıqlarının istismara qəbul edilməsi zamanı sazlanma işlərinə qaz sərfi necə hesablanır?**

Qaz sərfi ($Q_{m.a}$, $m^3$) aşağıdakı düstur ilə hesablanır:

$$\mathbf{Q_{m.a} = \sum_{i}^{n} Q_{m.a.f} \cdot N_i}$$

***(düstur №10)***

burada $Q_{m.a}$ - vahid qaz avadanlığının tənzimlənib sazlanmasına qaz sərfinin fərdi norması, *m³/ədəd,* cədvəl 2 üzrə təyin olunur;

$N_i$ - eyni növdən olan qaz avadanlıqlarının sayı, *ədəd.*

Cədvəl 2

| Qaz avadanlığının növü | Qaz avadanlığının tənzimlənib sazlanmasına qaz sərfinin fərdi norması, $Q_{m.a.f}$,$m^3$ /ədəd |
|---|---|
| Qaz plitəsi | 1,0 |
| Axarlı su qızdırıcı | 1,0 |
| Tutumlu su qızdırıcı və ya istilik | 1,5 |
| Qızdırıcı məişət qaz sobasının odluğu | 1,0 |

**10. Məişət qaz avadanlıqlarının istismara qəbul edilməsi zamanı daxili qaz kəmərinin boşaldılması və sonradan doldurulmasına qaz sərfi necə hesablanır?**

Qaz sərfi *($Q_k$, $m^3$)* aşağıdakı düstur ilə hesablanır:

$$\mathbf{Q_k = \sum_{i}^{n} Q_{k.f} \cdot L_i}$$

***(düstur №11)***

Burada $Q_{k.f}$ - məişət qaz avadanlıqlarının istismara qəbul edilməsi zamanı *i* saylı qaz kəmərinin boşaldılması və sonradan doldurulmasına qaz sərfinin fərdi norması, *$m^3$/m,* cədvəl 3 üzrə təyin olunur;

$L_i$ - təmir olunan *i* saylı qaz kəmərinin uzunluğu, *m.*

Cədvəl 3

| Qaz kəmərinin diametri, mm | *i* saylı qaz kəmərinin boşaldılması və sonradan doldurulmasına qaz sərfinin fərdi norması, $Q_{k.f}$ , $m^3/m$ |
|---|---|
| 10 | 0,0001 |
| 15 | 0,0002 |
| 20 | 0,0004 |
| 25 | 0,0007 |
| 32 | 0,0011 |
| 40 | 0,0017 |
| 50 | 0,0026 |

**11. Qazpaylayıcı şəbəkələrdə texniki qaz itkilərinə nələr aiddir?**

Qazpaylayıcı şəbəkələrdə qaz itkiləri iki növə bölünür:

- həqiqi itkilər.
- gizli itkilər.

İstehlakçı tərəfindən istifadə edilən, lakin qaz sərfinin uçotu üsullarının mükəmməl olmamasına görə nəzərə alınmayan (buna görə də dəyəri ödənilməyən) qaz sərfi "gizli itkilərə" aiddir.

"Gizli itkilər" (həm qazpaylayıcı müəssisə, həm də istehlakçı üçün) qaz sayğacların xətası hesabına yarana bilər. Minimal ölçü xətası olan qaz sayğaclarından istifadə etməklə "gizli itkilər'in real azalmasına nail olmaq mümkündür.

"Gizli itkilərə" aşağıdakılar daxildir:

- sayğacların pasport xətası hesabına yaranan qaz itkiləri;
- qazın həcminin ölçülməsi zamanı sayğaclarda temperatur və təzyiqin nəzərə alınmamasına görə qaz itkiləri.

"Həqiqi itkilərə" aşağıdakılar daxildir:

- xarici qaz kəmərləri və avadanlıqlarının qeyri-hermetikliyi nəticəsində yaranan qaz itkiləri;
- qoruyucu - atqı klapanlarının işə düşməsi nəticəsində yaranan qaz itkiləri;
- xarici qaz kəmərlərində baş vermiş qəza nəticəsində yaranan qaz itkiləri.

**12. Xarici qaz kəmərləri və avadanlıqlarının qeyri-hermetikliyi nəticəsində yaranan qaz itkilərinin hesablanması necə aparılır?**

Qaz kəmərləri və onların üzərində quraşdırılmış armatur və avadanlıqların qeyri-hermetikliyinə görə qrunta, atmosferə və ya tikililərə qaz sızması nəticəsində texnoloji qaz itkiləri yaranır. Bağlayıcı armatur, qaz avadanlığının yiv və flans birləşmələrinin mütləq hermetikliyinin yaradılması mümkün olmadığına görə bu qaz itkiləri (qaz sızmaları) qaçılmazdır.

Flans və yiv birləşmələrinin qeyri-hermetikliyinə görə yaranan qaz itkiləri *($Q_h$, q/s)* aşağıdakı düsturun köməyi ilə hesablanır:

$$Q_h = 3{,}57 \cdot 0{,}278 \cdot 10^{-5} \cdot \eta \cdot P_{or} \cdot m \cdot V \cdot \sqrt{\frac{M}{T}}$$

***(düstur №12)***

burada *3,57* - empirik əmsal, $\frac{s^{0,5} \cdot sm^2}{m^3}$;

*0,278* - *kq/st* - dan *q/s* - yə keçid əmsalı;

$\eta$ - ehtiyat əmsalı, $P_{or} \geq 2\text{-}10^5$ *Pa* olduqda, $\eta$ = 2 qəbul olunur;

$0{,}02\text{-}10^5$ *Pa* $\leq P_{or} \leq 2 \cdot 10^5$ *Pa* olduqda, $\eta$ = 1,5 qəbul olunur, $P_{or} \leq 0{,}02 \cdot 10^5$ *Pa* olduqda qaz sızması cüzidir, $\eta$ = 0 qəbul olunur.

$P_{or}$ - sistemdə orta təzyiq. *Pa;*

*m* - sistemdə təzyiqin düşməsini xarakterizə edən qeyri-hermetiklik əmsalı, *1/st,* qaz kəmərinin şərti diametri $d_ş$ *>250 mm* olduqda *m* əmsalı $k=250/d_ş$ düzəliş əmsalına vurulur;

*V* - qaz kəmərinin həcmi, $m^3$ (bağlayıcı qurğular arası);

*M* - qazın molekul çəkisi, *kq/kmol*;

*T* - qazın mütləq temperaturu, *K*

Flans və yiv birləşmələrinin qeyri-hermetikliyinə görə yaranan qaz itkilərinin ölçü vahidi *"q/s" (1 q/s = 0,001 kq/s).* Qaz itkisinin ($Q_h$,) *q*/s-dən ($Q_h^1$) $m^3$-*ə* çevrilməsi üçün aşağıdakı düsturdan ***(düstur №7)*** istifadə edilməlidir.

$$\mathbf{Q^1_{av.üf}} = \frac{\mathbf{0{,}001 \cdot Q_{avüf} \cdot \tau}}{\boldsymbol{\rho}}$$

**13. Qoruyucu-atqı klapanların (QAK) işə düşməsi nəticəsində yaranan qaz itkilərinin hesablanması necə aparılır?**

Bu itkilər klapanın tipi, diametri, klapanadək olan təzyiqdən asılıdır və aşağıdakı düsturun köməyi ilə hesablanır *($Q_{QAK}$, $M^3$):*

$$Q_{QAK} = 63 \cdot p \cdot t \cdot d$$

***(düstur №13)***

burada $63$ - sərf əmsalı, $m^3/st \cdot atm.sm$;
$P$ - klapanadək qazın təzyiqi, $kqq/sm^2$
$d$ - klapanın diametri, *sm;*
$t$ - klapanın işə düşməsinin yoxlanılma müddəti (1-2 saniyə).

**14. Xarici qaz kəmərlərinin qaz itkilərinin səbəbləri hansılardır və hesablanması necə həyata keçirilir?**

Qaz kəmərlərində qəzaların əsas səbəbləri:

- qaynaq birləşmələrində çatın əmələ gəlməsi;
- müxtəlif maşın və mexanizmlər tərəfindən mexaniki zədələnmələr;
- qaz kəmərlərinin korroziya uğraması.

Qaz kəmərlərinin zədələnməsi və korroziya uğraması zamanı qaz itkiləri yaranan dəliyin ölçülərinə və kəmərdəki təzyiq göstəricilərinə uyğun hesablanır.

**15. Qaz kəmərlərinin qaynaq birləşmələrində çat olduqda qaz itkilərinin hesablanması necə aparılır?**

Qaz kəmərlərinin qaynaq birləşmələrində çat olduqda atmosferə sızan qazın həcmi *($Q_{q.t.}$, q/s)* aşağıdakı düsturun köməyi ilə hesablanır:

$$Q_{T.Q} = \varphi \cdot f \cdot C \cdot \rho_q \cdot 1000$$

***(düstur №14)***

*Burada* $\varphi$ - sürətin azalmasını nəzərə alan əmsal, *0,97* qəbul edilir;
$f$ - çatın sahəsi aşağıdakı düsturun köməyi ilə hesablanır

$$f = n \cdot \pi \cdot d \cdot \delta$$

***(düstur №15)***

$n$ - borunun xarici perimetrində dağılmış xəttin uzunluğu, ümumi perimeirdən %- lə qəbul edilir;

$d$ - qaz kəmərinin diamctri, $m$;

δ - çatın eni, $m$.

Qaz kəmərinin qaynaq tikişinin çatından qazın çıxma sürəti (C, *m/s)* kritik sürətə bərabərdir və aşağıdakı düsturun köməyi ilə hesablanır:

$$C = 20{,}5\sqrt{\frac{T_0}{\rho_{o.q}}}$$

***(düstur №16)***

burada $T_o$ - qaz kəmərində mütləq temperatur, *K;*

$\rho_{o.q}$ - normal şəraitdə qazın sıxlığı, $kq/m^3$.

Qaz kəmərində çatın önündə qazın sıxlığı ($\rho_q$, $kq/m^3$) aşağıdakı düsturun köməyi ilə hesablanır:

$$\rho_q = \frac{T_1}{T_0} \cdot \frac{P_0}{P_1} \cdot \rho_{o.q}$$

***(düstur №17)***

*burada* $T_1$ - ətraf mühitin mütləq temperaturu, K;

$T_o$ - qaz kəmərində qazın mütləq temperaturu, K;

$P_0$ - qaz kəmərinin qaynaq tikişi yerində mütləq təzyiq, *Pa;*

$P_1$ - mütləq təzyiq, *Pa*.

Hesablamalarda $P_1$ = 101325 Pa qəbul olunur.

Qaz kəmərində əmələ gələn çatdan qaz itkisinin ölçü vahidi "*q/s" "q/s"*-nin *"$m^3$"*- ə çevrilməsi üçün aşağıdakı düsturdan ***(düstur №7)*** istifadə edilməlidir.

$$\mathbf{Q^1_{av.üf}} = \frac{\mathbf{0{,}001 \cdot Q_{avüf} \cdot \tau}}{\boldsymbol{\rho}}$$

**16. Qaz kəmərinin tam açılması (qırılması) nəticəsində yaranan qaz itkilərinin hesablanması necə aparılır?**

Qaz kəmərlərinin tam açılması (qırılması) zamanı təbii qaz itkisi qırılan yerin en kəsiyindən və qırılma yerinin önündə izafi təzyiqdən asılı olaraq təyin olunur. Qazın təzyiqi 5 – 90 kPa həddində olarsa, qaz sərfi ($Q_{t.a.}$,$m^3/st$) aşağıdakı düsturla hesablanır:

$$Q_{t.a} = 555 \cdot f \cdot P_0 \sqrt{\frac{1}{\rho_o \cdot T_o}\left[\left(\frac{P_1}{P_0}\right)^{1,54} - \left(\frac{P_1}{P_0}\right)^{1,77}\right]} \cdot \varphi$$

***(düstur №18)***

burada $f$ - qırılan yerin en kəsik sahəsi, $m^2$;

$P_0$ - qırılma yerinin ğnündə qazın mütləq təzyiqi, *Pa;*

$P_1$ - qırılma yerindən çıxanda qazın mütləq təzyiqi, *Pa;*

$\rho_o$ - normal şəraitdə qazın sıxlığı, $kq/m^3$;

$T_0$ - qırılma yerinin önündə qazın mütləq temperatoru, *K;*

$\varphi$ - sürətin azalma əmsalı, *0,97* qəbul edilir.

Qırılma yerinin önündə qazın təzyiqi 90 kPa-dan artıq olarsa axmanın kritik şəraiti başlayır. Bu halda qaz sərfi ($Q_{t.a.}$,$m^3/st$) aşağıdakı düsturla hesablanır:

$$Q_{t.a} = \frac{124 \cdot P_0 \cdot f}{\sqrt{T_0 \cdot \rho_0}} \cdot \varphi$$

***(düstur №19)***

Qaz itkisinin ölçü vahidi $m^3/st$. Qaz itkisinin ($Q_{t.a.}$,$m^3/st$) *-dan* ($Q_{t.a.}$,$m^3$) - *ə* çevrilməsi düsturu:

$$Q^1_{t.a} = Q_{t.a} \cdot \tau$$

***(düstur №20)***

burada $\tau$ - qazın boşalma müddəti, *st.*

**17. Qaz kəmərində əmələ dəliklərdən qaz itkilərinin hesablanması necə aparılır?**

Qaz kəmərində əmələ gələn dəliklərdən qaz itkisi *($Q_d$, kq/s)* aşağıdakı düsturla hesablanır:

$$Q_d = f \cdot C$$

***(düstur №21)***

burada $f$ - dəliyin sahəsi, $m^2$;

$C$ - qaz sızmasının kütlə sürəti, $kq/(m^3/s)$.

Sızma yerində qazın kritik kütlə sürəti *(C, $kq/(m^s/s)$)* aşağıdakı düsturla hesablanır:

$$C = \lambda \cdot \sqrt{2 \cdot g \cdot P_0 / V_0}$$

***(düstur №22)***

burada $\lambda$ - qaz sərfinin surət xarakteristikası;

$g$ - sərbəstdüşmə təcili, $9{,}81\ m/san^2$;

$P_0$ - qəza baş verən sahədə qazın qəzadan əvvəl başlanğıc təzyiqi, $kqq/sm^2$;

$V_0$ - qazın ilkin xüsusi həcmi, $m^3/kq$.

$$\lambda = B/2\sqrt{n \cdot (n+1)}$$

***(düstur №23)***

burada $B$ - təzyiqlər nisbəti $P_{kr}/P_0$;

$P_{kr}$ - kritik təzyiq, $kqq/sm^2$;

$n$ - politropa göstəricisi $n = 1{,}3$.

$$\mathrm{B} = \frac{\mathrm{P_{kr}}}{\mathrm{P_0}} = \left(\frac{2}{n+1}\right)^{\frac{n}{n-1}} = \left(\frac{2}{1{,}3+1}\right)^{\frac{1{,}3}{1{,}3-1}} = 0{,}5457$$

***(düstur №24)***

$$\lambda = \frac{0{,}5457}{2 \cdot \sqrt{1{,}3 \cdot (1{,}3 + 1)}} = 0{,}4718$$

***(düstur №25)***

Qazın ilkin xüsusi həcmi $V_0$ *($m^3/kq$)* aşağıdakı düsturla hesablanır:

$$V_0 = \frac{\bar{R}}{M} \cdot \frac{T}{P}$$

***(düstur №26)***

burada $\bar{R}$ - universal qaz sabiti. *847,84;*

$M$ - qazın molekul çəkisi;

$T$ - qazın temperaturu, *K*.

$P$ - qəzadan sonra kəmərdə qazın təzyiqi, *$kqq/sm^2$*.

Qəza nəticəsində yaranan dəliyin diametri kiçik, sızma vaxtı az olduqda $P = P_0$.

$$M = \sum_{1}^{k} M_k \cdot r_k$$

***(düstur №27)***

burada $M_k$ - qaz qarışığında komponentlərin molekul çəkisi *(cədvəl 4);*

$r_k$ - qarışıqda qazın faizlə miqdarı *% - lə.*

Qaz itkisinin *($Q_d$, kq/s)* - dən ($Q_d^1$ *$m^3$*) çevrilməsi düsturu:

$$Q_d^1 = \frac{Q_d \cdot \tau}{\rho}$$

***(düstur №28)***

burada $\tau$ - qazın sızma müddəti, *s*;

$\rho$ - qazın sıxlığı, *$kq/m^3$*.

### 18. Sayğacların pasport xətası hesabına yaranan qaz itkilərinin hesablanması necə aparılır?

Sayğacların pasport xətası hesabına yaranan qaz itkiləri aşağıdakı düsturun köməyi ilə hesablanır:

$$Q = 0{,}011 \cdot \left(\frac{S_1}{\sqrt{n_1}} \cdot V_1 + \frac{S_2}{\sqrt{n_2}} V_2 + \cdots\cdots \frac{S_i}{\sqrt{n_i}} \cdot V_i\right)$$

***(düstur №29)***

burada 0,011 - empirik əmsal, qazın temperatur və təzyiq göstəricilərinin qeydiyyatında ola bilən xətaları nəzərə alır;

$n_1\ n_2,..n_i$ - hesabat dövründə (ay, il) qaz sərfi ölçmələrinin sayı, həmin dövrdə sayğac göstəricilərinin qeydiyyat saylarının eyni tipli sayğacların sayına vurulması ilə təyin edilir;

$S_1, S_2,..S_i$ - sayğacların xətası, %, pasport göstəricilərinə uyğun qəbul edilir;

$V_1, V_2\ V_i$ - hesabat dövründə eyni tipli sayğaclarla ölçülən qaz həcmi, $m^3$.

**Təbii qazların ayrı-ayrı komponentlərinin fiziki xüsusiyyətləri (Azərbaycan Respublikası üzrə)** **Cədvəl 4**

| | Göstəricilər | Metan | Etan | Propan | İzo-butan | Butan | İzo-pentan | Pentan | İzo-heksan | Karbon dioksid | Oksigen | Azot |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| 1 | 2 | 3 | 4 | 5 | 6 | 7 | 8 | 9 | 10 | 11 | 12 | 13 |
| 1 | Kimyəvi formul | $CH_4$ | $C_2H_6$ | $C_3H_8$ | $C_4H_{10}$ | $C_4H_{10}$ | $C_5H_{12}$ | $C_5H_{12}$ | $C_6H_{14}$ | $C0_2$ | $O_2$ | $N_2$ |
| 2 | Qazın tərkibi (həcmi üzrə), % | 91,80 | 2,86 | 1,23 | 0,27 | 0,38 | 0,14 | 0,10 | 0,05 | 2,74 | 0,20 | 0,23 |
| 3 | Qazın sıxlığı 0°C və 0,1013 M Pa,<br>20 °C və 0,1013 M Pa, | 0,1768<br>0,6687 | 1,356<br>1,264 | 2,01<br>1,872 | 2,703<br>2,519 | 2,673<br>2,491 | 3,457<br>3,228 | 3,457<br>3,228 | 3,84<br>3,583 | 1,9768<br>1,8423 | 1,429<br>1,3314 | 1,2505<br>1,1651 |
| 4 | Qazın havaya görə nisbi sıxlığı, Δρ, 0°C | 0,555 | 1,049 | 1,554 | 2,067 | 2,091 | 2,674 | 2,674 | 2,974 | 1,5291 | 1,1053 | 0,9673 |
| 5 | 0°( və 0,1013 M Pa aşağı yanma istiliyi, kCo.ıl/$m^3$ | 35880 | 64430 | 92930 | 121750 | 123683 | 146230 | 146230 | 171790 | - | - | - |
| 6 | Molekul çəkisi, kq/kmol | 16.043 | 30,07 | 44,097 | 58,124 | 58,124 | 72,151 | 72,151 | 86,172 | 44,01 1 | 32.0 | 28,016 |

Qaz sərfinin ölçülməsi zamanı sayğaclarda temperatur və təzyiq göstəricilərinin nəzərə alınmamağına görə yaranan qaz itkilərinin hesablanması necə aparılır?

Qazpaylayıcı müəssisələr təchizatçıdan standart şəraitə uyğunlaşdırılmış qaz almalıdır *(t = 20°C, P=760 mm c. süt.).*
Qaz təchizatında real şərait standart şəraitdən fərqlidir, bu da qazpaylayıcı müəssisələrdə itkilərin yaranmasına səbəb olur. Sayğacdan keçən qazın standart şəraitə uyğunlaşdırılması aşağıdakı düsturun köməyi ilə ilə yerinə yetirilir:

$$V_{st} = V_1 \cdot \frac{293{,}15 \cdot (P_s + P_a)}{760 \cdot (273 + t_s)}$$

***(düstur №30)***

burada $V_{st}$ - standart şəraitə uyğunlaşdırılmış qaz həcmi, $m^3$;
$V_1$ - qazın ölçülmüş (sayğacdan keçmiş) həcmi, *m;*
$P_s$ - sayğacın daxilində və ya qaz kəmərində real (izafi) təzyiq, *mm c.sü.;*
$P_a$ - atmosfer təzyiqi, *mm c.süt.;*
$t_s$ - sayğacın daxilində və ya qaz kəmərində real temperatur, *°C.*

**19. Daraldıcı ucluqdan və ya sabit en kəsiyə malik ucluqdan xarici mühitə axan qaz sərfinin hesablanması necə aaparılır?**

Müxtəlif konstruksiyalı ucluqlardan (soplo) keçən qaz həcmi ($Q$, $m^3/st$) aşağıdakı düsturun köməyi ilə hesablanır:

$$Q = 3600 \cdot f \cdot C$$

***(düstur №31)***

burada f - ucluğun deşiyinin en kəsik sahəsi; $m^2$

$$f = \frac{\pi \cdot d^2}{4}$$

***(düstur №32)***

$d$ - ucluğun deşiyinin daxili diametri, *m;*

*C* - qaz kəmərində qazın sürəti, *m/s*

$$C = \varepsilon \cdot \sqrt{2 \cdot g \cdot \frac{\Delta P}{\gamma}}$$

***(düstur №33)***

burada $g$ - sərbəst düşmə təcili, $g = 9{,}81\ m/s^2$;

$\Delta P$ - ucluğun qarşısında təzyiq düşküsü, *mm.su süt;*

$\gamma$ - qazın xüsusi çəkisi (sıxlığı), $kq/m^3$;

$\varepsilon$ - qaz kəmərlərində yerli müqavimət əmsalı.

Qaz itkisinin "$m^3/st$"-dan "$m^3$"-ə çevrilməsi üçün $Q^1_{t.a} = Q_{t.a} \cdot \tau$ düsturundan **(№20)** istifadə edilməlidir.

Qaz axınının istiqaməti və sürətinin dəyişməsi yerli müqavimətlər adlanır. Yerli müqavimətlər təzyiq düşküsünə səbəb olur. Yerli müqavimətlərin mənbələri aşağıdakılardır: qaz kəmərinin bir diametrindən digər diametrinə keçidlər, qol, dirsək, üçboğaz, qoruyucu, tənzimləyici və s. Yerli müqavimət əmsalının kəmiyyəti isə eksperimental yolla təyin edilir. Ən geniş yayılan növləri üçün $\varepsilon$ əmsalı aşağıdakı qaydada verilir.

*a)*




*a)* boru kəmərinə qaz, diafraqma və ya tordan keçdikdə müoavimət əmsalı $\varepsilon$ aşağıdakı düstur ilə hesablanır:

$$\varepsilon = (1{,}71\frac{f_2}{f_1} - 1)^2$$

***(düstur №34)***

*b)*




*b)* boru kəmərinin çıxışında müqavimət əmsalı $\varepsilon = 1{,}0$

*c)*




*c)* boru kəmərindən qaz diafraqma və ya tordan çıxarsa, müqavimət əmsalı $\varepsilon$ aşağıdakı düstur ilə hesablanır:

$$\varepsilon = \left( \frac{f_2}{f_1} + 0{,}71\,\frac{f_2}{f_1}\sqrt{\frac{f_1}{f_2}} \right)^2 \qquad (35)$$

***(düstur №35)***




*d)* qaz boru kəmərinin daxilində yerləşən diafraqma və ya tordan çıxarsa, müqavimət əmsalı $\varepsilon$ aşağıdakı düstur ilə hesablanır:

$$\varepsilon = \left(\frac{f_2}{f_1} - 1 + 0{,}71\frac{f_2}{f_1}\sqrt{1 - \frac{f_1}{f_2}}\right)^2$$

***(düstur №36)***

burada $f_1$ - diafraqma və ya torun en kəsik sahəsi;
$f_2$ - borunun en kəsik sahəsi.




*e)* boru kəmərindən qaz qapaq altına çıxanda, müqavimət əmsalı $\varepsilon = 0{,}65$.

## III BÖLMƏ
## ƏMƏYİN MÜHAFİZƏSİ VƏ TƏHLÜKƏSİZLİK TEXNİKASI HAQQINDA
## I FƏSİL
## ÜMUMİ MÜDDƏALAR

**1. Əməyin mühafizəsini idarə etməyin vahid sisteminin hüquqi və normativ əsasları hansılardır?**

Əməyin mühafizəsinin hüquqi və normativ əsasını aşağıdakılar təşkil edir:

- Azərbaycan Respublikasının Konstitusiyası (12 noyabr 1995-ci il).
- Azərbaycan Respublikasının Əmək Məcəlləsi (2001-ci il).
- Əməyin mühafizəsi məsələləri üzrə Azərbaycan Respublikası Prezidentinin və Nazirlər Kabinetinin Fərman, Qərar və Sərəncamları.
- “Texniki Təhlükəsizlik haqqında”, “Qaz təchizatı haqqında”, “Yanğın Təhlükəsizliyi haqqında”, “Nəqliyyat haqqında” və digər müvafiq Qanunlar
- Hüquq mühafizə və Dövlət nəzarəti orqanlarının qərarları və qətnamələri;
- Təhlükəsizlik qayda, norma və standartları;
- SOCAR-ın və “Azəriqaz” İB-nin Nizamnaməsi və Əsasnaməsi, eləcə də əmr, sərəncam və göstərişləri;
- Təşkilati-metodik və rəhbər sənədlər.

**2. Vətəndaşların konstitusiya ilə müəyyən edilmiş hüquqları hansılardır?**

Əmək hüququ, təhlükəsiz və sağlam ətraf mühitdə yaşamaq hüququ, sağlamlığın qorunması hüququ, ətraf mühitin qorunması hüququ.

**3. Azərbaycan Respublikasının Əmək Məcəlləsində əməyin mühafizəsi ilə bağlı hansı müddüalar əks olunmuşdur?**

Azərbaycan Respublikasının Əmək Məcəlləsinin IX bölməsi əməyin mühafizəsi məsələlərinə həsr olunmuşdur. Bu bölmədə olan 33 maddənin hər biri əməyin mühafizəsi ilə bağlı müəyyən məsələlərə həsr olunmaqla aşağıdakı müddüaları əks etdirir.

- Əməyin mühafizəsi normaları, qaydaları və prinsipləri

- Əməyin mühafizəsinin hüquqi, təşkilati-texniki və maliyyə təminatı
- İşçinin əməyin mühafizəsi hüququnun həyata keçirilməsi üçün təminatlar
- Əməyin mühafizəsi normalarına və qaydalarına əməl olunmasına nəzarət və işəgötürənin məsuliyyəti.

**4. Əməyin mühafizəsi sahəsinə əsasən nələr aiddir?**

Əməyin mühafizəsi - işçilərin əmək fəaliyyəti prosesində həyat və sağlamlığının təhlükəsizliyinin hüquqi, sosial-iqtisadi, təşkilati, texniki, psixofizioloji, sanitar-gigienik, müalicə profilaktik, reabilitasiya, digər tədbirlər və vəzifələr də daxil olmaqla təminatı sisteminin tələblərinin gözlənilməsidir.

**5. Texniki təhlükəsizlik tələbləri dedikdə nə başa düşülür?**

Texniki təhlükəsizlik tələbləri dedikdə "Texniki təhlükəsizlik haqqında Azərbaycan Respublikasının qanunu" ilə, Azərbaycan Respublikasının digər normativ-hüquqi aktları ilə, habelə texniki-normativ sənədlərlə müəyyənləşdirilən, mövcud qaydada qəbul olunan və texniki təhlükəsizliyi təmin edən şərtlərdən, qadağalardan, məhdudiyyətlərdən və yerinə yetirilməsi məcburi olan digər tələblərdən ibarətdir. Texniki təhlükəsizlik tələbləri dövlət standartlarına, əməyin mühafizəsi qaydalarına, habelə ekoloji və yanğın təhlükəsizliyi, ətraf mühitin mühafizəsi, sənaye və tikinti, sanitar-epidemioloji, əhalinin və ərazinin fövqəladə hallardan müdafiəsi normalarına uyğun olmalıdır.

**6. Texniki təhlükəsizlik haqqında qanunvericilik nədir?**

Texniki təhlükəsizlik haqqında qanunvericilik Azərbaycan Respublikası Konstitusiyasından, "Texniki təhlükəsizlik haqqında Azərbaycan Respublikasının qanunudan və digər normativ hüquqi aktlardan ibarətdir. Azərbaycan Respublikasının tərəfdar çıxdığı dövlətlərarası müqavilələrdə texniki təhlükəsizlik münasibətlərinin tənzimlənməsi barədə müəyyən olunmuş qaydalar bu qanunda nəzərdə tutulmuş qaydalardan fərqlənərsə, beynəlxalq müqavilələrin qaydaları tətbiq edilir.

**7. Azərbaycan Respublikası Dövlət Neft Şirkətində Əməyin mühafizəsi hansı sənədlə tənzimlənir?**

Azərbaycan Neft Sənayesində Əməyin Mühafizəsinin Vahid İdarəetmə Sistemi ilə tənzimlənir.

**8. Əməyin mühafizəsinin əsas prinsipləri hansılardır?**

Dövlət hakimiyyəti orqanları, mülkiyyətçilər, işəgötürənlər və işçilər tərəfindən əməyin mühafizəsinin təmin olunması əsasən aşağıdakı prinsiplərlə həyata keçirilir:

– dövlət hakimiyyəti orqanlarının, mülkiyyətçilərin, işəgötürənlərin və işçilərin əmək şəraitinin və əməyin mühafizəsinin yaxşılaşdırılmasına, istehsal qəzalarının, xəsarətlərinin, zədələrinin və peşə xəstəliklərinin qarşısının alınmasına yönəldilmiş fəaliyyət birliyi;
– işçinin həyatının və sağlamlığının müəssisənin istehsal fəaliyyətinin nəticələrindən üstün tutulması;
– mülkiyyət və təşkilati-hüquqi formasından asılı olmayaraq bütün müəssisələr üçün əməyin mühafizəsi sahəsində vahid tələblərin müəyyən edilməsi;
– əməyin mühafizəsinin maliyyələşdirilməsində dövlətin iştirakı;
– işçilərin xüsusi geyim və ayaqqabı, digər fərdi mühafizə vasitələri ilə, müalicə-profilaktik yeməklə və digər vasitələrlə pulsuz təmin edilməsi;
– təhsil və əlavə təhsil müəssisələrində əməyin mühafizəsi üzrə mütəxəssislərin hazırlanması və əlavə təhsili;
– istehsalatda baş vermiş hər bir bədbəxt hadisənin hökmən təhqiq edilməsi, uçota alınması, təhlil edilməsi və bunun əsasında istehsalat xəsarətlərinin, zədələrinin və peşə xəstəliklərinin vəziyyəti barədə işçilərə dürüst məlumatların verilməsi;
– istehsalatda bədbəxt hadisələrdən zərər çəkmiş və ya peşə xəstəliklərinə tutulmuş işçilərin mənafelərinin sosial, maddi və mənəvi müdafiəsi;
– həmkarlar ittifaqlarının, müəssisələrin və ayrı-ayrı fiziki, hüquqi şəxslərin əməyin mühafizəsini təmin etməyə yönəldilmiş fəaliyyətinə hərtərəfli yardım olunması;
– əməyin mühafizəsi sahəsində beynəlxalq əməkdaşlıq münasibətlərinin genişləndirilməsi.

**9. Əməyin mühafizəsi məsələləri üzrə dövlət siyasəti hansı təşkilat tərəfindən həyata keçirilir?**

Azərbaycan Respublikası Əmək məcəlləsinin 212-ci maddəsinə əsasən Əməyin mühafizəsinə dair vahid dövlət siyasəti Azərbaycan Respublikası Əmək və Əhalinin Sosial-Müdafiəsi Nazirliyi tərəfindən həyata keçirilir. Əmək və Əhalinin Sosial-Müdafiəsi Nazirliyi tərəfindən müvafiq icra orqanları (AR-nın nazirlikləri, dövlət komitələri, dövlət konsernləri, şirkətləri, idarələr) tərəfindən qəbul edilmiş norma və qaydaların əməyin mühafizəsi üzrə mövcud qanunvericiliyin tələblərinin uyğunluğuna və işəgötürənlərin əməyin mühafizəsi sahəsində qanunvericiliyin tələblərinə icra edilməsinə nəzarət edir, sağlam və təhlükəsiz əmək şəraitinin təmin edilməsinə yönəldilmiş təkliflərlə çıxış edir.

**10. Əməyin mühafizəsi sahəsində mülkiyyətçinin və işəgötürənlərin vəzifələri nədir?**

Müəssisənin mülkiyyətçisi və işəgötürəni işçilərin iş yerlərində əməyin mühafizəsi normalarının və qaydalarının yerinə yetirilməsinə bilavasitə cavabdehdirlər və aşağıdakı tədbirlərin həyata keçirilməsini təmin etməlidirlər:

- əməyin mühafizəsi üzrə standartların, normaların və qaydaların bütün tələblərinə əməl edilməsini;
- binaların, qurğuların, texnoloji proseslərin və avadanlığın təhlükəsizliyinə riayət edilməsini;
- bilavasitə iş yerlərinin sağlam sanitariya-gigiyena şəraitinin və əməyin mühafizəsinin qüvvədə olan normativlərə uyğunlaşdırılmasını;
- işçilərə lazımi sanitariya-məişət və müalicə-profilaktik xidmətinin təşkilini;
- əmək şəraiti zərərli, ağır olan və yeraltı işlərdə çalışan işçilərə pulsuz müalicəvi profilaktiki yeməklər, süd və ona bərabər tutulan digər məhsulların verilməsini;
- normal əmək və istirahət rejiminə riayət edilməsini;

- işçilərə müəyyən edilmiş müddətlərdə və tələb olunan çeşidlərdə pulsuz xüsusi geyim, xüsusi ayaqqabı və digər fərdi mühafizə vasitələrinin verilməsini;
- işçilərin əməyin mühafizəsi normaları və qaydaları üzrə təhsilinin, təlimatlandırılmasının, biliklərinin yoxlanılmasının təşkil edilməsini və əməyin mühafizəsinin təbliğini;
- kollektiv müqaviləyə əməyin mühafizəsi üzrə qaydaları daxil etməyi və onlarda nəzərdə tutulmuş öhdəliklərin yerinə yetirilməsini;
- müvafiq icra hakimiyyəti orqanının müəyyən etdiyi müddətdə və formada əməyin mühafizəsi, əmək şəraiti və onların qüvvədə olan normalara uyğunlaşdırılması üçün görülən tədbirlərin nəticələri haqqında statistik hesabatın verilməsini.

**11. Əməyin təhlükəsizliyi qaydalarını və Əmək Məcəlləsinin əmək mühafizəsinə dair qayda və normalarını pozduqlarına görə vəzifəli şəxslər hansı məsuliyyəti daşıyır ?**

Vəzifəli şəxslər ƏM norma və qaydaları pozduqlarına görə inzibati və cinayət məsuliyyətinə cəlb edilirlər;

**12. Əməyin mühafizəsi üzrə işçilərin vəzifələri hansılardır?**

Azərbaycan Respublikası Əmək məcəlləsinin 216-ci maddəsinə əsasən işçilər əməyin mühafizəsi üzrə normativ aktlarda nəzərdə tutulmuş əməyin təhlükəsizliyi, gigiyenası, yanğına qarşı mühafizə tələblərini öyrənməli və ona riayət etməlidirlər. Bundan əlavə özünü və iş yoldaşlarını təhlükəyə məruz qoymamağa, buraxılış olmadan qurğularda, dəzgahlarda və həyat üçün təhlükəli olan digər mənbələrdə iş görməməyə, xüsusi geyim və fərdi mühafizə vasitələrindən istifadə etməyə və onların bilərəkdən korlanmasına yol verməməyə, baş vermiş bütün pozuntular və hadisələr barədə dərhal işəgötürənin nümayəndəsinə məlumat verməyə, iş rəhbərinin tapşırıqlarını icra etməyə borcludur.

**13. Əmək intizamı ilə bağlı işəgötürənin hansı hüquqları var ?**

Öz xidməti vəzifələrinin vicdanla yerinə yetirilməsinə və bir yerdə böyük iş stajına görə müdiriyyət işçiləri mükafatlandırmaq hüququna malikdir. Əmək intizamının, müəssisə ərazisində və iş yerində təhlükəsizlik

texnikası qaydalarının tələblərinin pozulmasına görə müdiriyyətin aşağıdakı intizam tənbehlərinin tətbiq etməyə hüququ var:

- xəbərdarlıq (Yazılı və şifahi)
- töhmət vermək
- sonuncu xəbərdarlıqla şiddətli töhmət vermək
- kollektiv müqavilədə nəzərdə tutumuşsa aylıq əmək haqqının 25 faizindən artıq olmamaq şərti ilə cərimə etmək
- əmək müqaviləsini ləğv etmək (Əmək Məcəlləsinin 70-ci maddəsinin "ç" bəndinə və 72-ci maddədə göstərilən səbəblərdən) və sair bu kimi intizam tənbehləri.

**14. Sağlam və təhlükəsiz əməyin mühafizəsi şəraitinin təmin edilməməsinə görə işəgötürənlər hansı məsuliyyət daşıyır?**

İşçilərin iş yerlərində sağlam və təhlükəsiz əməyin mühafizəsi şəraiti təmin edilmədikdə və kollektiv müqavilələrdə nəzərdə tutulan tədbirlər yerinə yetirilmədikdə qanunvericilikdə nəzərdə tutulmuş hallarda və qaydada işəgötürən inzibati və cinayət məsuliyyətinə cəlb edilir.

**15. Əməyin mühafizəsi üzrə qayda və normaların pozulmasına görə vəzifəli şəxslərin məsuliyyəti nədir?**

İdarə və müəssisələrin vəzifəli şəxsləri Əmək Məcəlləsini, əmək mühafizəsi qaydalarını və normalarını pozduqda, eləcə də Dövlət nəzarət orqanlarının, Həmkarlar İttifaqları komitələrinin sərancamlarını, habelə Neft şirkətinin, Birliyin, müəssisə rəhbərlərinin əmrlərini yerinə yetirməməkdə müqəssir olan vəzifəli şəxslə qanunun müəyyənləşdirdiyi qaydada məsuliyyət daşıyırlar. Pozuntu hallarının xüsusiyyətindən və dərəcəsindən asılı olaraq vəzifəli şəxslərə qarşı intizam, inzibati, maddi və cinayət məsuliyyəti tətbiq edilir.

**16. Həmkarlar İttifaqı Təşkilatlarının əməyin mühafizəsində rolu nədən ibarətdir ?**

İşəgötürən tərəfindən əmək qanunvericiliyinin tələblərinə riayət olunmasına nəzarət etmək və aşkar edilmiş çatışmazlıqların aradan qaldırılmasını tələb etmək.

**17. Əməyin mühafizəsi üzrə mütəxəssislərin hazırlanması və işçilərin təlimi işləri necə həyata keçirilməlidir ?**

Dövlət müvafiq təhsil müəssisələrində ölkədə mövcud istehsalat xüsusiyyətlərini nəzərə almaqla əməyin mühafizəsi üzrə mütəxəssislərin hazırlanmasını təmin edir. İşəgötürənlər Həmkarlar ittifaqı təşkilatlarının iştirakı ilə əməyin mühafizəsi üzrə işçilərin təlim və əlavə təhsil sistemini təşkil etməli, işçilərin təliminin və əlavə təhsilinin bütün formalarında əməyin mühafizəsi üzrə təlim nəzərdə tutulmalıdır. Işəgötürən işə qəbul edilən və başqa işə keçirilən işçilərə əməyin mühafizəsi üzrə təlimatlar verməli, onlara təhlükəsiz iş üsullarından istifadə etməyin və bədbəxt hadisələrdən zərərçəkənlərə ilk tibbi yardım göstərilməsi qaydalarının öyrədilməsini təşkil etməlidir.

**18. Müəssisədə əməyin mühafizəsi tədbirlərinin maliyyələşməsi üçün ayrılan vəsaitin minimum həddi nə qədər olmalıdır?**

Əməyin mühafizəsi tədbirlərinin maliyyələşdirilməsi tədbirlərinə ayrılan vəsaitin həcmi Kollektiv müqavilədə müəyyən edilir. Azərbaycan Respublikası Əmək məcəlləsinin 220-ci maddəsinə əsasən bu sahəyə xərclənən illik vəsaitin həcmi işçilərin əməyinin ödənilməsinə xərclənən vəsaitin məbləğinin iki faizindən az olmamalıdır.

**19. Qanunvericiliyə əsasən əməyin mühafizəsi xidmətləri hansı hallarda yaradıla bilər?**

AR-nın Əmək Məcəlləsinin 223-cü maddəsinə əsasən əməyin mühafizəsi işinin təşkili və əməyin mühafizəsi üzrə qanunvericiliyin tələblərinə əməl edilməsinə nəzarətin həyata keçirilməsi üçün müəssisələrdə işçilərin sayı 50 nəfərdən artıq olduqda əməyin mühafizəsi xidməti yaradılmalı, işçilərin sayı 500 nəfərdən artıq olduqda müəssisə rəhbərinin müavini vəzifəsi təsis olunmalı, işçilərin sayı 1000 nəfərdən artıq olduqda isə sənaye-sanitariya laboratoriyası təşkil olunmalıdır.

**20. Müəssisələrdə əməyin mühafizəsi üzrə iş planının hazırlanması necə həyata keçirilir?**

Hər il üçün Əməyin mühafizəsi üzrə iş planı müəssisələrdə, birliklərdə, trestlərdə əməyin mühafizəsi və təhlükəsizlik texnikası xidməti tərəfindən işlənib hazırlanır (panlaşdırılma ilin başlanmasından əvvəl aparılır). Planın hazırlanmasında müəssisənin, birliyin, trestin müvafiq şöbələri,

xidmətləri, bölmələri iştirak etməlidirlər. Bu məqsədilə cari ilin sonunda müəssisə, birlik, trest üzrə əmr verilir və şöbələr,xidmətlər, bölmələr tərəfindən plana daxil etmək üçün təkliflərin verilməsi müddəti təyin edilir. Şöbə, xidmət və bölmələrin təyin olunmuş müddət ərzində əməyin mühafizəsi və təhlükəsizlik texnikası xidmətinə təqdim etdikləri təkliflər gələn ilin yanvarın birinədək təhlil olunur, ümumiləşdirilmiş və növbəti il üçün plan layihəsi hazırlanır. Şöbə,xidmət və bölmələrin təkliflərində onların fəaliyyətlərinin istiqamətləri üzrə əməyin mühafizəsi məsələləri əks olunmalıdır.

**21. Müəssisələrdə əməyin mühafizəsi üzrə iş planının layihəsinin razılaşdırılması, təsdiqi və icrası necə həyata keçirilir?**

Əməyin mühafizəsi üzrə iş planı layihəsi müvafiq şöbələrlə, xidmətlərlə, bölmələrlə razılaşdırılır, imzalanılır və müəssisənin, birliyin, trestin, baş mühəndisi tərəfindən təsdiq edilir. Təsdiq edilmiş plan əməyin mühafizəsi və təhlükəsizlik texnikası xidməti tərəfindən bir həftə ərzində icraçılara çatdırılır. Əməyin mühafizəsi üzrə işlərin illik planına əsasən əməyin mühafizəsi və təhlükəsizlik texnikası xidməti müvafiq şöbələrlə, xidmətlərlə, bölmələrlə birlikdə tədbirlərin yerinə yetirilmə müddətini və konkret icraçını göstərməklə və aylara bölünməklə rüblük plan tərtib edir.

**22. Müəssisələrdə əməyin mühafizəsi üzrə iş planına hansı işlər daxil edilməlidir?**

Əmək mühafizəsi üzrə iş planına (illik,rüblük) aşağıdakı işlər daxil edilir:

- əmək şəraitinə müəssisə nəzarətinin müvafiq mərhələlələrinin təşkili və aparılması;
- yüksək təhlükəli işlərin düzgün aparılmasına və müvafiq sənədlərin tərtib olunmasının yoxlanılması;
- yükqaldırıcı kranların, mexanizmlərin, elektrik qurğuların, təzyiq altında işləyən qabların və aparatların, buxar və su qızdırıcı qazanların, yüktutucu qurğuların təhlükəsizlik qaydalarının tələblərinə uyğun olaraq düzgün istismarına, dəqiq yoxlanılmalarına, sınaqdan keçirilməsinə nəzarət edilməsi:
- texnoloji rejimə, qaydalara, təlimatlara riayət olunmasına nəzarət edilməsi;

- obyektlərin sanitariya-texniki pasportlaşdırılmasının təşkilinə və aparılmasına, təhlilinə, pasportlaşdırılmanın nəticələrinin baxılması;
- sexlərdə, qurğularda, bölmələrdə, sahələrdə aparılan işlərin uçotunun, təhlilinin qiymətləndirilməsinin təşkili;
- tədbirlər planının vaxtında yerinə yetirilməsinə nəzarət edilməsi;
- fəhlələrin müvafiq xüsusi geyim, xüsusi ayaqqabılarla və digər fərdi mühafizə vasitələri ilə təmin olunmalalarına nəzarəti edilməsi;
- əməyin mühafizəsinə dair məsələlər üzrə müşavirələrin, iclasların konfransların keçirilməsi;
- əməyin mühafizəsi,istehsalat mədəniyyəti məsələlərinə dair baxışların, yarışların təşkili və keçirilməsi;
- əməyin mühafizəsi üzrə təlimatların, metodik materialların, yaddaş kitabçalarının və digər ədəbiyyatın işlənib hazırlanması, yenidən baxılması, nəşr edilməsi;
- normativ-texniki sənədlərin, öyrədici texniki vasitələrin, plakatların, təhlükəsizlik nişanlarının, siqaret çəkilən yerləri, əks etdirən göstəricilərin alınması,əməyin mühafizəsi kabinetlərinin yaradılmasında qabaqcıl iş üsullarının tədbiqi;
- əməyin mühafizəsi məsələlərinin təbliğ edilməsi üçün lazimi tədbirlərin təşkili və aparılması;
- əməyin mühafizəsi sahəsində təcrübə mübadiləsi, qabaqcıl təcrübənin yayılması yolları;
- müəssisənin əmək mühafizəsi sahəsində gördüyü işlərin ümumiləşdirilməsi, əmək mühafizəsi üzrə nəzərdə tutulmuş hesabatların hazırlanmsı;

Yuxarıda göstərilən məsələlər bununla bitmir, hər bir müəssisə öz iş xüsusiyyətlərini nəzərə alaraq plana xüsusi əlavələr edə bilər.

**23. Əmək şəraitinin yaxşılaşdırılması və sağlamlaşdırılması üçün tədbirlərin hansı növü vardır?**

Əmək şəraitinin yaxşılaşdırılması və sağlamlaşdırılması üçün tədbirlər aşağıdakı növlərə bölünür:

- Növlərinə görə- təşkilati, texniki, sanitar-gigyenik, sosial-iqdisadi, hüquqi.

**24. Əmək şəraitinin yaxşılaşdırılması və sağlamlaşdırılması üzrə tədbirlərin yerinə yetirilməsi neçə yerə bölünür?**

Əmək şəraitinin yaxşılaşdırılması və sağlamlaşdırılması üçün tədbirlər yerinə yetirilməsinə görə-planlı və plandan kənar (operativ) olmaqla 2 hissəyə bölünür.

Planlı tədbirlər –bu tədbirlər plana uyğun, kollektiv müqaviləyə əsasən həyata keçirilir.

Plandan kənar tədbirlər əmək şəraitinin müntəzəm yoxlanılması nəticələrinə görə, Dövlət nəzarət orqanlarının, müəssisənin, birliyin, rəhbərliyinin sərəncamları və göstərişlərinə əsasən, həmçinin bədbəxt hadisələrin, qəzaların təhqiqi üzrə materialları nəzərə alınaraq, işlənib hazırlanır və həyata keçirilir.

**25. Əmək şəraitinin yaxşılaşdırılması və sağlamlaşdırılması üzrə tədbirlər hansı xüsusiyyətlərinə görə bir-birindən fərqlənir?**

Əmək şəraitinin yaxşılaşdırılması və sağlamlaşdırılması üzrə tədbirlər planı məzmununa və yerinə yetirilməsi müddətinə görə fərqlənir. Məzmununa görə planlar kompleks və məqsədli, yerinə yetirilmə müddətinə görə aylıq, rüblük, illik və beş illik olur.

Əmək şəraitinin yaxşılaşdırılması üzrə kompleks planlarda texniki, sanitar-gigyenik, təşkilati və digər təhlükəli, zərərli istehsalat amillərinin aradan qaldırılması üzrə tədbirlər nəzərdə tutulur.

Məqsədli planlar dəqiq müəiyyənləşdirilmiş məqsəd daşıyan tədbirlərdir. Məşələn, müəyyən təhlükəli və zərərli istehsalat amillərinin (qazlılığın, tozluluğun, səsin, titrəyişlərin, işıqlandırma səviyyəsinin,ağır əl əməyinin tədbiqi və s.)aradan qaldırılması üzrə operativ tədbirlərdir.

Beşillik planlar müasir texniki vasitələrin, qabaqcıl texnologiyanın, elmin texnikanın yeni nailiyyətlərinin istehsalata tədbiqini nəzərdə tutur. Bu planlarda tədbirlərə xərclənən vəsaitlələrin hər il üzrə müqdarı göstərilir.

İllik plan beşillik plan əsasında tərtib olunur. Bu planda görüləcək tədbirlər, onlara ayrılmış məbləğ, yerinə yetirilmə müddəti (hər ay göstərilməklə) məsul icraçıların vəzifələri,soy adı göstərilir.

Rüblük planlar illik plan tədbirlərinin rüblər üzrə bölünmüş və konkretləşdirilmiş, yerinə yetirilmə müddətləri dəqiqləşdirilmiş və mümkün dəyişiklikləri nəzərə alan tədbirlər planıdır. Bu planlara Dövlət

nəzarət orqanlarının və həmkarlar ittifaqının texniki müfəttişliyinin sərancamları, əmək şəraitinin, sex və obyektlərin sanitar-gigyena vəziyyətinin pasportlaşma üzrə yoxlama nəticələlərinin təhlili tələb olunan bütün operativ tədbirlərdə daxil edilir.

**26. Kompleks planların əsas vəzifələri hansılardır?**

Kompleks planların əsas vəzifələri aşağıdakılardır:

- Binaların, istehsalat avadanlıqlarının, tiklilərin, obyektlərin, iş yerlərinin vəziyyətinin təhlükəsizlik qayda, norma və standartların tələblərinə uyğunlaşdırılması;
- Ağır və çox əmək tələb edən proseslərin mexanikləşdirilməsi və avtomatlaştırılması, təhlükəsiz əmək şəraitinin təmini məqsədi ilə istehsalatın təşkili və texnologiyanın təkmilləşdirilməsi, obyektlərin təhlükəsizlik vasitələri ilə təchiz olunması;
- İstehsalatda sanitariya-gigiyena şəraitinin təhlükəsizlik qayda və normalarının tələblərinə uyğun olması;
- işləyənlərin sanitar-məişət xidmətinin yaxşılaşdırılması;
- işləyənlərin, ilk növbədə ağır fiziki əməklə məşğul olan qadınların, zərərli iş şəraiti və gecə növbəsində işləyənlərin sayının daima azaldılması;
- işləyənlərin istirahətinin təşkili, tibbi-sanitariya xidmətinin yaxşılaşdırılması.

**27. Əməyin mühafizəsi üzrə nomenklatur tədbirlər planının tərtibi zamanı hansı tədbirlər nəzərə alınmalıdır?**

Əməyin mühafizəsi üzrə nomenklatur tədbirlər planının tərtibi zamanı "Azərbaycan neft sənayesində əməyin mühafizəsinin vahid idarəetmə sistemi"nin 6-cı fəslində göstərilmiş 6.4.1÷6.4.25-ci bəndlərində göstərilən tədbirlər nəzərə alınmalı və plan həmin tədbirlər əsasında hazırlanmalıdır.

**28. Əmək şəraitinin yaxşılaşdırılması üzrə tədbirlər planının həyata keçirilməsində əsas amillər hansıdır?**

Əmək şəraitinin yaxşılaşdırılması planlarının müvəffəqiyyətlə yerinə yetirilməsində, planlaşdırılmış tədbirlərin həyata keçirilməsində əsəs şərt qeydiyyatın, nəzarətin və hesabatın dəqiq təşkilidir. Planda nəzərdə

tutulmuş tədbirlərin yerinə yetirilməsinin gedişinə müntəzəm və təsirli nəzarət müəssisəsinin, birliyin,trestin müdiriyyətinə və Həmkarlar İttifaqı komitəsinə həvalə edilir.

Birliyin, müəssisənin, əmək mühafizəsi və təhlükəsizlik texnikası xidməti, Həmkarrlar İtifaqı komitəsinin əməyin mühafizəsi üzrə komissiyası əmək şəraitinin yaxşılaşdırılması planlarının və ayrı-ayrı tədbirlərin həyata keçirilməsinə nəzarət edir.

Birlikdə,müəssisədə hər yarım ildə bir dəfədən az olmayaraq, kompleks planların yerinə yetirilməsinin gedişi mütəmadi olaraq rəhbərlik səviyyəsində müzakirə edilir.

**29. Dövlət Neft Şirkətinin müəssisələrində əmək şəraitinin yaxşılaşdırılması üzrə kompleks planların yerinə yetirilməsinə nəzarət və hesabat necə tənzimlənir?**

Əmək şəraitinin yaxşılaşdırılması üzrə kompleks planların yerinə yetirilməsi haqqında hesabat qaydası Dövlət Neft Şirkəti tərəfində müəyyənləşdirilir.

Kompleks planın ayrı-ayrı bölmələrinin yerinə yetirilməsinə, planlaşdırılmış vasitələrin xərclənməsinə nəzarət və qeydiyyatının aparılması əməyin mühavizəsi və təhlükəsizlik texnikası xidməti ilə yanaşı, müəssisənin, birliyin,trestin bölmə rəhbərlərinə, baş mütəxəsisslərinə həvalə edilir.

**30. İdarələrdə əməyin təhlükəsizliyi xidmətinin əsas vəzifələri nədən ibarətdir?**

- Müəssisədə əməyin mühafizəsi işinin təşkili və əlaqələndirilməsi;
- Müəssisənin işçiləri tərəfindən əməyin mühafizəsi üzrə qanunverilik və digər normativ hüquqi aktlara əməl edilməsinə nəzarət;
- İstehsalatda baş vermiş bədbəxt hadisələrin, peşə xəstəliklərinin qarşısının alınması və əmək şəraitinin yaxşılaşdırılması üzrə profilaktiki tədbirləri hazırlamaq və həyata keçirilməsinə çalışmaq;
- İşəgötürənə və işçiyə əməyin mühafizəsi üzrə məsləhətlər vermək.

**31. İdarələrdə əməyin təhlükəsizliyi xidmətinin hansı hüquqları var?**

- Günün istənilən vaxtında müəssisənin istehsalat, xidməti və məişət binalarına baxış keçirmək və əməyin mühafizəsi üzrə sənədlərlə tanış olmaq.

- Əməyin mühafizəsi üzrə qanunvericiliyin yerinə yetirilməsi zamanı yol verilmiş nöqsanların aradan qaldırılması haqqında icrası məcburi olan göstərişlər vermək.
- İşəgötürən və ya onun vəzifəli şəxsləri ilə razılaşdırılmaqla əməyin mühafizəsi vəziyyətinin yoxlanılmasına müvafiq mütəxəssisləri cəlb etmək.
- Əməyin mühafizəsi məsələləri üzrə müəssisənin bölmələrinin rəhbərlərindən müvafiq sənədlər tələb etmək və baxmaq, əməyin mühafizəsi üzrə normativ hüquqi sənədləri aktları pozanlardan yazılı izahat tələb etmək.
- Müəssisə rəhbərliyinin tapşırığı ilə əməyin mühafizəsi məsələləri müzakirə edilərkən dövlət orqanlarında və ictimai təşkilatlarda müəssisəni təmsil etmək.

**32. Əməyin mühafizəsi xidmətinin işçilərini başqa işlərin yerinə yetirilməsinə cəlb etmək olarmı?**

İşəgötürən tərəfindən əməyin mühafizəsi xidmətinin mütəxəssislərinin öz vəzifələrinə aid olmayan işlərin yerinə yetirilməsinə cəlb olunması yol verilmir. Əks təqdirdə işəgötürən Azərbaycan Respublikası İnzibati Xətalar Məcəlləsinin müvafiq maddəsinə əsasən cərimə edilir.

**33. Əməyin mühafizəsi məsələlərinin həllində ictimai birliklərin iştirakı və rolu nədən ibarətdir?**

İşəgötürənlər, işçilər, habelə ayrı-ayrı fiziki şəxslər əməyin mühafizəsi problemlərini həll etmək üçün birləşərək ictimai birliklər haqqında qanunvericiliyə müvafiq olaraq fəaliyyət göstərən ictimai birliklər yarada bilərlər. Dövlət hakimiyyəti orqanları, habelə işəgötürənlər bu ictimai birliklərə hərtərəfli kömək göstərməli və əməyin mühafizəsinin təmin edilməsi barədə normativ hüquqi aktları qəbul edərkən onların təkliflərini və tövsiyələrini nəzərə almalıdırlar.

**34. Əməyin mühafizəsi sahəsində bələdiyyə orqanlarının səlahiyyətləri nədən ibarətdir?**

Bələdiyyə orqanları:

- əməyin mühafizəsi sahəsində dövlət siyasətinin tabeliklərində olan ərazidə həyata keçirilməsini təmin edirlər;

- əməyin mühafizəsi üzrə sahələrarası yerli əhəmiyyətli proqramlar hazırlayır və onların yerinə yetirilməsini təmin edirlər;
- regional problemlərin həlli və əməyin mühafizəsinin təmin edilməsində mülkiyyətçilərə yardım göstərilməsi məqsədi ilə onların pay iştirakı və digər vəsaiti hesabına əməyin mühafizəsi üçün qanunvericiliklə müəyyən edilmiş qaydada məqsədli fondlar yaradır və bu fondların vəsaitinin təyinatı üzrə xərclənməsini təmin edirlər.

**35. Əməyin mühafizəsi qaydalarının tələblərinə uyğun olmayan fəaliyyət qadağan edilə bilərmi?**

Əməyin təhlükəsizliyi normalarının və qaydalarının tələblərinə və Əmək Məcəlləsi ilə müəyyən edilmiş əməyin mühafizəsi prinsiplərinə uyğun olmayan istər işəgötürənin, istərsə də başqa vəzifəli şəxslərin, habelə müəssisələrin və onların struktur bölmələrinin, avadanlıq və qurğuların işi işçilərin sağlamlığı və ya həyatı üçün təhlükə törədərsə, müəyyən edilmiş qaydada səlahiyyətli nəzarət orqanları və ya onların vəzifəli şəxsləri tərəfindən aşkar edilmiş pozuntular aradan qaldırılanadək dayandırılmalıdır.

**36. Əmək müqaviləsi bağlanarkən işçiyə əməyin mühafizəsi hüququna təminatlar verilməlidir?**

- Əmək müqaviləsinin bağlanması şərtləri Əmək Məcəlləsi ilə müəyyən edilmiş əməyin mühafizəsi normalarının tələblərinə uyğun olmalıdır.
- Əmək müqaviləsində hökmən işəgötürən tərəfindən işçinin sağlam və təhlükəsiz əmək şəraitinə təminat verilməsi barədə öhdəliyi göstərilməlidir.
- İşçi peşə xəstəliyinə tutulmağa yüksək təhlükə mənbəyi olan işə qəbul edilərkən belə xəstəliyə tutulmağın ehtimal olunan müddəti barədə işəgötürən onu hökmən xəbərdar etməlidir. Bu halda yalnız həmin müddətlə məhdudlaşan müddətli əmək müqaviləsi bağlanmalı və onun müddəti bitdikdən sonra işçiyə əvvəlki orta əmək haqqı saxlanılmaq şərtiilə başqa iş verilməlidir.
- İşçilərin peşə xəstəliyinə tutulması ehtimalı olan istehsalatlar və iş yerləri Əmək Məcəlləsinin 211-ci maddəsində göstərilmiş siyahıda nəzərdə tutulmalıdır

## II FƏSİL
## TİBBİ XİDMƏT VƏ SAĞLAMLIQ HAQQINDA

**1. Fəhlə və qulluqçulara tibbi xidmətin və bununla əlaqədar tədbirlərin icrasına ictimai nəzarət necə həyata keçirilir?**

Fəhlə və qulluqçularla tibbi xidmətin vəziyyətinə, xəstəliklərin qarşısının alınması və azaldılması üzrə tədbirlərin görülməsinə, həmçinin müalicə-profilaktika və sanatoriya-gigiyena idarələrinin işinə ictimai nəzarəti Həmkarlar İttifaqı Komitəsi, onun komissiyaları və həkim nümayəndələri edirlər.

**2. Hansı işçilər tibbi müayinədən keçməlidir, ilkin və dövri tibbi müayinələr hansı sənədlər əsasında tənzimlənir?**

Ağır, zərərli və təhlükəli istehsalatlarda işçilərlə əmək müqaviləsi bağlanılarkən onların hökmən ilkin tibbi müayinədən, sonralar isə vaxtaşırı icbari tibbi müayinələrdən keçməsi işəgötürənin hesabına təmin edilməlidir. İşçilər icbari tibbi müayinələrdən keçməkdən boyun qaçırdıqda və ya keçirilmiş müayinələrin nəticələrinə əsasən həkim komissiyalarının verdikləri tövsiyələri yerinə yetirmədikdə, işəgötürən AR əmək məcəllənin 62-ci maddəsində nəzərdə tutulmuş qaydada onları işdən kənar edə, habelə müvafiq intizam məsuliyyətinə cəlb edə bilər. İlkin və dövri tibbi müayinələrin keçirilməsi mütləq olan peşə və vəzifələrin siyahısı isə “İcbari tibbi müayinələrin keçirilməsi Qaydası”nın və “İşçinin peşə xəstəliyinə tutulmağı ehtimalı yüksək olan iş yerlərinin Siyahısı”na dair Təlimatın təsdiq edilməsi haqqında Azərbaycan Respublikası Səhiyyə Nazirliyinin Kollegiyasının 15 may 2014-cü il tarixli 24/2 nömrəli Qərarına əsasında müəyyən edilir. Dövri tibbi müayinə ilkin tibbi müayinədən keçmiş, zərərli maddələr və əlverişsiz istehsalat amilləri ilə təmasda olan işçilər, eləcə də ictimai iaşə, qida sənayesi, məişət xidməti işçiləri arasında aparılır.

**3. Dövri tibbi müayinələrin keçirilməsində məqsəd nədir?**

Dövri tibbi müayinələr zərərli iş şəraitində işləyənlərin səhhətinin dinamik müşahidə altında saxlanılmasını, peşə xəstəliklərinin ilk əlamətlərinin vaxtında müəyyənləşdirilməsi, profilaktikasını və zərərli əmək şəraitində işin davam etdirilməsinin qadağan olunmasını təmin edir.

**4. İlk tibbi yardım nədir?**

Hər hansı bir qəza və ya həyati təhlükə yaradan bir vəziyyətdə həkimlərin köməyi təmin edilənə qədər həyatın xilas olunması və ya vəziyyətin daha da pisləşməsinin qarşısını almaq məqsədilə hadisə yerində tibbi vəsait axtarmadan,mövcud vasitə və vəsaitlərlə edilən dərmansız tətbiqlərdir.

**5. İlk tibbi yardımın mahiyyəti nədən ibarətdir?**

Hər hansı zədə (əzilmə, sınıq, yanıq və s.) almış və ya qəfildən xəstələnmiş şəxsin həyatını xilas etmək və sağlamlığını bərpa etmək üçün ona göstərilmiş ilk həkiməqədər yardımın böyük əhəmiyyəti vardır. Hadisə yerində ( işdə, küçədə, evdə və s.) bir sıra sadə tədbirləri yubanmadan həyata keçirməklə ağır fəsadların və xoşagəlməz nəticələrin qarşısını almaq mümkündür. İlk tibbi yardım zədələnmə yerində təcili (15dəq) göstərilməlidir.

**6. İlk tibbi yardımın məqsədi nədən ibarətdir?**

- Həyati təhlükəni ortadan qaldırmaq
- Həyati funksiyaların davam etdirilməsini təmin etmək
- Xəstə və ya yaralının vəziyyətinin pisləşməsini önləmək
- Yaxşılaşmanı asanlaşdırmaq

**7. İlk tibbi yardım çantasında nələr olmalıdır?**

Yardım çantasında olmalıdır :

- üçkünc sarğı bezləri
- rulonlu sarğı bezləri
- sterıl qazlı bezlər
- pambıq
- yara bandları
- boyunluq
- turna jqutu
- antıseptık məhlullar
- ağrı kəsıcı preparat
- sancaq
- qayçı
- fənər

**8. İlk tibbi yardımın göstərilməsində əsas tədbirlər nədən ibarətdir?**

Zərərçəkmişə xarici zədələyici amillərin (elektrik cərəyanı, aşağı və ya yuxarı hərarət, ağır təzyiq altında sıxılma və s.) təsirinin dərhal aradan qaldırılması və onun əlverişsiz şəraitdən uzaqlaşdırılması (sudan, yanan və ya qaz dolmuş yerdən çıxarılması).

- Alınmış travmanın növündən və xarakterindən asılı olaraq dərhal tibbi yardımın göstərilməsi (qanaxmanın dayandırılması, süni tənəffüs verilməsi, ürəyin qapalı masajı, yaralara sarğı qoyulması və s.).
- Ən qısa müddətdə zərərçəkmişin yaxındakı müalicə müəssisəsinə çatdırılması. Bu zaman çox ehtiyatla davranmaq, yaxud hadisə yerinə təcili tibbi yardım çağırmaq lazımdır.

**9. Qaz təsərrüfatına xarekterik olan istehsalat zədələri hansılardır**

Təbii qazın istehlakı və ya qazlı mühitdə aparılan işlərlə əlaqədar baş verən bədbəxt hadisələr nəticəsində insan orqanizmi əsasən aşağıda qeyd edilən xarekterli təsirə məruz qalır:

- Zəhərlənmə
- Termiki və kimyəvi yanıqlar.
- Elektrik cərəyanından zədələnmə
- Sümüyün sınması və ya yerdəyişməsi

**10. Dəm qazı ilə zəhərlənmə zamanı ilk yardım necə göstərilməlidir?**

- Zərərçəkmiş şəxsi dərhal təmiz havaya (ilin isti vaxtlarında evdən bayıra, soyuq vaxtlarda isə havası dəyişdirilən başqa otağa) çıxartmaq;
- Zərərçəkmiş şəxsi arxasıüstə rahat uzandırıb dar və sıxıcı paltarlarını soyundurmaq;
- Ətraflarını və bədənini ovuşdurmaq;
- Başına və sinəsinə soyuq kompress qoymaq;
- Əgər huşu özündədirsə, ona isti çay içirtmək;
- Əgər huşsuzdursa, naşatır spirtində isladılmış pambığı onun burnuna yaxınlaşdırıb iylətmək;
- Tənəffüsü dayanıbsa, dərhal süni tənəffüs verməyə başlamaqla "təcili yardım" çağırmaq.

Bunlar hadisə yerində hər bir adamın göstərə biləcəyi ilk yardımdır. Bunlardan başqa, ixtisaslı həkim yardımına da (hiperbarik oksigenasiya, dərman müalicəsi və s.) ehtiyac var.
Dəm qazı ilə zəhərlənmələrin ağırlıq dərəcəsindən asılı olmayaraq bütün hallarda müalicə üçün zərərçəkənin xəstəxanaya aparılması təmin olunmalıdır.

**11. Süni nəfəs vermə üsulları necə tətbiq edilir?**

Daha effektli və əksər hallarda münasib sayılan süni nəfəs vermə üsulu "ağızdan-ağıza" və "ağızdan-buruna" hava verilməsidir. Orqanizm nəfəs almadıqda ona süni nəfəs verilir. Bu zaman zərərçəkənin ağzını açıb, ağzında selik maddəsi olduqda təmiz dəsmalla və ya tənziflə qurudulmalı və diş protezi varsa çıxarılmalıdır. Zərərçəkən arxası üstə uzadılmalı, onu sıxan paltarlardan azad olunmalı və dilin qırtlaq yolunu bağlamaması üçün başı arxaya əyilməlidir. Zərərçəkənin burun deşiklərini tıxayıb, dərindən nəfəs alaraq öz ağzınızı tənzif üstündən onun ağzına sıxın və sinəsi qalxana qədər güclü nəfəs verin. Özünüzün bütün ehtiyat nəfəsinizi verəndən sonra dərindən nəfəs alın. Lazım gəldikdə bu hal bir neçə dəfə təkrar oluna bilər. Bu zaman zərərçəkəndə zəif nəfəsvermə başlayır. Zərərçənin alt çənəsi yaralandıqda və yaxud çənələri kip bağlandıqda "ağızdan-ağıza" süni nəfəsvermə üsulundan istifadə oluna bilməz. Bu halda nəfəsvermə eyni qaydalara riayət olunmaqla "ağızdan-buruna" üsulu ilə həyata keçirilir. Əgər zərərçəkənin təkcə nəfəsi deyil, həm də yuxu arteriyasının nəbzi dayanmışsa, bu zaman yalnız süni nəfəs verməklə kifayətlənmək olmaz. Belə ki, oksigenin miqdarının az olması onun digər orqanlara və toxumalara ötürülməsinə imkan vermir. Belə hallarda qan dövranının süni yolla bərpa edilməsi üçün ürəyin zahiri masaj edilməsi vacibdir.

**12. Termiki və kimyavi yanıqlar zamanı ilk tibbi yardım necə göstərilir?**

Termiki yanıqlar 4 qrupa bölünür:

- I dərəcəli (yüngül) termiki yanıqlar dərinin qızarması və ağrılarla səciyyələnir.
- II dərəcəli (orta ağır) yanıqlar zamanı yanan yerdə içərisi maye ilə dolu qabarcıqlar əmələ gəlir.
- III dərəcəli (ağır) yanıqlar zamanı bütün dəri qatı keyləşir.

- IV  dərəcəli (ən ağır)yanıqlar zamanı yalnız dəri deyil ,daha  dərin toxumalar(əzələlər, vətərlər, sümüklər) zədələnir.

I dərəcəli yanıqlar zamanı yanan yerdə yanmaya qarşı maz və ya vazelin sürtmək və tibb məntəqəsinə  müraciət etmək lazımdır.

II, III və IV dərəcəli yanıqlar zamanı yanan yerə sterlizə edilmiş sarğı qoymaq və zərərçəkəni tibb məntəqəsinə çatdırmaq lazımdır.

Turşular, qələvilər və digər aşındırıcı kimyəvi maddələrlə yanma zamanı həmin maddənin bədənə düşən hissəsi güclü su axını yuyulmalı və zərərçəkən tibb məntəqəsinə çatdırılmalıdır.

**13. Elektrik cərəyanından zədələnmə zamanı ilk tibbi yardım necə göstərilir?**

- Elektrik cərayanının insan orqanizminə təsiri nəticəsində termiki yanıq hüşun itirilməsi, nəfəsin kəsilməsi, ani ölüm və ya ölüm halları baş verə bilər. Elektrik cərəyanından zədələnmə həm aşağı, həm də yuxarı gərginliklərdə baş verə bilər. İnsan orqanizmindən keçən 0,05 A gücündə cərəyan qorxulu, 0,1 A isə öldürücü təsirə malikdir.
- Elektrik cərayanının insana təsirinin nəticəsi həmin şəxsin gərginlik altında qalması müddətindən və ona göstərilən ilkin tibbi yardımdan asılıdır.Bu tədbirlər nə qədər tez və düzgün aparılarsa, bir o qədər də effektli olar.
- Elektrik cərayanı ilə zədələnmə zamanı ilkin olaraq zərərçəkən elektrik cərayanı təsirindən  azad edildilməlidir.
- Zədələnmə termiki yanıqlarla müşahidə olunarsa I dərəcəli yanıq zamanı yanan yerə yanmaya qarşı maz və ya vazalin sürtmək, II,III və IV dərəcəli yanıqlar zamanı yanan yerə sterlizə edilmiş sarğı qoymaq lazımdır. Zədələnmə nəfəsin kəsilməsi ilə müşahidə olunmuşsa təcili tibbi yardım gələnə qədər zərərçəkənə süni nəfəs verilməlidir.
- Elektrik cərayanı ilə zədələnmə zamanı zərərçəkəni torpağa basdırmaq olmaz. Bu zaman döş qəfəsi sıxılır, nəfəs alma ağırlaşır və orqanizm soyuyur.

**14. Qanaxmalar zamanı ilk tibbi yardım necə göstərilməlidir?**

İstənilən güclü qanaxma zamanı əsas təhlükə ondan ibarətdir ki, orqanizm daxilində qan kütləsinin kəskin şəkildə azalması nəticəsində ürək fəaliyyəti

pisləşir. Bu zaman bütün həyati vacib orqanlar da oksigen çatışmazlığından zərər çəkməyə başlayırlar. Bu halda huşun itirilməsi baş verə bilər. Güclü qanaxma zamanı ilk növbədə yaradan hansı qanın axdığını müəyyən etmək lazımdır.
**Qanaxmalar 3 cür olur**: Kapilyar qanaxmalar, Venoz qanaxmalar, Arterial qanaxmalar. Ən təhlükəli qanaxma arterial qanaxmadır. Bu zaman fəvvarə şəklində al qırmızı qan sürətlə damardan xaric olur və zərərçəkmiş bir neçə dəqiqə ərzində çoxlu qan itirə bilər. Dərhal qanaxmanı saxlamaq üçün tədbirlər görülməlidir. Turna və ya əl altında olan hər hansı vasitədən (ip, rezin, parça, bel kəməri və s.) istifadə etməklə zədə nahiyəsindən yuxarıda iri magistral damarları turna ilə sıxmaqla qanaxmanı saxlamaq lazımdır. Əl altında heç nə olmadıqda iri magistral damarı barmaqla sümüyə doğru sıxmaq lazımdır. Turnanın qoyulduğu vaxt qeyd edilməlidir. Çünki 1-2 saatdan sonra 2-3 dəqiqəliyə sarğını boşaltmaq lazımdır ki, ətrafın qidalanması pozulmasın. Əks halda qanqrena baş verə bilər. Venoz qanaxma zamanı tünd albalı rəngdə qan fasiləsiz yavaş axınla xaric olur. Bu zaman sıxıcı sarğı qoymaqla qanaxmanı dayandırmaq olar. Kapilyar qanaxma zamanı adi sarğı qoyduqda qanaxma dayanır. Bütün hallarda sarğının üstündən buz qovuğu qoymaq ağrını azaltmağa və qanaxmanı dayandırmağa kömək edir. Burun qanaxması zamanı burnun içərisinə hidrogen peroksid məhlulu ilə isladılmış pambıq və ya bint yerləşdirmək, burun pərlərini bir-birinə sıxmaq, burnun üzərinə buz qoymaq lazımdır. Ağ ciyərlərdən qanaxma olarsa (bu zaman köpüklü al qırmızı qan gəlir) zərərçəkənə yarımoturaq vəziyyət vermək, döş qəfəsi üzərinə buz döşəmək, öskürəyi azaldan dərmanlar vermək lazımdır. Qanlı qusma olarsa (bu zaman qusuntu qəhvə çöküntüsünə oxşayır) xəstəyə tam sakitlik verilməli, qarnının üstünə buz qoyulmalı, yeməyə və maye qəbuluna icazə verilməməlidir.

**15. Bintləmə zamanı hansı qaydalara əməl olunmalıdır?**

Bintləmə zamanı aşağıdakı qaydalara riayət olunmalıdır:

- xəstəyə mümkün qədər rahat vəziyyət vermək lazımdır ki, ağrıları artmasın;

- yaranın bintlə sarınması bintin başını bədənin bintlə sarınan hissəsinin ətrafına fırlamaqla iki əllə aparılır. Bu zaman bintin başını soldan sağa olmaqla açırlar;
- bintin hər növbəti qatı özündən əvvəlki qatın eninin yarısını və ya 2/3 hissəsini örtməlidir;
- bintləmə zamanı bədənin bintlə sarınan hissəsi, xüsusən də ətraflar sarğı qoyulandan sonra olacaqları vəziyyətdə olmalıdır. Məsələn, sarğıdan sonra xəstə gəzərsə, diz oynağına dizin bükülmüş vəziyyətində sarğı qoyulması yararsızdır;
- bintin uclarını bədənin sağlam hissəsi üzərində bağlamaq lazımdır.

**16. Dağıntılar zamanı yaranan zədələrə qarşı ilk tibbi yardım necə aparılmalıdır?**

Dağıntılar zamanı meydana çıxan travmalardan biri uzunmüddətli sıxılma sindromu-Kraş sindromudur. Kraş sindromu uzun müddət böyük mexaniki qüvvənin təzyiqi altında bədənin yumşaq toxumalarının zədələnməsi nəticəsində inkişaf edir. Sindromun meydana çıxmasına səbəb muxtəlif travmalar ola bilər. Daha çox zəlzələlər, muasir silahların istifadəsi zamanı baş verən dağıntılarda, inşaat meydanlarında, şaxtalar, karyerlərdə baş verən uçqunlar zamanı rast gəlinir. Ağır mexaniki qüvvə tərəfindən sıxılan yumşaq toxumada əzilmə, dağılma baş verir. Meydana çıxan ağrı zərərçəkmişin sinir, ürək-damar, tənəffüs sistemində ciddi pozuntular yaradır. Eyni zamanda əzilmə nəticəsində qansızmalar olur. Kraş sindromu zamanı ilk yardım kompleks şəkildə aparılır:

- Qısa müddət ərzində zədələnmiş şəxsin dağıntı altından azad edilməsi;
- Elastik kompressiya, zədələnmiş nahiyyənin soyudulması, ətrafların immobilizasiyası;
- Travmatik şok əleyhinə tədbirlər;
- Xəstənin yaxınlıqdakı xəstəxananın cərrahi şöbəsinə aparılması.

**17. Oynaq çıxıqları zamanı ilk tibbi yardım necə göstərilməlidir?**

Oynaq çıxıqları zamanı oynaqda olan sümüklərdən birinin oynaq kapsulasını yırtaraq oynaq boşluğu daxilindən xaricə çıxması hallarında baş verir. Oynaq çıxıqlarının ümumi əlamətlərinə oynağın normal formasının dəyişməsi, çıxan sümüyün digər yeni sahədə yerləşməsi, ətrafın ölçüsünün qısalması və ya uzanması, oynaq nahiyəsində olan kəskin ağrı kimi əlamətlər daxildir. Əgər travmaya məruz qalan uşaqdırsa, aşağıdakı əlamətlər oynaq çıxığından şübhələnməyə əsas verə birər: uşaq zədələnən

ətrafını hərəkət etdirə bilmir və ya onu çətinliklə hərəkət etdirir, o narahat olur, ağlayır, böyüklərə travma aldığı qola və ya ayağa toxunmağa imkan vermir, toxunduqda isə daha bərkdən ağlamağa başlayır. Heç bir halda nə böyük şəxsdə, nə də uşaqda oynaq çıxığını sərbəst şəkildə yerinə salmağa, və ya bu məqsədlə xalq təbiblərinə müraciət etməyə cəhd etməyin. Travmadan sonra ilk 1-2 saat ərzində zərərçəkəni mütləq xəstəxanaya çatdırmaq lazımdır ki, cərrah çıxmış ətrafı yerinə salsın. Yuxarı ətrafın hər hansı oynağı yerindən çıxdıqda, zədələnmiş ətrafı boyuna bağlanmış ləçəkdən sallamaq, zədələnmiş oynağın ətrafına parçaya bükülmüş buz qoymaq, daha sonra isə xəstəni təcili şəkildə travmatoloji məntəqəyə və ya xəstəxanaya çatdırmaq lazımdır. Aşağı ətrafdakı oynaq çıxığı zamanı zədə alan şəxsi uzatmaq, xəstə ayağa tam rahatlıq vermək üçün onun altına yastıq və ya mütəkkə forması verilən dəsmal qoymaq lazımdır. Zədələnmiş oynağın ətrafına parçaya bükülmüş buz qoyun

**18. İlan sancmaları zamanı ilk tibbi yardım necə aparılır?**

İlan sancmaları üçün xarakterik əlamət 1-2 qanayan nöqtədən ibarət olan yara və güclü ağrının olmasıdır. Sancma yerində dəri qızarır, şişkinləşir, göyərmələr yaranır. Zərərçəkəndə ürəkbulanma, qusma, soyuq tər, nəfəsalmanın çətinləşməsi, yuxululuq qeyd olunur. Dərhal "təcili yardım" çağırın!

**"Təcili yardım" gələnə qədər:**

- Zərərçəkəni təcili halda, ayaqları bir qədər yuxarı olmaqla uzadın və tam sakitlik təmin edin. Zərərçəkən heç bir halda hərəkət etməməlidir. "Təcili yardım" maşınına qədər onu xərəkdə aparmaq lazımdır!
- İmkan olduqda sancmadan sonrakı ilk 10 dəqiqə ərzində yaradan zəhəri sıxıb çıxarmağa çalışmaq lazımdır. Bunun üçün yara sahəsində dərini elə sıxın ki, oradan bir neçə damcı maye çıxsın.

**19. İşəgötürən işçini hansə hallarda daha yüngül işə keçirməyə borcludur?**

Səhhətinə görə daha yüngül işdə işləməyə ehtiyacı olan işçiləri işəgötürən onların razılığı ilə tibbi rəyə uyğun olaraq daha yüngül müvafiq işə müvəqqəti və ya daimi keçirməyə borcludur. Bu halda işçilər aşağı maaşlı işə keçirilərsə işçilərin yüngül işə keçirildiyi gündən etibarən bir ay ərzində əvvəlki işi (vəzifəsi) üzrə orta əmək haqqı saxlanılır. Vərəm və digər xroniki ağır xəstəliyə tutulmuş və bu səbəbdən başqa az maaşlı işə müvəqqəti keçirilmiş işçilərə keçirildikləri bütün vaxt ərzində, lakin dörd aydan çox olmayaraq əvvəlki iş yerində aldığı əmək haqqı saxlanılır.

**20. İş yerlərində istehsalat mühitinə təsir edən əsas amillər hansılardır?**

- Fiziki amillər – Havanın tozluluğu, temperatur, səs-küy, infra və ultrasəs, titrəyişlər və.s
- Kimyəvi amillər- Ümumi toksiki, qıcıqlandırıcı və s.
- Bioloji amillər- Mikro-makro orqanizmlər- viruslar, göbələklər, bakteriyalar, bitkilər və heyvan aləmi.
- Psixoloji amillər – zehni psixologiya yorğunluğu, zehni gərginliyə gətirən amillər aiddir.

**21. Əlilərlə bağlı dövlət siyasəti hansı qanunla tənzimlənir ?**

Ölkə ərazisində əlillərlə bağlı dövlət siyasəti "Əlilliyin qarşısının alınması, əlillərin reabilitasiyası və sosial müdafiəsi haqqında" Azərbaycan Respublikası Qanunu ilə tənzimlənir.

**22. Əlillərin hansı sahələrdə işləməsinə yol verilmir ?**

Əlillərin işləməsinə "Əlilliyin qarşısının alınması, əlillərin reabilitasiyası və sosial müdafiəsi haqqında "Azərbaycan Respublikası Qanunun 25-ci maddəsinə müvafiq olaraq Əmək və Əhalinin Sosial-Müdafiəsi Nazirliyi Kollegiyasının 23.07.1997-ci il tarixli 26-6 №-li qərarı ilə təsdiq edilmiş "Əlillərin əməyindən istifadə üçün ixtisaslaşdırılmış iş yerlərinin standatları haqqında nümunəvi Əsasnamə"yə 1№-li əlavədə yəni "əlillərin işləməsinin qadağan olunan istehsalat sahələrinin siyahısı"nda göstərilən sahələrdə əlillərin işləməsinə yol verilmir.

**23. Hava şəraitindən asılı olaraq hansı hallarda işə fasilələr verilir və ya iş dayandırılır ?**

Əmək məcəlləsinin 233-cü maddəsinə Azərbaycan Respublikasının Əmək məcəlləsinə dəyişiklər edilməsi haqqında Azərbaycan Respublikası qanuna əsasən (24.02.2009-cu il) havanın temperaturu 41 dərəcə selsidən çox isti və açıq şəraitli iş yerlərində və ya ilin soyuq vaxtlarında temperaturun müsbət 14 dərəcə selsidən aşağı olan örtülü, lakin isidilməyən binalarda işləyərkən onlara bu maddə ilə ilə müəyyən edilmiş qaydada fasilələr verilir və iş dayandırılır.

**24. İş yerlərində sanitariya-texniki vəziyyətinin pasportlaşmasının tərtibi hansı məqsəd daşıyır ?**

Əmək şəraitinin daha da yaxşılaşdırılması üzrə əsas təşkilati tədbirlərdən biri – iş yerlərinin, sexlərin, obyektlərin sanitariya-texniki vəziyyətinin pasportlaşmasıdır. Əsas məqsəd iş yerində əmək şəraitinin faktiki vəziyyətinin qüvvədə olan norma və qaydalara uyğuluğunun yoxlanılmasıdır. Pasportlaşması vacib olan sahələrin siyahısı Əməyin mühafizəsi və təhlükəsizlik texnikası xidməti ilə struktur bölmə rəhbərləri ilə birlikdə müəyyən edirlər və bu Həmkarlar İttifaqı komitəsi ilə razılaşdıqdan sonra baş mühəndis tərəfindən təsdiq edilir. Obyektlərin sanitar texniki vəziyyətinin pasportlaşdırılması 5 ildən bir aparılır və həmin obyektlərin rəhbərləri tərəfindən aparılır. Pasportlar bir nüsxədə tərtib edilir və obyekt rəhbərində saxlanılır.Onlar pasportda qeyd edilən məlumatların düzgünlüyünə və onun saxlanılmasına cavabdehdir. Qeyd etmək lazımdır ki, istehsalat amillərinin göstəriciləri sənaye-sanitariya laboratoriyalarının işçiləri tərəfindən müəyyən edilir.

**25. İş yerlərinin attestasiyası neçə ildən bir keçirilməlidir ?**

İş yerlərinin attestasiyasının keçirilmə müddəti 5 ildə bir dəfədən az olmamaq şərti ilə müəssisənin özü tərəfindən müəyyən edilir və AR NK-nin 06.03.2000-ci il tarixli 38 nömrəli qərarı ilə təsdiq edilmiş “İş yerlərinin attestasiyasının keirilməsi Qaydaları”na əsasən aparılır. Attestasiyanın keçirilməsində əsas məqsəd instrumental ölçmələr nəticəsində iş yerlərində təhlükəli və zərərli istehsalat amillərinin faktiki göstəricilərinin müəyyən etməklə əməyin ağırlıq və gərginliyinin qiymətləndirilməsidir.

**26. İş yerlərinin attestasiyası və sahələrin sanitar–texniki pasportlaşdırılması əmək şəraitinin yaxşılaşdırılması istiqamətində hansı imkanları yaradır?**

İş yerlərinin attestasiyası, sahələrin sanitar–texniki pasportlaşdırılması, əmək şəraitinin vəziyyətinin dərindən və hərtərəfli təhlili aşağıdakılara imkan verir:

– normalara, qaydalara və standartlara uyğun olmayan istehsalat sahələrinin, avadanlıqların aşkar edilməsinə;

- əmək şəraitinin və görülən tədbirlərin səmərəli olmasının obyektiv qiymətləndirilməsinə;
- əlverişli əmək şəraitinin yaradılmasına, istehsalatda bədbəxt hadisələrin və peşə xəstəliklərinin azaldılması və qarşısının alınması üzrə ardıcıl tədbirlər planlarının işlənib hazırlanmasına və həyata keçirilməsinə.

**27. Yaşı 18-dən aşağı olan yeniyetmələrin əməyi necə mühafizə olunur?**

AR-nın Əmək məcəlləsinə görə yaşı 15-dən az olan şəxslərin işə götürülməsinə yol verilmir. Yaşı 18-dən az olan işçilərin ağır, zərərli olan iş yerlərində, yeraltı işlərdə, habelə əxlaqi kamilliyə mənfi təsir göstərən işlərdə işləməsi qadağandır. Bu şəxslər üçün qısaldılmış iş rejimi tətbiq edilməlidir. Onların iş vaxtından artıq işlərə, istirahət günlərində və gecə işlərinə cəlb olunması, habelə ezamiyyətə göndərilməsi qadağandır. Yaşı 18-dən aşağı olan işçilər yalnız tibbi müayinədən keçirildikdən sonra işə buraxılırlar və 18 yaşına çatana qədər hər il işəgötürənin vəsaiti ilə müayinədən keçirilirlər;

**28. Yaşı 18-dən az olan işçi tərəfindən ağırlığın qaldırılmasında məhdudiyyət qoyulan işlər hansılardır?**

Yaşı 18-dən az olan işçilərin Əmək Məcəlləsinin 251-ci maddəsi ilə müəyyən edilmiş normalardan artıq ağır əşyaların qaldırılması və bir yerdən başqa yerə daşınması işlərinə cəlb edilməsi qadağandır. 16 yaşından 18 yaşadək olan işçilərin əmək funksiyasına yalnız aşağıdakı normalar həddində ümumi çəkisi olan ağır əşyaların əl ilə qaldırılması və daşınması işlərinin görülməsi (xidmətlərin göstərilməsi) daxil edilə bilər:

- kişilərin başqa işləri görməklə yanaşı, eyni zamanda ümumi çəkisi 15 kiloqramdan çox olmayan əşyaların əl ilə qaldırılaraq başqa yerə daşınması, habelə ümumi çəkisi 10 kiloqramdan çox olmayan əşyanın bir metr yarımdan artıq olmayan hündürlüyə qaldırılması;
- qadınların başqa işləri görməklə yanaşı, eyni zamanda ümumi çəkisi 10 kiloqramdan çox olmayan əşyaların əl ilə qaldırılaraq başqa yerə daşınması, habelə ümumi çəkisi 5 kiloqramdan çox olmayan əşyanın bir metr yarımdan artıq olmayan hündürlüyə qaldırılması;

- bütün iş günü (iş növbəsi) ərzində müntəzəm olaraq ümumi çəkisi 10 kiloqramdan çox olmayan əşyanın əl ilə qaldırılıb başqa yerə daşınması;
- 15 kiloqramdan artıq gücün sərf edilməsi tələb olunan yüklənmiş təkərli araba və ya hərəkət edən digər vasitələrlə əşyaların daşınması.
- 16 yaşadək qızlar yalnız onların razılığı ilə bu maddənin ikinci hissəsinin «a», «b» və «c» bəndlərində nəzərdə tutulan normaların müvafiq olaraq 1/3 hissəsi həddində ağırlığı olan əşyaların qaldırılması və daşınması işlərinə cəlb oluna bilərlər.
- Yaşı 16-dan az olan qızların bütün iş günü ərzində müntəzəm olaraq yük qaldırma və daşınma işlərinə cəlb edilməsi qadağandır.
- Yaşı 18-dən az olan işçilərin əməyinin tətbiqi qadağan olunan əmək şəraiti zərərli və ağır olan istehsalatların, peşələrin (vəzifələrin), habelə yeraltı işlərin siyahısı müvafiq icra hakimiyyəti orqanı tərəfindən təsdiq edilir.

**29. Hansı iş yerlərində və işlərdə qadın əməyinin tətbiqi qadağan olunur?**

Əmək şəraiti ağır, zərərli olan iş yerlərində, habelə yeraltı tunellərdə, şaxtalarda və digər yeraltı işlərdə qadın əməyinin tətbiqi qadağandır. Qadın əməyinin tətbiqi qadağan olunan əmək şəraiti zərərli və ağır olan istehsalatların, peşələrin (vəzifələrin), habelə yeraltı işlərin siyahısı müvafiq icra hakimiyyəti orqanı tərəfindən təsdiq edilir.

**30. Qadınların hansı hallarda gecə işlərinə, iş vaxtından artıq işlərə və istirahət günlərində işə cəlb olunması, habelə ezamiyyətə göndərilməsi məhdudlaşdırılır?**

Hamilə qadınların və 3 yaşına çatmamış uşağı olan qadınların gecə işlərinə, iş vaxtından artıq işlərə, istirahət, iş günü hesab edilməyən bayram və digər günlərdə işə cəlb edilməsinə, habelə onların ezamiyyətə göndərilməsinə yol verilmir. 3 yaşından 14 yaşınadək uşağı olan, həmçinin sağlamlıq imkanları məhdud uşağı olan qadınların iş vaxtından artıq işlərə, istirahət, bayram və iş günü hesab olunmayan digər günlərdə işə cəlb edilməsinə və ezamiyyətə göndərilməsinə yalnız onların razılığı ilə yol verilir.

**31. Qadınlar üçün natamam iş vaxtı müəyyən edilən hallar və həkim müayinəsi zamanı əmək haqqının saxlanılması necə təmin edilir?**

Əmək Məcəlləsinin 245-ci maddəsinə əsasən hamilə, 14 yaşına çatmamış uşağı, yaxud sağlamlıq imkanları məhdud uşağı olan, habelə tibbi rəy əsasında xəstə ailə üzvünə qulluq edən qadınların xahişi ilə işəgötürən onlara işlənmiş vaxta mütənasib əmək haqqı ödənilən natamam iş günü və ya natamam iş həftəsi müəyyən etməlidir. Bu halda qadının gündəlik və ya həftəlik iş vaxtının müddəti tərəflərin razılığı ilə müəyyən edilir.

Hamilə və 3 yaşınadək uşağı olan qadınların həm özünün, həm də uşağının tibb müəssisələrində dispanser və ambulator müayinələrinin keçirildiyi, həkim məsləhətləri aparıldığı günlərdə orta əmək haqqı saxlanılır. Belə müayinələrin keçirilməsi üçün işəgötürən hökmən hamilə qadınlara zəruri şərait yaratmalıdır.

**32. Qanunvericilikdə işçilərin istehsalatda bədbəxt hadisələrdən və peşə xəstəliklərindən sığorta olunması nəzərdə tutulubmu?**

Qanunvericilikdə müəyyən edilmiş qaydada və şərtlə həyat üçün yüksək təhlükə mənbəyi olan işlərdə çalışan işçilər istehsalatda bədbəxt hadisələrdən və peşə xəstəliklərindən işəgötürən tərəfindən mütləq icbari sığorta edilməlidirlər. Bədbəxt hadisələrdən və peşə xəstəliklərindən icbari sığorta edilməli olan işçilərin siyahısı, sığorta haqqının məbləği kollektiv müqavilələrdə, əmək müqavilələrində sığorta təşkilatları ilə bağlanmış müqavilələr əsasında müəyyən edilir.

**33. Peşə xəstəliyi deyiləndə nə nəzərdə tutulur?**

İstehsalat prosesi zamanı hər hansı zərərli istehsalat amillərinin təsiri nəticəsində qazanılmış xəstəliyə peşə xəstəliyi deyilir.

**34. İşçilərin istehsalatda bədbəxt hadisələr və peşə xəstəlikləri nəticəsində əmək qabiliyyətinin itirilməsi halları ilə bağlı işəgötürən hansı tədbir görməlidir?**

İşəgötürən qanunvericiliklə müəyyən olunmuş qaydada hər bir işçinin istehsalatda bədbəxt hadisələr və peşə xəstəlikləri nəticəsində peşə əmək qabiliyyətinin itirilməsi hallarından icbari sığortalanmasını təmin etməlidir. Əmək müqaviləsində işçinin sığortalanması barədə müvafiq məlumatların göstərilməsi mütləqdir. İstehsalatda bədbəxt hadisələr və peşə xəstəlikləri nəticəsində peşə əmək qabiliyyətinin itirilməsi

hallarından icbari sığorta sahəsində münasibətlər müvafiq qanunvericiliklə tənzimlənir.

**35. İstehsalatda baş vermiş bədbəxt hadisələrin təhqiqi və uçota alınması necə aparılır ?**

AR NK 28 fevral 2000-ci il tarixli 27 saylı qərarı ilə təsdiq edilmiş (AR NK-nin 31 iyul 2015-ci il tarixli 270 saylı qərarı ilə dəyişiklik edilmişdir.) "İstehsalatda baş verən bədbəxt hadisələrin təhqiqi və uçota alınması" qaydalarına əsasən ağırlıq dərəcəsindən asılı olmayaraq istehsalatda baş vermiş bədbəxt hadisə barədə müəssisə rəhbərliyi dərhal Dövlət Əmək Müfəttişliyi Xidmətinə və yuxarı təşkilata məlumat verməlidir. Bədbəxt hadisənin təhqiqatı Dövlət Əmək Müfəttişliyinin yaratdığı komissiya tərəfindən aparılır. İki-dörd işçinin ölümü və əlahiddə ağır nəticəli (beş və daha artıq işçinin həlak olduğu) bədbəxt hadisələrin təhqiqatı AR Əmək və Əhalinin Sosial Müdafiəsi nazirinin əmri ilə yaradılan komissiya tərəfindən aparılır.

İşçinin əmək qabiliyyətinin bir gündən artıq müddətə itirilməsinə və ya tibbi rəy əsasında gündən artıq müddətə başqa işə keçirilməsinə səbəb olmuş bədbəxt hadisə İZ formalı aktla rəsmiləşdirilir.

Təhqiqat başa çatdıqdan sonra işəgötürən tərəfindən bir gündən gec olmayaraq İZ formalı akt tərtib edilməlidir və aktın bir nüsxəsi zərərçəkmiş işçiyə təqdim olunmalıdır. İstehsalatda baş vermiş bədbəxt hadisə müəssisə tərəfindən müvafiq qaydada uçota alınmalıdır.

**36. Baş vermiş bədbəxt hadisə komissiya tərəfindən hansı müddətə təhqiq olunmalıdır?**

Baş vermiş bədbəxt hadisələrin təhqiqatı komissiya tərəfindən 20 gün müddətinə başa çatdırılmalıdır. Zəruri hallarda Təhqiqat komissiyası sədrinin əsaslandırılmış müraciətinə əsasən bu müddət komissiyanın yaradılması barədə sərancam verən orqan tərəfindən artırıla bilər.

**37. İstehslatda baş vermiş bədbəxt hadisəni gizlətmiş və ya müvafiq akt tərtib etməkdən boyun qaçırmış vəzifəli şəxslər barədə hansı məsuliyyət nəzərdə tutulur ?**

AR-nın Əmək məcəlləsinin 217-ci maddəsinə görə bədbəxt hadisənin baş vermə faktını gizlədən, aparılan təhqiqat barədə müvafiq akt tərtib

etməkdən boyun qaçıran işəgötürən, onun səlahiyyətli vəzifəli şəxsi qanunvericilikdə nəzərdə tutulan qaydada məsuliyyət daşıyır.

**38. İstehsalatda baş vermiş bədbəxt hadisə hansı hallarda rəsmiləşdirilmir və qeydiyyata alınmır ?**

- Təbii ölüm, özünə qəsd, intihar hadisələri, cinayət törədilərkən, şəxsi məqsədlər üçün hər hansı işlə məşğul olarkən, çimərkən, balıq ovlayarkən, işçinin öz təşəbbüsü ilə nahar fasiləsində və ya işdən sonra idman tədbirləri zamanı xəsarət və ya ölüm baş verərsə;
- texniki spirtlərin, aromatik, narkotik vasitələrin, psixiatrop maddələrin istehsalat prosesində istifadəsi ilə bağlı olmayan alkoğol zəhərlənməsi və onunla bağlı ürək dayanması, insult və s.

**39. Başqa təşkilata göndərilmiş və ya əvəzçiliklə çalışan işçi ilə baş vermiş bədbəxt hadisənin təhqiqatı necə aparılır?**

İşəgötürən tərəfindən müvəqqəti olaraq işləmək üçün başqa təşkilata göndərilmiş və ya əvəzçilik üzrə çalışan işçi ilə baş vermiş bədbəxt hadisənin təhqiqatı, bu işçinin müvəqqəti işlədiyi, yaxud əvəzçilik üzrə çalışdığı təşkilatın və əsas iş yerinin nümayəndələrinin iştirakı ilə aparılır və hadisə baş vermiş müəssisə tərəfindən uçota alınır.

**40. İstehsalat zədələnmələrinin tezlik və ağırlıq əmsallarının hesablanma düsturları hansılardır?**

Tezlik əmsalı ($K_t$):

$K_t$ = Bx1000/S

B – hesabat dövründə qeydə alınan bədbəxt hadisələrin sayı;

S – müəssisənin işçilərinin ümumi sayı.

Ağırlıq əmsalı ($K_a$):

$K_a$ = G/B-$B_ö$

G – bədbəxt hadisələr nəticəsində itirilmiş əmək qabiliyyətli günlərin ümumi sayı;

$B_ö$ – hesabat dövründə ölümlə nəticələnmiş bədbəxt hadisələrin sayı.

**41. Qanunvericiliyə görə zərərli əmək şəraitində işlyən işçilərə hansı güzəştlər tətbiq olunur?**

Əmək şəraitinin zərərliliyinə görə aşağıdakı güzəştlər tətbiq olunur:

1. Əmək haqqına əlavələr, əmsallar aşağıda göstərilir.

Zərərliliyin aşağı səviyyəsində: Xüsusi ağır və zərərli işlərdə:

- əmsal - 1.04
- əmsal - 1.08
- əmsal - 1.12
- əmsal - 1.16
- əmsal - 1.20
- əmsal - 1.24

2. Qısaldılmış iş vaxtının müəyyən edilməsi;
3. İşçilərə əlavə məzuniyyətlərin verilməsi;
4. Güzəştli pensiyaların verilməsi.

**42. İşçilərə xüsusi geyim və fərdi mühafizə vasitələri hansı sənədlər əsasında verilir?**

AR-nın Əmək məcəlləsinin 215-ci maddəsinə əsasən işəgötürən işçiləri müəyyən edilmiş müddətlərdə və tələb olunan çeşidlərdə pulsuz xüsusi geyim, xüsusi ayaqqabı və digər fərdi mühafizə vasitələri ilə təmin etməyə borcludur. "Azəriqaz" İB-də bu məsələ "ARDNŞ-nin işcilərinə xüsusi geyim və digər fərdi mühafizə vasitələrinin pulsuz verilməsi Normaları" ilə tənzimlənir.

**43. İstifadə olunmuş xüsusi geyim və digər FMV hansı hallarda istifadə edilə bilər ?**

İstifadə olunmuş xüsusi geyim və digər FMV işçilərə yalnız yuyulduqdan, kimyəvi və digər profilaktik təmizlənmədən keçirildikdən və təmir edildikdən sonra verilir.

**44. İşçilərə verilmiş xüsusi geyim və digər FMV-in uçotu necə aparılır?**

İşçilərə verilmiş xüsusi geyim və digər FMV-in uçotu işçilər üçün açılmış xüsusi kartoçkalar əsasında aparılır.

## III FƏSİL
## ƏMƏYİN TƏHLÜKƏSİZLİYİ ÜZRƏ İŞLƏRİN TƏŞKİLİ HAQQINDA

**1. Əməyin Mühafizəsi, yanğın və təhlükəsizlik texnikası qaydaları üzrə təlimatlar necə il müddətinə qüvvədə olur?**

Müasir texniki səviyyəyə uyğunlaşdırılması və lazımi düzəlişlər edilməsi məqsədi ilə, təlimatlar 5 ildə bir dəfədən az olmayaraq, əgər xüsusi qaydalarda başqa müddət nəzərdə tutulmayıbsa, yenidən baxılmalı və nəşr edilməlidir.

**2. İşçilərə təhlükəsiz iş üsulları necə öyrədilməlidir?**

İşçilərə təhlükəsiz iş üsulları öyrədilməsi aşağıdakılardan ibarətdir:

- bütün təlimat növlərinin (giriş, iş yerində, ilkin, vaxtaşırı, növbədənkənar və birdəfəlik təlimatlar) keçirilməsindən;
- biliklərin yoxlanılmasından (ilkin, vaxtaşırı, növbədənkənar)
- işçilərə təhlükəsiz iş üsullarının öyrədilməsi, onların ixtisaslarının artırılması zamanı (kurs, qrup və fərdi təhsil formalarında) həyata keçirilir.

**3. Hansı işçilərə təhlükəsizlik iş üsulları öyrədilməlidir?**

İstehsalatın xüsusiyyətindən, mürəkkəbliyindən və təhlükəsizlik dərəcəsindən asılı olmayaraq, bütün müəssisələrdə və istehsalat birliklərində fəhlələrə, qulluqçulara və mühəndis-texniki işçilərə təhlükəsiz iş üsulları öyrədilməlidir.

**4. Təhlükəsiz iş üsullarının öyrədilməsinə kimlər məsuliyyət daşıyır?**

Müəssisənin rəhbərliyi (baş mühəndis, baş mütəxəssislər, sex, xidmət və şöbə rəisləri) fəhlələrə, qulluqçulara və mühəndis-texniki işçilərə bilavasitə iş yerlərində və ya xüsusi kurslarda təhlükəsiz iş üsullarının öyrədilməsini təmin etməyə borcludur. Bütövlükdə müəssisələr, birliklər üzrə işçilərə təhlükəsiz iş üsullarının vaxtında və mükəmməl öyrədilməsinin düzgün təşkilinə ümumi rəhbərlik müəssisə rəhbərlərinə, struktur bölmələrində (sexlərdə, sahələrdə) isə həmin bölmələrin rəhbərlərinə həvalə edilir. Onlar bu işlərə görə məsuliyyət daşıyırlar.

5. **Təhlükəsiz iş üsullarının öyrədilməsinin təşkili və vaxtında sənədləşdirilməsi kimə həvalə olunur?**

İşçilərə təhlükəsiz iş üsullarının vaxtında və mükəmməl öyrədilməsinin, sənədlərinin düzgün rəsmiləşdirilməsinin təşkilinə metodik rəhbərlik və nəzarət müəssisənin və müvafiq yuxarı təşkilatların (birliyin, trestin və s.) əməyin mühafizəsi və təhlükəsizlik texnikası xidmətinə həvalə olunur.

6. **Fəhlə və qulluqçularla təlimatın keçirilməsində məqsəd nədir?**

İşə qəbul olunan fəhlə və qulluqçularla, onları ümumi təhlükəsizlik qaydaları və normaları, əmək qanunvericiliyinin əsas müddəaları, daxili əmək intizamı qaydaları ilə, müəssisə ərazisində və bilavasitə iş yerlərində davranış qaydaları ilə, təhlükəli və zərərli istehsalat amillərinin xüsusiyyətləri ilə və digər məsələlərlə tanış etmək məqsədi ilə işlərin təhlükəsiz aparılması üzrə təlimat keçirilir.

7. **Fəhlə və qulluqçularala keçirilən təlimat xüsusiyyətinə görə neçə yerə bölünür?**

Fəhlə və qulluqçularla keçirilən təlimat xüsusiyyətinə və vaxtına görə iki yerə, giriş və iş yerində təlimata ayrılır.

8. **Müəssisələrdə keçirilən giriş təlimatlarının əsas məqsədi nədən ibarətdir?**

Giriş təlimatlarının əsas məqsədi müəssisəyə işə qəbul edilən bütün fəhlə və qulluqçulara, müəssisəyə ezam olunmuş işçilərə, müvəqqəti işləyən fəhlələrə, istehsalat təlimi və təcrübəsi keçmək üçün müəssisəyə gəlmiş tələbə və şagirdlərə, habelə istehsalat sexlərinə işlərin aparılmasına buraxılmış bütün şəxslərə müəssisə, iş rejimi, əməyin mühafizəsinin hüquqi və normativ əsasları, yanğın və elektrik təhlükəsizliyi haqqında qısa məlumat verməkdən ibarətdir. Giriş təlimatının keçirilmə müddəti 2 saatdan az olmamalıdır və müəssisənin əməyin təhlükəsizliyi xidməti tərəfindən keçirilməlidir.

9. **İş yerində keçirilən təlimatlar neçə yerə bölünür, bu təlimatlar kimlər tərəfindən keçirilir və təlimatın məqsədi nədir?**

İş yerində keçirilən təlimatlar aşağıda göstərilən 4 yerə bölünür:

- ilkin təlimat
- təkrar təlimat
- növbədənkənar təlimat
- birdəfəlik təlimat

İş yerində təlimatlar bir qayda olaraq iş rəhbəri tərəfindən iş yerində keçirilməlidir. Elektrotexniki heyətə təlimat baş energetikin mühəndisi tərəfindən keçirilir. Təlimatın keçirilməsində əsas məqsəd işçinin işlədiyi sahədə yerinə yetirəcəyi işin xarekteri, işin icrası zamanı təhlükəsizlik tədbirləri və ayrı-ayrı qurğu və avadanlıqların iş prinsipi haqqında işçiyə məlumat verilməsindən və təhlükəsiz iş üsullarının öyrədilməsindən ibarətdir.

**10. İş yerində təlimatın keçirilməsində məqsəd nədir və təlimat prosesində nələr izah olunmalıdır?**

İş yerində təlimatın keçirilməsində əsas məqsəd hər bir fəhləni, qulluqçunu təhlükəsiz iş üsullarının əsas qaydaları ilə tanış etmək, fəhlələrin təhlükəsizlik tələbləri üzrə biliklərini artırmaq, təzələmək və möhkəmləndirməkdir. Təlimat prosesində aşağıdakılar izah olunmalıdır.

- İş yerində, müəssisə ərazisində davranış qaydalaı və peşələri üçün əməyin təhlükəsizliyi üzrə təhlükəsizliyin məzmunu.
- İstehsalat prosesində və iş vaxtında tətbiq olunan avadanlıqlar, mexanizmlər və qurğular haqqında ümumi məlumat.
- Avadanlıqlara, mexanizmlərə və maşınlara xidmət etdikləri zaman təhlükəsizlik tələbləri.
- Fərdi mühafizə vasitələri. Onların tətbiqi və istifadə qaydaları;
- Yanğın təhlükəsizliyi qaydalarını və bədbəxt hadisə zamanı ilkin tibbi yardımın göstərilməsi qayda və üsullarını.

**11. İş yerində təlimat kimə keçirilməlidir?**

Yeni işə götürülən və ya bir bölmədən (sexdən) digərinə keçirilən (keçirilmə müddətindən asılı olmayaraq), bir işdən digər işə və ya digər xassəli iş sahəsinə göndərilən (istehsalat şəraiti dəyişən hallarda) bütün fəhlə və qulluqçulara, yeni iş tapşırılmış, müəssisəyə ezam olunmuş, istehsalat təlimi və ya təcrübəsi keçməyə gəlmiş, həmçinin müxtəlif işləri yerinə yetirmək üçün müəssisə ərazisində və ya sexlərə buraxılmış digər işçilərə iş yerində təlimat keçirilməlidir.

**12. İş yerində təlimat kim tərəfindən keçirilməlidir?**

Fəhlələrlə iş yerində təlimatın keçirilməsi bilavasitə ustaya (iş rəhbərinə) tapşırılır, qulluqçularla keçirilməsi isə sex, bölmə, qurğu rəhbərlərinə həvalə edilir. Təlimatı keçirən şəxs fəhlə və qulluqçulara iş yerində olan

bütün təhlükəli sahələri, qurğu və avadanlıqları göstərməli, onları iş yerlərinin təhlükəsiz və düzgün təşkili, işlərin təhlükəsiz yerinə yerinə yetirilməsi üsulları ilə tanış etməli, işçilərin diqqətini təhlükəli iş üsullarının və işçilərin, ətrafdakı insanların xəsarət almasına səbəb ola biləcək təhlükəli iş üsullarının tətbiqinə yol verilməməsinə yönəlməlidir.

**13. İş yerində təlimatlar hansı sənədlər əsasında aparılır?**

Eyni peşəli fəhlələr üçün və ya ayrı-ayrı iş növləri üzrə iş yerində təlimat təhlükəsizlik qayda və normalarına, ƏTSS standartlarına əsasən, konkret istehsalat şəraiti nəzərə alınmaqla, işlənib hazırlanmış proqramlar, təlimatlar üzrə keçirilir. Proqramlar və təlimatlar sex işçiləri (rəis, müavinləri) tərəfindən işlənib hazırlanır, əməyin mühafizəsi və təhlükəsizlik texnikası xidməti ilə razılaşdırılır, müəssisənin baş mühəndisi və Həmkarlar İttifaqı Komitəsi ilə birlikdə təsdiq edilir.

Fəhlələrlə təlimatın keçirilməsi proqramına 5 ildə bir dəfədən gec olmayaraq yenidən baxılmalıdır.

**14. İş yerində ilkin təlimatın keçirilməsi necə həyata keçirilir?**

Fəhlələrə iş yerində ilkin təlimat onlar sərbəst işə buraxılmazdan əvvəl, bir işdən başqa işə və ya digər xassəli iş sahəsinə keçirilən hallarda aparılır. Fəhlələrlə ilkin təlimat konkret bölmənin iş xüsusiyyətləri və şəraiti nəzərə alınmaqla təsdiq edilmiş proqramlar və təlimatlar üzrə keçirilir. İlkin təlimat işin xüsusiyyətindən asılı olaraq bir neçə növbə ərzində keçirilir. Onlar istehsalat prosesləri, təhlükəsiz iş üsulları ilə tanış olurlar və hər bir fəhlə fərdi olaraq təlimatlandırılır. İlkin təlimat keçilib qurtardıqdan sonra fəhlənin təhlükəsiz iş üsullarını mənimsəməsinə, onun konkret iş yerinə və peşəsinə aid təhlükəsizlik tələblərini və təlimatı praktiki bilməsinə və başa düşməsinə əmin olunmalıdır. İlkin təlimatın keçilməsi "İşçilərin iş yerində təlimatlandırılmasının qeydiyyatı jurnalı"nda rəsmiləşdirilir.

**15. Vaxtaşırı təlimat hansı müddətdən bir və nə məqsədlə keçirilir?**

Bütün fəhlələrlə və bəzi kateqoriyalı qulluqçularla onların təhsilindən, ixtisas dərəcəsindən, bu və ya digər peşə üzrə iş stajından və tutduğu vəzifədən asılı olmayaraq vaxtaşırı, hər 3 aydan bir işlərin təhlükəsiz aparılması üzrə təlimat keçirilməlidir.

Vaxtaşırı təlimatı bilavasitə iş rəhbəri (usta, iş icraçısı, sahə və qurğu rəisi və s.) iş yerində proqram üzrə keçirir. Vaxtaşırı təlimatlar keçirilən zaman

müəssisənin iş təcrübəsi (müsbət və mənfi nümunələr) nəzərə alınmaqla, ilkin təlimatın bütün məsələləri yenidən müzakirə edilir. Bundan əlavə, vaxtaşırı təlimat keçirilən zaman fəhlələri əvvəl keçirilən təlimatdan sonrakı dövrdə verilmiş əmrlər, sərəncamlar,məktublarla tanış edirlər.
Vaxtaşırı təlimatların keçirilməsi “Heyətə iş yerində təlimatın keçirilməsinin qeydə alınması jurnal”inda rəsmləşdirilməlidir.

**16. Növbədənkənar təlimatlar hansı hallarda keçirilir?**

İstehsalat zəruriyyətindən irəli gələn xüsusi hallarda fəhlələrlə işlərin təhlükəsiz aparılması üzrə növbədənkənar təlimat keçirilməlidir. Növbədənkənar təlimatlar aşağıdakı hallarda keçirilir.

- İstehsalat prosesi dəyişdikdə.
- Müəssisənin istehsalat sahələrində qəza və bədbəxt hadisə baş verdikdə.
- Yeni texnika və texnologiya tətbiq edildikdə.
- Müəssisə rəhbərliyinin əmri və ya sərəncamı ilə yuxarı təşkilatın və Dövlət nəzarət orqanlarının göstərişi ilə və digər hallarda.

**17. Birdəfəlik təlimat hansı hallarda keçirilir?**

Fəhlələr onların peşəsinə aid olmayan birdəfəlik işləri yerinə yetirmək və ya yüksək dərəcədə təhlükəli şəraitdə işləmək üçün tapşırıq alarkən birdəfəlik təlimat keçməlidirlər. Birdəfəlik təlimatı işin məsul rəhbəri keçir və tapşırıq- icazə vərəqində rəsmiləşdirilir.

**18. MTİ işçilərlə iş yerində vaxtaşırı təlimatlar keçirilirmi?**

MTİ işçilərlə iş yerində vaxtaşırı təlimatlar keçirilmir. Lazım gəldikdə onlarla müxtəlif cari məsələlər üzrə (tapşırıq –icazə ilə işlərin yerinə yetirilməsindən əvvəl, yuxarı təşkilatların göstərişi ilə, müəssisə rəhbərliyinin əmr və sərancamı ilə) növbədənkənar və ya birdəfəlik təlimatlar keçirilir.

**19. Əməyin təhlükəsizliyi təlimatlarının işlənib hazırlanması, razılaşdırılması və təsdiqi necə həyata keçirilir?**

Hər bir fəhlə peşəsi üzrə gördükləri işin xüsusiyyətinə uyğun təlimat işlənilməlidir. Təlimat müəssisə, sahə rəisləri, ustaları və mütəxəssisləri tərəfindən işlənilməli, müəssisənin Həmkarlar Təşkilatı ilə razılaşdırıldıqdan sonra baş mühəndis tərəfindən təsdiq olunmalıdır.

**20. Qaz təsərrüfatına yeni qəbul olunmuş işçilərin sərbəst işə buraxılmaları üçün hansı tələblər vardır ?**

Qaz təsərrüfatına yeni qəbul edilmiş və ya bir işdən digər işə keçirilmiş işçilər giriş təlimatı və iş yerində ilkin təlimat keçdikdən sonra onlara təhlükəsiz iş üsulları öyrədilməli və gördükləri iş həcmində bilikləri yoxlanıldıqdan sonra sərbəst işə buraxılmalıdır. Biliklərin yoxlanılması müəsissələrdə daimi fəaliyyət göstərən komissiyalar tərəfindən "Dövlətdağtexnikinəzarət" Ağentliyinin nümayəndisinin iştirakı ilə aparılmalıdır. Bilikləri yoxlanılmamış işçilərin sərbəst işə buraxılmasına yol verilmir.

**21. Biliklərin yoxlanılması işi necə təşkil olunmalıdır?**

Biliklərin yoxlanılnması müəssisə rəhbəri tərəfindən təyin olunmuş komissiya tərəfindən həyata keçirilir. Komissiyanın sayca tərkibi, bir qayda olaraq, konkret şəraitə uyğun müəyyən olunur. Komissiya,üç nəfərdən az olmamaq şərtilə, natamam tərkibdə işləyə bilər. Komissiyanın işində ancaq bilikləri yoxlanılmış müəssisə işçiləri iştirak edə bilərlər. Biliklərin yoxlanılması fərdi qaydada və təlimatlar əsasında işlənib hazırlanmış sual vərəqələri üzrə (biletlər) keçirilir.Sual vərəqələri mütəxəssislər və sex (xidmət) rəisləri ilə birlikdə işlənib hazırlanır, əməyin mühafizəsi və təhlükəsizlik texnikası xidməti ilə razılaşdırılır, baş mühəndis tərəfindən təsdiq edilir.Sual vərəqəsində icra olunan bütün növ işlər üzrə təhlükəsizlik tələbləri öz əksini tapmalıdır.

**22. Biliklərin yoxlanılması necə sənədləşdirilir?**

Biliklərin yoxlanılmasının nəticələri "İşçilərin biliyinin yoxlanılmasının qeydiyyat jurnalında göstərilən protokol şəklində rəsmləşdirilir. Protokolda yoxlanılan şəxsin biliyinə verilən qiymətdən əlavə (yaxşı, kafi, qeyri-kafi), işçinin sərbəst işə buraxılmasının mümkünlüyü haqqında rəy (qərar) verilir.

**23. Fəhlələrin biliklərinin yoxlanılması xarakteri və vaxtına görə neçə yerə bölünür?**

Fəhlələrin biliklərinin yoxlanılması xarakteri və vaxtına görə ilkin, vaxtaşırı və növbədənkənar yoxlamalara bölünür.

**24. Fəhlələrin biliklərinin yoxlanılması işlərinin təşkili necə həyata keçirilir.**

“Azərbaycan neft sənayesində əməyin mühafizəsinin vahid idarəetmə sistemi”nə əsasən fəhlələr ildə bir dəfədən az olmamaqla imtahan verməlidirlər. Fəhlələrin biliklərinin yoxlanılması fərdi qaydada və təlimatlar əsasında işlənib hazırlanmış suallar üzrə keçirilir. Sual vərəqləri mütəxəssislər və struktur bölmənin (Şöbə, xidmət, bölmə) rəhbərləri tərəfindən işlənib hazırlanır, əməyin mühafizəsi və təhlükəsizlik texnikası xidməti ilə razılaşdırılır, baş mühəndis tərəfindən təsdiq edilir. Suallara vaxtaşırı baxılmalıdır. Fəhlələrə keçiriləcək imtahan gününün tarixi brədə 2 həftə öncə xəbərdarlıq edilməlidir.

**25. Təkrar yoxlama zamanı biliyi qeyri-kafi qiymətləndirilmiş fəhlələr barədə hansı tədbirlər görülməlidir?**

Yoxlama vaxtı biliyi qeyri-kafi qiymətləndirilmiş işçi gələcəkdə sərbəst işə buraxılmır və belə hallarda 2 həftə ərzində onun biliyi təkrar yoxlanılır. Əgər təkrar yoxlama zamanı fəhlənin biliyi yenidən qeyri-kafi qiymətləndiriərsə, rəhbərlik onun işə buraxılması haqqında məsələni həll etməlidir. İşçinin biliyinin təkrar yoxlanılmasına gəlməməsi əmək intizamının pozulması kimi qiymətləndirilir və ona qarşı inzibati cəza tədbirləri tətbiq olunur.

**26. Hansı hallarda fəhlələrin bilikləri növbədənkənar yoxlanılır ?**

Fəhlələrin bilikləri aşağıdakı hallarda növbədənkənar yoxlanılır.

- istehsalat prosesi dəyişdikdə.
- yeni avadanləıqlar və mexanizmlər tətbiq edildikdə.
- bədbəxt hadisəyə və qəzaya səbəb olmuş təhlükəsizlik qayda və təlimatların tələblərinin pozulması aşkar edildikdə.
- Müəssisə rəhbərliyinin əmri və ya sərəncamı ilə yuxarı təşkilatın və Dövlət nəzarət orqanlarının göstərişi ilə və digər hallarda.

Növbədənkənar yoxlama proqramı onun həcmi və yoxlama üçün sualların siyahısı hər bir konkret halda yoxlamanın keçirilməsinin səbəbini nəzərə alınmaqla müəssisə rəhbəri tərəfindən müəyyənləşdirilir.

**27. Fəhlələrə hansı hallarda biliklərin yoxlanılması vəsiqəsi verilməlidir?**

Biliyinin ilkin yoxlamasından sonra fəhləyə qəbul edilmiş nümunə üzrə, müvafiq şəkildə rəsmiləşdirilmiş vəsiqə verilir.Vəsiqəyə müxtəlif qayda və təlimatların tələbləri üzrə biliyi haqqında məlumatdan əlavə, işçinin bir bölmədən digərinə keçirilməsi, onun peşəsi, müxtəlif kurslarda təlim alması haqqında məlumat daxil edilir.

**28. MTİ-nin biliklərinin yoxlanılması neçə ildən bir keçirilməlidir ?**

“Azərbaycan neft sənayesində əməyin mühafizəsinin vahid idarəetmə sistemi”nə əsasən, ustaların, iş icraçılarının (bilavasitə iş rəhbərlərinin) bilikləri hər il, struktur bölmə rəhbərlərinin və digər MTİ-lər isə 3 ildə bir dəfədən az olmayaraq imtahan verməlidirlər.

**29. Müəssisə və birliklərin rəhbər və mühəndis–texniki işçilərinin biliklərinin növbədənkənar yoxlanılması hansı hallarda keçirilir ?**

- Yeni və yenidən işlənilmiş təhlükəsizlik qayda və normalar qüvvəyə mindikdə.
- istehsalatda yeni növ avadanlıqlar və ya yeni istehsalat prosesləri tətbiq olunduqda.
- Onların rəhbərlik etdiyi işlərdə və obyektlərdə təhlükəsizlik qayda və normalarının pozulması aşkar olunduqda.
- Yuxarı təşkilatın göstərişi, Dövlət nəzarət orqanları və Həmkarlar İttifaqının əmək üzrə texniki nəzarətçilərinin tələbi ilə.

Biliklərin növbədənkənar yoxlanılmasının zəruriyyəti, həcmi və müddəti hər bir konkret halda müəssisə və birliyin rəhbərliyi tərəfindən müəyyən edilir.

**30. Biliklərin yoxlanılması üzrə daimi fəaliyyət göstərən komissiya üzvləri kimlər ola bilərlər ?**

Yuxarı təşkilatın biliklərin yoxlanılması üzrə komissiyasında bilikləri yoxlanılmış və müəssisə rəhbərinin əmri ilə komissiyaya daxil edilmiş şəxslər.

**31. Biliklərin yoxlanılması zamanı biliyi qeyri-kafi qiymətləndirilmiş işçilər barədə hansı tədbirlər görülür ?**

Yoxlama zamanı təhlükəsizlik tələbləri üzrə biliyi qeyri-kafi qiymətləndirilmiş fəhlələr sərbəst işə buraxılmır, onlara əlavə təlim

keçirilir.  Mühəndis texniki işçilər isə komissiyanın qərarı ilə  işə bilavasitə rəhbərlikdən kənarlaşdırılır. Belə hallarda 2 həftə ərzində onların biliyi təkrar yoxlanılır.
Əgər təkrar yoxlama zamanı da qeyri-kafi nəticələr göstərilərsə mühəndis texniki işçilərin (rəhbərlərin) tutduğu vəzifədən azad edilməsi, fəhlələrin isə işə buraxılması məsələsi barədə rəhbərlik qarşısında məsələ qaldırılmalıdır.

**32. Əmək şəraitinin vəziyyətinə  nəzarət olunmasında məqsəd nədir?**

Əmək şəraitinin vəziyyətinə  nəzarət istehsalatda bədbəxt hadisələrin qarşısının alınmasına yönəldilmiş əsas tədbirlərdən biri olmaqla, əmək şəraitinin, əmək qanunvericiliyi,  təhlükəsizlik qayda və normalarının, standartların tələblərindən kənara çıxma hallarını aşkar etmək və onların aradan qaldırılması üzrə operativ qərar qəbul etməkdən ibarətdir.

**33. Müəssisədə əmək şəraitinin vəziyyətinə nəzarətin əsas növləri hansılardır?**

Müəssisə nəzarətinin əsas növləri aşağıdakılardır:

- əmək şəraitinin vəziyyətinə operativ (mərhələli) nəzarət, həmçinin müəssisələrin, birliklərin, trestlərin ayrı-ayrı rəhbərlərinin, mühəndis-texniki işçilərinin nəzarəti.
- Sexlərin, sahələrin, qurğuların, sanitar-texniki vəziyyətini pasportlaşdırmaq və onlara nəzarət etmək.

Müəssisə nəzarətinin yekun mərhələsi-əmək şəraitinin vəziyyətini daima nəzərdən keçirmək və bu barədə müntəzəm olaraq məlumat verməkdir.

**34. Əmək şəraitinin vəziyyətinə müəssisə nəzarət necə həyata keçirilir?**

Əmək şəraitinə nəzarət 4 pillədən ibarət olur. 1-ci 3 pillə müəssisə tərəfindən, 4-cü pillə isə müəssisənin tabe olduğu Birlik tərəfindən həyata keçirilir.  1-ci pillədə usta, icraçı, bilavasitə iş rəhbəri hər gün işin (növbənin) əvvəlində, 2-ci pillədə sex, qurğu rəisi həftədə bir dəfədən az olmayaraq struktur bölmənin daimi fəaliyyət göstərən komissiyası isə hər ayda bir dəfədən az olmayaraq, 3-cü pillədə isə müəssisənin əməyin təhlükəsizliyi üzrə daimi fəaliyyət göstərən komissiyası rübdə bir dəfədən az olmayaraq  iş yerində əmək şəraitinin vəziyyətini yoxlayır və aşkar edilmiş nöqsanların aradan qaldırılması üçün tədbir görür. 4-cü pillədə

Birliyin əməyin təhlükəsizliyi üzrə komissiyası yarım ildə bir dəfədən az olmayaraq əmək şəraitinin vəziyyəti yoxlanılmalıdır.

**35. Əmək şəraiti vəziyyətinə müəssisə nəzarətinin birinci pilləsi necə və kim tərəfindən aparılmalıdır?**

Nəzarətin birinci pilləsində işin rəhbəri hər gün işin əvvəlində əmək mühafizəsi üzrə müfəttişlə (o, olmayanda-sərbəst) birlikdə iş yerində əmək şəraitinin vəziyyətini yoxlayır, aşkar etdiyi nöqsanların aradan qaldırılması üzrə operativ tədbirlər görür. O, obyektləri yoxlayarkən metodik göstərişləri rəhbər tutmalıdır.

Yoxlama zamanı aşkar edilmiş nöqsanlar və çatışmazlıqlar dərhal aradn qaldırılmalıdır, briqadanın, növbənin qüvvəsi ilə aradan qaldırılması mümkün olmayan və ya ustanın, iş rəhbərinin səlahiyətinə aid olmayan digər nöqsanlar gələcəkdə onların aradan qaldırılması üçün "Əmək şəraitinin vəziyyətinin yoxlanılması jurnalı"na yazılır.

Usta, iş rəhbəri həmin nöqsanlar və çatışmazlıqlar haqqında sex, bölmə rəhbərliyinə məlumat verir və işçilərin təhlükəsizliyini təmin edən lazımi tədbirlər görür.

İstehsalat sahələri ərazi cəhətdən dağınıq olduqda usta, bilavasitə iş rəhbəri birinci mərhələ üzrə bütün sahələrdə, iş yerlərində bir həftə ərzində və dəniz özüllərində isə növbə ərzində bir dəfə yoxlama aparmalıdır.

**36. Əmək şəraiti vəziyyətinə müəssisə nəzarətinin ikinci pilləsi necə və kim tərəfindən aparılmalıdır?**

Nəzarətin ikinci pilləsində sex, qurğu, xidmət rəisi həftədə bir dəfədən az olmayaraq, struktur bölmələrin daimi fəaliyyət göstərən komissiyaları hər ayda bir dəfədən az olmayaraq, Həmkarlar İttifaqı Komitəsinin sədri və ya əmək mühafizəsi komissiyanın sədri ilə birlikdə obyektlərdə, iş yerlərində əmək şəraitinin vəziyyətini, həmçinin birinci mərhələ üzrə aparılan işləri yoxlayır, aşkar edilmiş nöqsanların və pozuntuların aradan qaldırılması üçün operativ tədbirlər görürlər.

Yoxlama zamanı aşkar edilmiş nöqsanlar, çatışmazlıqlar dərhal aradan qaldırılmalıdır. Yoxlama müddətində aradan qaldırılması mümkün olmayan məsələlər "Əmək şəraitinin vəziyyətinin yoxlanılması jurnalı"nda aradan qaldırılma müddəti və icraçılar göstərilməklə yazılır. Əgər aşkar edilmiş nöqsanların, çatışmazlıqlaın sexin, bölmənin qüvvəsi

ilə aradan qaldırılması mümkün deyilsə, onda sex, bölmə rəisi həmin nöqsanlar, çatışmazlıqlar haqqında müəssisənin rəhbərliyinə məlumat verir və işləyənlərin təhlükəsizliyinin təmin olunması üçün müvafiq tədbirlər görür. Əgər aşkar edilmiş nöqsanların, çatışmazlıqlar qəza və bədbəxt hadisələrin baş verməsi üçün təhlükə yaradırsa onda sex rəisi, daimi fəaliyyət göstərən komissiyanın sədri onların aradan qaldırılmasına qədər işi dayandırır.

Yoxlamanın nəticələri haqqında, ümumiləşdirilmiş şəkildə aşkar edilmiş nöqsanların, çatışmazlıqlaın aradan qaldırılması tədbirləri göstərilməklə akt tərtib edirlər. İstehsalatın təşkilinin sexsiz strukturunda (briqadalar, istehsalat sahələri bilavasitə müəssisə rəhbərliyinə tabe olduqda) nəzarətin ikinci mərhələsi keçirilmir.

Bu halda obyektləri, sahələri ayda bir dəfə müəssisənin əməyin təhlükəsizliyi üzrə daimi fəaliyyət göstərən komissiyası, onun köməkçi komissiyası, yaxıd müəssisənin mühəndis-texniki işçilərindən biri yoxlamalıdır.

**37. Əmək şəraiti vəziyyətinə müəssisə nəzarətinin üçüncü pilləsi necə və kim tərəfindən aparılmalıdır?**

Nəzarətin üçüncü pilləsində müəssisənin daimi fəaliyyət göstərən komissiyası, yaxud onun köməkçi komissiyası hər rübdə bir dəfədən az olmayaraq sexlərdə, qurğularda, istehsalat sahələrində, zavodlarda və s. əmək şəraitinin vəziyyətini, həmçinin birinci və ikinci mərhələlərin gördükləri işləri yoxlayır.

Müəssisənin rəhbər və mühəndis-texniki işçiləri əsas işləri dairəsində sexlərdə, qurğularda, istehsalat obyektlərində olarkən, işçilərin əmək şəraitinin vəziyyətini yoxlamalıdırlar və aşkar etdikləri nöqsanların, pozuntuların aradan qaldırılması üçün tədbirlər görməlidirlər.

Yoxlama zamanı aşkar edilmiş çatışmazlıqlar dərhal aradan qaldırılmalıdır. Yoxlama müddətində aradan qaldırılması mümkün olmayan çatışmazlıqlar haqqında "Əmək şəraitinin vəziyyətinin yoxlanılması jurnalı"nda qeydiyyat aparılmalıdır. Yoxlamanın nəticələri komissiyanın geniş iclasında müzakirə olunur, müvafiq nəticələr çıxarılır, habelə aşkar edilmiş çatışmazlıqların aradan qaldırılması üçün təkliflər irəli sürülür. Yoxlamanın nəticələrinə dair akt tərtib olunur.

**38. Əmək şəraiti vəziyyətinə müəssisə nəzarətinin üçüncü pilləsinin düzgün təşkilinə kim cavabdehdir?**

Nəzarətin üçüncü pilləsinin düzgün təşkilinə və aparılmasına, aşkar edilmiş çatışmazlıqların aradan qaldırılmasına, nəzərdə tutulmuş tədbirlərin yerinə yetirilməsinə müəssisənin rəhbərləri cavabdehlik daşıyırlar (rəis, müdir, onların müavinləri).

**39. Əmək şəraiti vəziyyətinə nəzarətin dördüncü pilləsinin aparılmasının təşkili necə həyata keçirilir?**

Birliyin daimi fəaliyyət göstərən komissiyası və ya köməkçi komissiya hər yarım ildə bir dəfədən az olmayaraq (plan üzrə) müəssisələrdə, onların struktur bölmələrində, istehsalat sahələrində əməyin təhlükəsiz təşkilini, əmək mühafizəsini, müəssisənin rəhbərliyinin, mühəndis-texniki işçilərinin bu sahədə gördükləri işləri yoxlayır.

Birliyin rəhbər və mühəndis-texniki işçiləri əsas vəzifələrini yerinə yetirmək üçün müəssisələrdə, onların bölmələrində, sexlərində olarkən işçilərin təhlükəsiz iş şəraitini yoxlamalı, aşkar etdikləri nöqsanların aradan qaldırılması üzrə lazımi tədbirlər görməli, müəssisə onun struktur bölmələri rəhbərlərinə əməyin mühafizəsi məsələlərinin həllində əməli yardım göstərilməlidirlər.

Yoxlama zamanı aşkar edilmiş nöqsanlar və pozuntular haqqında akt tərtib olunur, bu haqda "obyektlərdə əmək şəraiti vəziyyətinin yoxlanılması jurnalında qeydiyyat aparılır. Yoxlamanın nəticələri yoxlanılan müəssisənin rəhbərliyinin yanında keçirilən geniş iclasda müzakirə edilir, aşkar edilmiş nöqsan və pozuntuların aradan qaldırılması üzrə tədbirlər müəyyənləşdirilir, lazım gəldikdə müvafiq əmr verilir.

Nəzarətin dördüncü mərhələsinin həyata keçirilməsi birliyin, trestin baş mühəndisinə və direktoruna, müdirin istehsalat sahələri üzrə müavinlərinə həvalə edilir.

**40. Əmək şəraiti vəziyyətinin yoxlanılması zamanı hər hansı nöqsan aşkar edilmədikdə görülmüş işlər necə rəsmiləşdirilir?**

Yoxlama zamanı nöqsanlar aşkar edilmədikdə və ya yoxlama zamanı ləğv edildikdə "Əmək şəraitinin vəziyyətinin yoxlanılması jurnalı"na bu barədə heç nə yazılmır, lakin "Əmək mühafizəsi üzrə görülən işlərin qeydiyyatı jurnalı"nda hər bir yoxlamadan sonra müvafiq qeydlər aparmaqla rəsmləşdirilir.

**41. Əməyin təhlükəsizliyi üzrə daimi fəaliyyət göstərən komissiya nə məqsədlə yaradılır və bu komissiyanın üzvləri kimlər ola bilər ?**

Əmək şəraiti vəziyyətinə nəzarəti həyata keçirmək və əməyin mühafizəsi üzrə digər məsələlərə baxmaq üçün bütün müəssisələrdə baş mühəndisin, direktorun, müdir müavininin sədrliyi ilə əməyin təhlükəsizliyi üzrə komissiya yaradılır. Bu komissiyaların tərkibinə rəis müavinləri, baş mütəxəssislər, şöbə və xidmət rəhbərləri, onların müavinləri, Həmkarlar komitəsinin sədri, onun müavini daxil edilir.

**42. Əməyin təhlükəsizliyi üzrə daimi fəaliyyət göstərən komissiyanın işi necə tənzimlənir?**

Müəssisədə əməyin təhlükəsizliyi üzrə DFK işini illik plan üzrə aparır və həmin plan komissiyanın sədri tərəfindən təsdiq edilir. Əməyin təhlükəsizliyi üzrə DFK aşağıdakı işləri həyata keçirir:

- Müəssisələrdə və obyektlərdə əmək şəraitini, əmək şəraitinin yaxşılaşdırılması və sağlamlaşdırılması kompleks plan layihəsini, mümkün ola bilən qəzaların və ağırlaşmaların ləğvi planını, müəssisələrin, obyektlərin pasportlaşdırılmasının nəticələrini yoxlayır;
- Müəssisənin fəhlələrinin, mühəndis-texnik işçilərinin və aidiyyəti rəhbər işçilərin biliklərini yoxlayır;
- Əməyin təhlükəsizliyi üzrə ictimai baxışlar və digər ictimai, texniki, təşkilati tədbirlərin aparılmasını təşkil edir, onların nəticələrini müzakirə edir;
- Təhlükəsizlik qaydalarını pozan işçilərin məsuliyyətə cəlb edilməsi, həmçinin təhlükəsiz əmək şəraitinin yaradılmasında fəal iştirak edən və yaxşı göstəricilər əldə etmiş kollektivlərin, şəxslərin mükafatlandırılması məsələlərini müzakirə edir;

**43. Sexlər, bölmələr və müəssisələr arasında qarşılıqlı yoxlamalar hansı məqsədlə təşkil olunur?**

Sexlər,bölmələr, müəssisələr arasında qarşılıqlı yoxlamalar təhlükəsiz əmək şəraitinin yaradılması, əməyin mühafizəsi üzrə işlərin təşkilində olan çatışmazlıqların aradan qaldırılmasında aparılan iş təcrübəsi mübadiləsi məqsədilə təşkil edilir və keçirilir.

Uyğun sexlər, bölmələr arasında qarşılıqlı yoxlamanı sex, bölmə rəhbərlərinin (sex rəisi və ya onun müavini) başçılıq etdiyi xüsusi yaradılmış qruplar, əmək mühafizəsi üzrə içtimai müfəttişin iştirakı ilə aparılır.

Müəssisələr arasında qarşılıqlı yoxlamanı əməyin təhlükəsizliyi üzrə daimi fəaliyyət göstərən komissiyanın tərkibində olan köməkçi komissiyalar müəssisə və birliyin rəhbərlərindən birinin başçılığı ilə aparılır.

Qarşılıqlı yoxlama zamanı aşkar edilmiş çatışmazlıqların aradan qaldırılması üçün operativ tədbirlər görür, lazım gəldikdə, yoxlanılan obyektlərin "əmək şəraitinin vəziyyətinin yoxlanılması jurnalında" müvafiq qeydlər aparılır.

**44. Xilasedici kəndirlər hansı müddətdə və necə sınaqdan keçirilməlidir?**

200 kq kütləyə malik yük ilə 15 dəq ərzində sınaqdan keçirilir. Yükdən azad olunan kəndirin uzunluğu ilk uzunluğunun 5 faizdən artıq olmamalıdır.

**45. İpli və qarmaqlı kəmərlər, xilasedici kəndirlər hansı müddətdən bir sınaqdan keçirilməlidir?**

Xilasedici kəndirlər, ipli və qarmaqlı kəmərlər 6 ayda 1 dəfədən az olmamaqla sınaqdan keçirilməlidir.

**46. Əleyhqazlarla fasiləsiz iş müddəti nə qədər olmalıdır ?**

Əleyhqazla fasiləsiz iş müddəti 30 dəqiqədən artıq olmamalıdır. İzoləedici əleyhqazla fasiləsiz iş müddəti onun pasportunda qeyd edilməlidir.

**47. Qaz təsərrüfatında istifadə edilən şlanqlı əleyhqazlarda şlanqın maksimum uzunluğu nə qədər olmalı və necə sınaqdan keçirilməlidir ?**

Şlanqlı əleyhqazda şlanqın maksimum uzunluğu 15 metrdən artıq olmamalıdır. Əleyhqazda hər istifadədən əvvəl hermetikliyə yoxlanılmalıdır. Bunun üçün əlehqazın qırçınlı borusunun ucu əl ilə sıxılır, əgər ucu sıxılmış qırçın borulu əleyhqazlarda nəfəs almaq mümkün deyilsə əleyhqaz saz hesab olunur.

**IV BÖLMƏ**
**NEFT, QAZ və NEFT-KİMYA SƏNAYESİNDƏ YANĞIN TƏHLÜKƏSİZLİYİ QAYDALARI HAQQINDA**
**I FƏSİL**
**ÜMUMİ MÜDDƏALAR**

1. **“Yanğın Təhlükəsizliyi haqqında” Azərbaycan Respublikası qanununun əsas müddəaları hansılardır?**

“Yanğın təhlükəsizliyi haqqında” Azərbaycan Respublikası qanununun əsas müddaları xalq təsərrüfatı sahələrinin və obyektlərinin, binaların, şəhərlərin, rayonların təhlükəsiz fəaliyyətinin təmin olunması məqsədilə yanğınların törənməsinin qarşısını almaq, onları sürətlə aşkar və ləğv etmək, insanların həyatını və sağlamlığını mühafizə etmək, maddi və mənəvi sərvətləri yanğından məhv olmaqdan qorumaqdır.

2. **İdarə və müəssisələrdə, ayrı-ayrı istehsalat sahələrində və obyektlərdə yanğın təhlükəsizliyinin təmin olunmasına kimlər cavabdehdir?**

SOCAR-ın bütün müəssisələrində yanğın təhlükəsizliyinə və Fövqəladə Hallar Nazirliyinin Dövlət Yanğın Nəzarəti və Dövlət Yanğından Mühafizə Xidmətləri tərəfindən verilən təklif və göstərişlərin yerinə yetirilməsinə bilavasitə həmin müəssisələrin rəhbərləri, ayrı-ayrı istehsalat sahələrində və obyektlərdə isə həmin sahələrin və obyektlərin rəhbərləri və ya onları əvəz edən şəxslər cavabdehdir

3. **“Neft, qaz və neft-kimya sənayesində yanğın təhlükəsizliyi Qaydaları”nın tələblərini pozan şəxslər hansı məsuliyyəti daşıyırlar?**

“Neft, qaz və neft-kimya sənayesində yanğın təhlükəsizliyi Qaydaları”nın tələblərini pozan təqsirkar şəxslər, həmin pozuntuların xarakterindən və nəticələrindən aslı olaraq mövcud qanunvericiliyə əsasən intizam, inzibati və cinayət məsuliyyəti daşıyırlar.

4. **Binalar oda davamlılıq dərəcəsinə görə neçə yerə bölünür?**

Binalar beş oda davamlılıq dərəcəsinə bölünür. I,II,III.IV,V.

- I - odadavamlılıq dərəcəli binalarda bütün konstruktiv elementlər yanmayan və onların odadavamlılıq həddi yüksək olur.

- II - odadavmlılıq dərəcəli binalarda konstruktiv elementlər yanmayan, lakin odadavamlılıq həddi nisbətən aşağı olur.
- III - odadavamlılıq dərəcəli binalarda əsas yükdaşıyan elementlər çətin yanan olur.
- IV - odadavamlılıq dərəcəli binalarda bütün əsas elementlər çətin yanan olur.
- V - odadavamlıq dərəcəli binalarda bütün elementlər yanan olur.

I və II odadavamlıq dərəcəli binalarda çardaq üstü və dam örtükləri də yanmayan materialdan olmalıdır.

III, IV, V dərəcəli binalarda isə onlar yanan materiallardan da ola bilər.

**5. İdarə, müəssisə və təşkilatların rəhbərləri yanğın təhlükəsizliyi ilə bağlı hansı tədbirlərin həyata keçirilməsini təmin etməlidir?**

İdarə, müəssisə və təşkilatların rəhbərləri yanğın təhlükəsizliyi ilə bağlı aşağıdakı tədbirlərin həyata keçirilməsini təmin etməlidirlər:

- Tabeliyində olan bütün MTİ, fəhlə və qulluqçular tərəfindən yanğın təhlükəsizliyi Qaydaların tələblərinin yerinə yetirilməsini;
- Aidiyyəti dövlət qurumlarının yanğın təhlükəsizliyi ilə bağlı qəbul etdikləri qərar, sərancam və göstərişlərin icrasını;
- Yanğınların qarşısının alınması və söndürülməsinin təşkili məqsədilə könüllü yanğından mühafizə dəstələrinin və yanğın –texniki komissiyasının yaradılmasını;
- İstehsalat, inzibati, anbar təyinatlı və yardımçı binalarda yanğına qarşı ciddi rejimin təşkilini, siqaret çəkilən yerlərin təchizini, odlu işlərin aparılmasında ciddi nizam-intizamın təminini, iş saatı qurtardıqdan sonra otaqların yoxlanılması və bağlanılması qaydalarını, bütün fəhlə və xidməti heyət tərəfindən bu qaydaların yerinə yetirilməsinin mütəmadi yoxlanılmasını;
- Aparılmış analizlər əsasında yanğın təhlükəsizliyinin yaxşılaşdırılmasına yönəldilmiş işlərin görülməsinin təşkili və yanğın təhlükəsizliyini pozan şəxslər haqqında konkret ölçü götürülməsini;
- Yanğına qarşı tədbirlərin yerinə yetirilməsi və yanğınsöndürmə vasitələrinin alınması üçün lazımi vəsaitin ayrılmasını.

**6. Könüllü yanğından mühafizə dəstələrinin vəzifələri nədən ibarətdir?**

Say tərkibi obyekt rəhbəri tərəfindən müəyyən edilən və onun əmri əsasında yaşı 18-dən az olmayan şəxslərdən təşkil edilən Könüllü yanğından mühafizə dəstələrinin vəzifələri aşağıdakılardan ibarətdir:

- Obyektdə yanğına qarşı reyimə riayət edilməsinə nəzarət etmək və ona əməl olunmasının vacibliyi haqqında işçilər arasınada işləri aparmaq;
- İlkin yanğınsöndürmə vasitələrinin və istifadəyə hazırlığına nəzarət etmək;
- Yanğın baş verdikdə yanğın dəstələrini çağırmaq və yanğından mühafizə vasitələrindən istifadə etməklə yanğının söndürülməsi üçün təxirəsalınmaz tədbirlər görmək.

**7. Yanğın-texniki komissiyalar və onların vəzifələri hansılardır?**

İşçilər tərəfindən yanğına qarşı profilaktiki tədbirlərin həyata keçirilməsində iştirak olunması və bu istiqamətdə fəal mübarizənin aparılması məqsədilə müəssisə rəhbərinin əmri ilə Baş mühəndisin sədrliyi və digər mühəndis-texniki işçilərdən (energetik, texnoloq, mexanik, su təchizatı üzrə mühəndis və ya həmin vəzifənin icrasını həyata keçirən digər şəxs, təhlükəsizlik texnikası üzrə mühəndis, həmkar təşkilatının nümayəndəsi və müəssisə rəhbərinin təyin etdiyi digər şəxslər) ibarət yanğın-texniki komissiyası yaradılır. Komissiyanın aşağıdakı vəzifələri vardır:

- İstehsalat prosesində yanğın, partlayış və ya qəzaya səbəb ola biləcək nöqsanların və nasazlıqların aradan qaldırılması üzrə müvafiq tədbirləri işləyib hazırlaması;
- İstehsalat sexlərində, anbarlarda, inzibati və yaşayış binalarında yanğına qarşı rejimin və yanğın profilaktikasına dair işlərin təşkilində və yerinə yetirilməsində yanğından mühafizə dəstələrinin fəaliyyətinə nəzarət etmək;
- İşçilərlə yanğına qarşı mövzular üzrə mühazirələr və məşğələlər aparmaq, həmkarlar təşkilatında müəssisənin yanğına qarşı vəziyyəti barədə müzakirələr aparmaq, ayrı-ayrı sahələrdə yanğın təhlükəsizliyinin təmin edilməsi məqsədilə qayda və təlimatların hazırlanmasında fəal iştirak etmək və yanğın təhlükəsizliyi məsələləri üzrə konfranslar keçirmək.

**8. İstehsalat sahələrində və obyektlərdə yanğın təhlükəsizliyinə cavabdeh rəhbərlər hansı işlərin görülməsini təmin etməlidirlər?**

Ayrı-ayrı istehsalat sahələrində və obyektlərdə yanğın təhlükəsizliyinə cavabdeh rəhbərlər aşağıdakı işlərin görülməsini təmin etməlidirlər:

- istehsalatın texnoloji proseslərini bilməli və yanğın təhlükəsizliyi Qaydalarına əməl etməli;
- obyektin rəhbərinin və ya baş mühəndisin yazılı icazəsi olmadan odlu işlərin aparılmasına icazə verməməli;
- binalara, tikililərə, su mənbələrinə gedən keçidlərin, istehsalat obyektlərinə gedən yolların, pilləkan qəfəslərinin, yanğın avadanlıqlarına girişlərin hər hansı bir əşya ilə tutulmasına yol verməməli;
- yanğınsöndürmə vasitə və cihazlarını hər gün baxışdan keçirməli, onların sazlığını və işə hazırlığını müvafiq təlimatların tələblərinə uyğun yoxlamalı;
- qəza nəticəsində yanğın baş verərsə dərhal yanğınsöndürmə və qəza xilasetmə dəstəsini çağırmalı və insanların köçürülməsinə başlamalıdır.

**9. İşçilərin yanğın təhlükəsizliyi üzrə vəzifələri nədən ibarətdir?**

- Hər bir işçi müəyyən edilmiş yanğın təhlükəsizliyi qaydalarına ciddi əməl etməli və yanğına səbəb ola biləcək hərəkətlərə yol verməməlidir.
- Yanğın təhlükəsizliyi qaydalarının pozulmasına və yanğınsöndürmə avadanlıqlarının düzgün istifadə edilməməsi hallarına rast gəldikdə dərhal bu barədə yanğın təhlükəsizliyi üzrə cavabdeh şəxsə məlumat verməlidir.

**10. İdarə və müəssisələrdə yanğın təhlükəsizliyinin təmini üzrə işlər necə təşkil edilməlidir?**

İdarə və müəssisələrdə Yanğın təhlükəsizliyi Qaydaları əsasında istehsalat xüsusiyyətləri nəzərə alınmaqla ümümmüəssisə, hər bir sex qurğu, laboratoriya və s. obyekt üçün yanğın təhlükəsizliyi üzrə təlimat hazırlanmalı və yerli yanğın təhlükəsizliyi xidməti ilə razılaşdırılaraq təsdiq olunmalıdır. Bu təlimatda yanğın təhlükəsizliyinin əsas tələbləri müəyyənləşdirilməli və aşağıdakılar nəzərdə tutulmalıdır:

- ərazinin saxlanma xüsusiyyəti, o cümlədən yollar, yanğın təhlükəsizliyi tələblərinə uyğun aralıq məsafələr, binalara, su mənbələrinə və digər obyektlərə keçid yolları;
- nəqliyyat vasitələrinin müəssisə ərazisinə buraxılması və onların hərəkət qaydaları;
- obyektdə siqaret çəkmək üçün xüsusi yerlərin ayrılması;
- yanğınsöndürmə və yanğın rabitə siqnalizasiya vasitələrinin saxlanılması qaydaları;
- birdəfəlik və müvəqqəti işləri yerinə yetirən şəxslərin obyektin ərazisinə buraxılması qaydaları;
- yanğından mühafizə xidmətinin çağırılması qaydaları.

**11. İdarə və müəssisələrdə yanğın təhlükəsizliyi ilə bağlı işlənib hazırlanmış təlimatlara hansı hallarda yenidən baxılmalıdır?**

Müəssisədə işlənib hazırlanmış təlimatlara aşağıdakı qaydada yenidən baxılmalıdır:

- üç ildə bir dəfədən az olmayaraq;
- texnoloji proses və iş şəraiti dəyişdikdə;
- təlimatın qüvvədə olduğu obyektdə qəza, partlayış, yanğın baş vərərdikdə;
- təlimatın əsasını təşkil edən sənədlər dəyişdikdə.

**12. Fəhlə və mühəndis-texniki işçilərin yanğın təhlükəsizliyi məsələləri üzrə öyrədilməsi və təlimatlandırılması necə təşkil olunur?**

Fəhlə və MTİ-rin təlimatlandırılması müəssisənin rəhbərliyi tərəfindən verilən əmrlə, qüvvədə olan qaydaların tələblərinə uyğun olaraq təşkil edilir. İşçilərlə keçirilən yanğın təhlükəsizliyi üzrə təlimat giriş və iş yerində təlimatlandırma zamanı keçırılməlidir. Müəssisəyə işə qəbul edilmiş bütün işçilər, həmçinin təcrübəyə göndərilmiş, ezam edilmiş və müvəqqəti işə qəbul edilmiş bütün şəxslərlə giriş və ilkin təlimat keçməlidirlər. Çiriş təlimatı müəssisənin əməyin mühafizəsi xidməti, ilkin və təkrar təlimatlar isə sahənin, obyektin rəisləri (onların müavinləri) tərəfindən keçirilməlidir.

**13. İdarə və müəssisələrdə yanğın təhlükəsizliyi ilə bağlı verilən əmrdə nələr təyin edilməlidir?**

- yanğınsöndürmə və yanğın siqnalizasiya qurğularının istismarı və saxlanılması üzrə cavabdeh şəxs;

- yanğın-texniki minimum proqramı üzrə təlim keçəcək işçilərin siyahısını;
- yanğına qarşı təlimatlandırmanı və yanğın-texniki minimum üzrə məşğələləri aparacaq işçilərin siyahısını;
- yanğına qarşı təlimatlandırmanı və yanğın-texniki minimum üzrə məşğələlərin keçirilmə yerlərini;
- yanğın təhlükəsizliyi üzrə təlimatlandırılmış və yanğın-texniki minimum proqramı üzrə öyrədilmiş şəxslərin qeydiyyatının aparılma qaydasını;

**14. Yüksək yanğın təhlükəli sahələrdə işləyən işçilərin biliklərini təkmilləşdirmək üçün hansı işlər görülməlidir?**

Yüksək yanğın təhlükəli sahələrdə işləyən fəhlə, qulluqçu və MTİ-lərin yanğın təhlükəsizliyi üzrə biliklərini təkmilləşdirmək, istehsalatın texnoloji prosesinin xüsusiyyətindən aslı olaraq, yanğın təhlükəsizliyi qaydalarını öyrətmək, mövcud yanğınsöndürmə vasitələri ilə tanış etmək və yanğın zamanı əməli hərəkət qaydalarını öyrətmək məqsədi ilə onlarla yanğın-texniki minimum (YTM) məşğələləri keçirilməlidir.

Yanğın-texniki minimum proqramı üzrə məşğələlər bilavasitə sexlərdə, qurğularda, istehsalat sahələrində, lobaratoriyalarda və s. yerlərdə aparılmalıdır. Məşğələlər ixtisas kateqoriyaları üzrə qruplarla (elektrik qaz qaynaqçıları, elektriklər, yanacaq anbarları təsərrüfatının fəhlələri və s.) ildə bir dəfədən az olmayaraq keçirilməlidir. Məşğələlərin proqramı və keçirilmə qaydası müəssisənin yanğın təhlükəsizliyi ilə əməyin mühafizəsi və təhlükəsizlik texnikası xidmətləri tərəfindən birlikdə işlənib hazirlanmalıdır.

**15. Yanğın zamanı insanların təhlükəsizliyinin təmin olunması məqsədlə hansı tədbirlər görülməlidir?**

- Hər bir müəssisədə təxliyyə planı olmalıdır, işçilər həmin planla tanış edilməli və planlar binaların görünən yerində asılmalıdır;
- İnsanların köçürülmə yollarındakı divar və tavanların bəzədilməsində yanan materiallardan, səthi yanan və yanğın zamanı boğucu qazlar ayrılan materiallardan istifadə edilməməlidir;
- Yanğın və qəza hallarında insanların evakuasiya edilməsinə imkan verən xüsusi avadanlıqlar daim saz vəziyyətdə saxlanılmalıdır;

- İstehsalat, inzibati, ictimai və digər təyinatlı binalarda yanğın baş verərkən insanların təxliyyə planı üzrə tez köçürülmə imkanları həyata keçirilməli və yanğının yayılmasının qarşısının alınmasını təmin etməlidir.

**16. Ərazilərə, istehsalat və inzibati binalara, otaqlara və avadanlıqlara olan yanğın təhlükəsizliyi tələbləri hansılardır?**

- Müəssisələrin və obyektlərin əraziləri, istehsalat otaqları və avadanlıqları daim təmiz və qaydasında olmalı, istehsalat qalıqları, zibil, quru ot yığılmalı və xüsusi yerlərə daşınmalıdır;
- İstehsalat ərazisinin, otaqların və avadanlıqların asan alışan və yanar maddələrlə, zibil və istehsalat qalıqlıqları ilə çirklənməsinə, ətraf mühitə zərər verə biləcək maddə və materialların yandırılmasına yol verilməməlidir;
- Müəssisə ərazisində, açıq anbar və çuxurlarda asan alışan və yanar maddələrin saxlanılmasına yol verilməməli, bu cür maddələr hopmuş yerlər təmizlənməli və həmin yerlərə quru qum tökülməlidir.

**17. Müəssisələrin ərazisindəki Partlayış-yanğın təhlükəli obyektlərin ətrafında hansı məsafədə olan otlar vaxtaşırı biçilməlidir?**

Partlayış-yanğın təhlükəli obyektlərin və tikililərin ətrafında radiusu 5m-dən az olmayan zonadakı otlar vaxtaşırı biçilərək təhlükəsiz yerə daşınmalı və həmin zonada yanar maddələrin saxlanılmasına yol verilməməlidir. Bu cür obyektlərin qarşısında onların partlayış-yanğın təhlükəli olması barədə lövhələr asılmalıdır.

**18. Müəssisə ərazisində siqaret çəkilmək üçün xüsusi yerlər ayrılması işləri necə təşkil olunmalıdır?**

Müəssisədə yanğından mühafizə xidməti ilə razılaşdırılmış siqaret çəkilməsi üçün xüsusi yerlər ayrılmalıdır. Bu yerlər kanalizasiya quyusundan, hidravliki qurğulardan və neftvurma nasos stansiyalarının binalarından ən azı 20 m kənarda olmalıdır. Həmin yerlərdə "Siqaret çəkmək üçün yer" yazılmış lövhə asılmalı, su ilə dolu tutum və ya qum yeşiyi qoyulmalıdır.

**19. Partlayış təhlükəli otaqlardakı telefon aparatları və onlara qoşulmuş xəbərverici qurğular hansı tələblərə cavab verməlidir?**

Partlayış təhlükəli otaqlardakı telefon aparatları və onlara qoşulmuş xəbərverici qurğular həmin otaqlarda əmələ gələ bilən partlayış qarışıqların kateqoriya və qrupuna uyğun partlayışdan mühafizəli quruluşda olmalıdır.

**20. Partlayış-yanğın təhlükəli obyektlərə giriş necə tənzimlənir?**

Partlayış-yanğın təhlükəli obyektlərə giriş yalnız xüsusi buraxılış vərəqəsi əsasında icazə verilir. Bu cür obyektlərin ərazisinə daxil olan avtonəqliyyat vasitələri, inşaat maşın və mexanizmləri qığılcım söndürən və yanğınsöndürmə vasitələri ilə təchiz edilməlidir.

**21. Partlayış-yanğın təhlükəli obyektlərdə yanğın təhlükəsizliyi tədbirləri nələrdir?**

- Partlayış-yanğın təhlükəli obyektlərin məşəl, kibrit, şam, kerosinli fənərlər, tonqal və digər açıq alov mənbələri ilə işıqlandırılması qadağandır.
- Hər bir müəssisədə istehsalat sexlərinin, ayrı-ayrı otaqların, qurğuların və anbarların partlayış-yanğın və yanğın təhlükəsizliyi üzrə kateqoriyalarını müəyyən edən siyahı tərtib olunmalıdır.
- Partlayış və yanğın baxımından təhlükəli ayrılmaları olan otaqları digər otaqlardan ayıran divardan keçən trasmissiya valları və boru xətlərində, bu ayrılmaların başqa otaqlara yayılmasının qarşısını alan kipkəc və ya kipləşdirici qurğular nəzərdə tutulmalıdır.

**22. İşçilərin səthlərinin temperaturu yüksək olan boru kəmərləri ilə təmasda olmaması üçün hansı tədbirlər görülməlidir?**

İstismar zamanı səthlərinin temperaturu $45^0$ c-dən yüksək olan boru kəmərləri və avadanlıqların işçi heyətin onlarla təmasda ola biləcək sahəsində çəpəri və ya yanmayan istilik izolyasiyası olmalıdır.

**23. İşçi zonanın hava mühitinə nəzarət necə təşkil olunmalıdır?**

Partlayış təhlükəli buxar və qazların yığılması ehtimal olan istehsalat otaqlarında partlayışın qarşısının almaq üçün hava mühitinə daimi nəzarət olmalıdır. İşçi zonaların hava mühitinə nəzarət neft sənayesi müəssisələrində hava mühitinə nəzarətin aparılmasına dair sahə təlimatlarına əsasən təşkil olunmalıdır.

İstehsalat otaqlarında hava mühitinə nəzarət edən avtomatik siqnalizasiya sistemləri qəza ventilyasiya sistemi ilə bloklanmalıdır. Siqnalizasiya sistemləri işıq və səs xəbərvericiləri ilə təchiz olunmalıdır. İşçi zonanın hava mühitinə vaxtaşarı nəzarət sənaye-sanitariya, və ya kimya laboratoriyası, qazdan xilasetmə xidməti və ya xüsusi yaradılmış xidmətlər tərəfindən həyata keçirilir.

**24. Müəssisənin kanalizasiya şəbəkəsinə olan yanğın təhlükəsizliyi tələbləri hansılardır?**

Müəssisənin istehsalat kanalizasiya şəbəkəsi qapalı formada quraşdırılmalıdır. Kanalizasiya şəbəkəsi yanmayan materiallardan hazırlanmalı, boru və qurğuların kimyəvi–aqressiv çirkab suların təsiri nəticəsində korroziyadan mühafizəsi nəzərdə tutulmalıdır. Kanalizasiya baxış quyuları daim qapaqla bağlı vəziyyətdə saxlanılmalı və 10sm qalınlığı olan qum təbəqəsi ilə örtülməlidir.

**25. İstehsalat obyektlərinin ərazisində kanalizasiya qurğuları və yeraltı tikililərin havasının qazlılıq səviyyəsi hansı müddətdə və nə ilə yoxlanılmalıdır?**

İstehsalat obyektlərinin ərazisində qaz kəmərlərindən 15 m-ə qədər məsafədə və ondan hər iki tərəfdə yerləşən kanalizasiya qurğuları və yeraltı tikililərin havasının qazlılıq səviyyəsi ildə 3 dəfədən az olmayaraq, qaz kəmərinin istismara verildiyi birinci il isə ayda bir dəfədən az olmayaraq, lakin hər dəfə quyuda və yeraltı tikililərdə istehsalat işləri görülməzdən əvvəl yoxlanılmalıdır. Qazlılıq səviyyəsi qazanalizatorla yoxlanılmalıdır

**26. Texnoloji proseslərin avtomatik nəzarət, idarəetmə və tənzimləmə qurğularının istismarı zamanı hansı qaydalara əməl olunmalıdır?**

Texnoloji proseslərin avtomatik nəzarət, idarəetmə və tənzimləmə qurğularının istismarı zamanı aşağıdakılara əməl olunmalıdır:

- texnoloji avadanlıqların avtomatlaşdırılma vasitələri və sistemləri ilə tam təchiz olunmasına;
- yanğınların aşkar edilməsi, lokallaşdırılması və söndürülməsi sistemlərinin mövcudluğuna;
- avtomatlaşdırma sistemlərinin istismarı prosesində yanğına qarşı tələblərə riayət olunmasına.

## II FƏSİL
## ANBARLARDA YANĞIN TƏHLÜKƏSİZLİYİ QAYDALARI HAQQINDA

1. **Kimyəvi maddələr necə və harada yerləşdirilməli və saxlanılmalıdır?**
   - Kimyəvi maddələr "yerləşdirmə planı"na əsasən xüsusiyyətlərinə görə (yanğın təhlükəli, zəhərli, kimyəvi aktiv və s.) yerləşdirilməlidir.
   - Eyni fiziki-kimyəvi xassəli və yanğın təhlükəli maddələr bir yerdə saxlanıla bilər. Bunun üçün anbarlar biri birindən yanmayan divarlarla ayrılmış otaqlara bölünməlidir.
   - Yükləmə-boşaltma işləri başa çatdıqdan sonra avtonəqliyyayatın anbar ərazisində saxlanılmasına yol verilməməlidir.
2. **Yanğın zamanı yüksək temperaturun təsirindən ərimə xüsusiyyəti olan kimyəvi maddələr saxlanılan otaqlarda hansı tədbirlər görülməlidir?**

Yanğın zamanı yüksək temperaturun təsirindən ərimə xüsusiyyəti olan kimyəvi maddələr saxlanılan otaqlarda əriyən kimyəvi maddələrin sərbəst axmasına qarşı tədbirlər görülməlidir: otaqlarda panduslu kəndarlar, bortlar nəzərdə tutulmalıdır.

3. **Kimyəvi maddələr saxlanılan qablar, tutumlar, çəlləklər açıq meydançalarda necə yerləşdirilməlidir?**

Kimyəvi maddələr saxlanılan qablar, tutumlar, çəlləklər açıq meydançalarda, qrup halında və hər bir qrupda 100 ədəddən çox olmamaq şərti ilə yerləşdirilməli və qruplar arasındakı məsafə 1 m-dən az olmamalıdır. Hər qrupda eyni növ (eyni xassəli) kimyəvi maddələr saxlanılmalı və qruplar müvafiq yazılarla işarələnməlidir. Meydançalar hamarlanmalı və çəpərlənməlidir. Açıq meydançada saxlanılan kimyəvi maddələrlə dolu tutumlar günəş şüalarından qorunmalıdır.

**4. Turşuların zərərsizləşdirilməsi üçün hansı maddələrdən istifadə olunmalıdır?**

Turşular saxlanılan yerlər nişanlanmalıdır. Təsadüfən dağılmış turşunun zərərsizləşdirilməsi (neytrallaşdırılması) üçün əhəng və yaxud soda məhlulu saxlanılmalıdır.

**5. Asan alışan, yanar maye və yanar qaz anbarları yanğın təhlükəsizliyi baxımından hansı tələblərə cavab verməlidir?**

AAM və YM açıq anbarları istehsalat sexləri və yaşayış məntəqələrinə nisbətən aşağı səviyyəli meydançalarda yerləşdirilməlidir. Meydançaların qəza zamanı mayenin axmasının qarşısını alan çəpərləri (bəndi) olmalıdır.

**6. Anbar otaqlarında elektrik açarı harada yerləşdirilməlidir?**

Anbar otaqlarında elektrik açarı anbar otağının xaricində, yanmayan divarda, divarları yanar materialdan olan anbarlarda isə ayrıca dirəkdə quraşdırılmış şkafda yerləşdirilməlidi

**7. Yanar qaz balonları saxlanılan anbarlara aid olan yanğın təhlükəsizliyi tələbləri hansılardır?**

Anbarların quruluşu qüvvədə olan norma və qaydaların tələblərinə cavab verməlidir. Anbar otaqlarının daxili taxta konstruksiyaları oda davamlı tərkiblə hobdurulmalıdır. Yanar qaz balonları saxlanılan anbarlar yüngül örtüklü, bir mərtəbəli olmalıdır. Yanar qaz balonları atmosfer çöküntülərindən və günəş şüalarından qorunmaqla açıq meydançalarda saxlanıla bilər. Yanar qaz balonları digər oksigen, sıxılmış hava, xlor və s. balonlardan ayrı saxlanılmalıdır.

**8. Anbarda müxtəlif material və məmulatlar necə saxlanılmalıdır?**

Anbarda müxtəlif material və məmulatlar, yanğının söndürülməsində istifadə olunan yanğınsöndürmə vasitələrindən (su, köpük, karbon qazı) asılı olaraq və materialların eyni yanma xüsusiyyətinə görə seçilib yığılmalı və digər maddə və materiallardan (azot və sulfat turşusu, digər üzvi maddələr və karbohidrogenlərdən) ayrı saxlanılmalıdır. Material anbarında qaz pilətələrinin, məişət elektrik qızdırıcı cihazların və sobaların quraşdırılması qadağandır. Material anbarında rəflər yanmayan materialdan hazırlanmalıdır. Material anbarlarının otaqlarında elektrokar, avtoyükləyici və digər daxili yanma mühərrikli texnikanın saxlanılması qadağandır.

**9. Anbar otaqlarının isidilməsində hansı istilik cıhazlarından istifadə edilə bilər?**

Anbar otaqların isidilməsində mərkəzi su və hava istilik cıhazlarından istifadə edilməlidir. Material anbarında qaz piltələrinin, məişət elektrik qızdırıcı cihazların və sobaların quraşdırılması qadağandır.

**10. Yanğın təhlükəsizliyi baxımından anbar müdiri (anbardar) işin sonunda hansı işləri görməlidir?**

Anbar müdiri (anbardar) işin sonunda anbar otaqlarına baxış keçirməli, yanğın təhlükəsinin olmamasına əmin olduqdan sonra elektrik şəbəkəsini söndürməli və anbarı bağlamalıdır.

**11. İstehsalat və yardımçı binaların zirzəmilərində asan alışan və yanar maddələrin saxlanılmasına icazə verilirmi?**

İstehsalat və yardımçı binaların, anbarların zirzəmilərində boyaların, rənglərin, kalsium karbidin, dolu qaz balonlarının, AAM, YM və digər partlayış yanğın təhlükəli maddələrin və materialların saxlanılması qadağandır.

## III FƏSİL
## İSİTMƏ və VENTİLYASİYA SİSTEMLƏRİNDƏ YANĞIN TƏHLÜKƏSİZLİYİ QAYDALARI HAQQINDA

**1. Hansı hallarda müəssisədə isitmə cihazlarının quraşdırılmasına icazə verilir?**

İsitmə cihazlarının quraşdırılmasına yalnız obyekt rəhbərinin müəssisənin yanğından mühafizə xidməti ilə yazılı razılaşmasından, yanğın təhlükəsizliyi üzrə məsul şəxslərin təyin edilməsindən və yanğından mühafizə xidmətinin təklif etdiyi bütün tədbirlər həyata keçirildikdən sonra yol verilir.

**2. Sobalı isidicilərin istismarı zamanı nələr qadağandır?**

Sobalı isidicilərin istismarı zamanı aşağıdakılar qadağandır:

- sobaların odluqlarının qarşısında yanacağın saxlanılması;
- sobaların alışdırılmasında benzin, kerosin, dizel yanacağı və digər TAM, YM-in istifadəsi;
- sobaların üstünə odunun, paltarların və digər tez alışan əşya və materialların qoyulması və qurudulması;
- sobanın qalanması üçün nəzərdə tutulmayan kömür, koks və qazdan istifadəsi;
- ventilyasiya kanallarından sobalarda baca kimi istifadəsi.

**3. İsitmə qurğularının texniki vəziyyətinə, istismarına kim cavabdehdir?**

İsitmə qurğularının texniki vəziyyətinə, istismarına, vaxtı-vaxtında təmirinə məsuliyyəti müəssisənin baş energetiki (baş mexaniki), müəssisənin ayrı-ayri obyektlərində isə həmin obyektlərin rəhbərləri daşıyır.

**4. Sobalar və tüstü boruları hansı müddətdən bir hisdən təmizlənməlidir?**

Sobalar və tüstü boruları isitmə dövrü başlamazdan əvvəl və bütün isitmə dövründə aşağıdakı qaydada hisdən təmizlənməlidir:

- isidici sobalar 2 ayda 1 dəfədən az olmayaraq;
- mətbəx plitələri və su qızdırıcıları ayda 1 dəfədən az olmayaraq;

- uzun müddətli isidilən xüsusi sobalar (yeməkxanalarda, quruducularda və s.) ayda 2 dəfədən az olmayaraq.

Nasaz sobaların və tüstü borularının istismarı qadağandır.

5. **Hansı isidici sobaları və digər qızdırıcı cihazları istismar zamanı nəzarətsiz qoymaq olmaz?**

Avtomatika ilə təchiz olunmayan isidici sobaların və digər qızdırıcı cihazların istismarı zamanı onları nəzarətsiz qoymaq qadağandır.

6. **Ventilyasiya sisteminin texniki vəziyyətinə, saz vəziyyətdə saxlanılmasına, istismarı zamanı yanğın təhlükəsizliyi tələblərinə riayət olunmasına görə məsuliyyəti kim daşıyır?**

Ventilyasiya sisteminin texniki vəziyyətinə, saz vəziyyətdə saxlanılmasına, istismarı zamanı yanğın təhlükəsizliyi tələblərinə riayət olunmasına görə məsuliyyəti müəssisənin baş mexaniki (baş energetiki) və ya müəssisə rəhbərinin əmri ilə təyin olunmuş şəxs daşıyır.

7. **İstehsalat, laboratoriya və inzibati otaqlarda sobaları kim işə salmalıdır?**

İstehsalat, laboratoriya və inzibati otaqlarda sobaların işə salınması müəssisənin əmri ilə təyin olunmuş, təlimatlandırılmış şəxs tərəfindən aparılmalıdır.

8. **Ventilyasiya sisteminə kənar əşyaların düşməməsi üçün hansı tədbirlər görülməlidir?**

Ventilyasiya sistemindən partlayış-yanğın təhlükəli maddələri kənarlaşdıran (metal və ya bərk əşyaların ventilyatorlara düşməməsi üçün) sorucu qurğular qoruyucu torla və ya maqnit tutucularla təchiz olunmalıdır. Yanar və partlayış təhlükəli maddələr olan istehsalat otaqlarında sorucu qurğuların metal hava vurucuları, boru xətləri, süzgəcləri və digər avadanlıqları yerlə birləşdirilməlidir.

9. **Hava mühitində asan alışan və ya partlayış təhlükəli maddələrin yığılması ehtimalı olan otaqlarda ventilyasiya sistemi qurğularının konstruksiyalarına hansı tələblər vardır?**

Hava mühitində asan alışan və ya partlayış təhlükəli maddələrin yığılması ehtimalı olan otaqlarda ventilyatorun, tənzimləyicilərin və ventilyasiya sisteminin digər qurğularının konstruksiyaları qığılcım verməyən materialdan hazırlanmalıdır.

**10. Qazanxana qurğularına xidmət etmək üçün kimlər buraxılırlar?**

Qazanxana qurğularına xidmət etmək üçün yaşı 18-dən az olmayan, tibbi müayinədən keçmiş, müvafiq qaydada təsdiq olunmuş proqram əsasında təlim kursu keçmiş və qazanxana qurğularının təhlükəsiz istismarı üzrə təlimatlandırılmış, bilikləri yoxlanılmış, müəssisənin və ya təşkilatın ixtisaslaşdırma komissiyası tərəfindən vəsiqə almış şəxslər buraxılırlar.

**11. Qazanxana qurğuları və buxar qazanları hansı yerlərdə quraşdırıla bilər?**

Qazanxana qurğuları və buxar qazanları aşağıdakı yerlərdə quraşdırıla bilər:

- ayrıca binalarda;
- bilavasitə istehsalat və ictimai binalara bitişik olan, lakin onlardan yanğına qarşı divarla ayrılan otaqda. Belə divarda qapılar olarsa, onun layları qazanxanaya tərəf açılmalıdır.

**12. Qazanların hansı yerlərdə quraşdırılmasına icazə verilmir?**

Qazanların aşağıda göstərilən yerlərdə quraşdırılmasına icazə verilmir:

- ictimai otaqların altında;
- yanar maye anbarlarının altında yerləşən otaqlarda;
- yanar maye və material anbarlarına bitişik otaqlarda;
- qaz və maye yanacaqla işləyən başqa qazanxananın içərisində;
- uşaq bağçaları, məktəb, xəstəxana, müalicə və istirahət müəssisələri binalarına bitişik tikilmiş otaqlarda

**13. Qazanxana otaqlarında nələr qadağandır?**

Qazanxana otaqlarında aşağıdakılar qadağandır:

- qazanxana qurğularının xidməti ilə bağlı olmayan işlərin görülməsi, kənar şəxslərin qazanxanaya daxil olması və qazanların istismarını kənar şəxslərə tapşırılması;
- qazanxana otaqlarında AAM və YM-in saxlanılması;
- qazanların və buxar xətlərinin üzərində yanar materialların, meşə materiallarının qurudulması;
- yanacaq sistemində maye və ya qaz yanacağının sızmasına yol verilməsi;
- forsunkalar və ya qaz odluqları söndükdə yanacağın verilməsi;
- qızdırıcı cihazların və isidici boru kəmərlərinin üstünə xüsusi geyimin, yağa bulaşmış parçaların qoyulması.

## IV FƏSİL
## YANĞIN TƏHLÜKƏSİZLİYİNDƏ SU TƏSƏRRÜFATI HAQQINDA

**1. Yanğına qarşı su təchizatı necə olmalıdır?**

Yanğın avadanlığına qoşulmuş su şəbəkəsi tələb olunan təzyiqi və yanğının söndürülməsi üçün hesablanmış su sərfini təmin etməlidir. Xətdə suyun təzyiqi kifayət qədər olmadıqda nasos-gücləndiricilər quraşdırılmalıdır. Yanğın hidrantları və kranları yerləşən sahələrin su xəttində suyun müvəqqəti kəsilməsi yalnız FHN-nin Dövlət Yanğından Mühafizə Xidmətinə məlumat verildikdən sonra yol verilir.

**2. Yanğın hidrantlarına və kranlarına hansı müddətdən bir texniki xidmət göstərilməlidir?**

Yanğın hidrantlarına və yanğın kranlarına hər 6 ayda bir texniki xidmət göstərilməli, iş vəziyyəti yoxlanılmalı və yoxlamanın nəticələri xüsusi jurnalda qeyd olunmalıdır.

**3. Müəssisələrin su nasosları hansı müddətdən bir yoxlanılmalıdır?**

Müəssisənin su nasos stansiyasının bütün nasosları daim saz vəziyyətdə saxlanılmalı, istifadəyə hazır olmalıdır. 10 gündə bir dəfədən az olmayaraq tələb olunan təzyiqə yoxlanılmalı və bu barədə xüsusi jurnalda qeyd aparılmalıdır.

**4. Yanğın kranları, yanğın şlanqları və lülələri harada saxlanılmalıdır?**

Yanğına qarşı daxili su xətlərinin yanğın kranları, yanğın şlaqları və lülələri otaqlarda quraşdırılmış divar şkaflarında saxlanılmalı, şkaflar möhürlənməlidir. Yanğın şlanqları quru olmalı, səliqəli bükülməli, yanğın kranına və yaxud lüləsinə birləşdirilmiş vəziyyətdə saxlanılmalıdır. Şkafın üzərinə “YK” işarəsi, yanğın kranının sıra nömrəsi və yanğın xidmətinin telefon mömrəsi yazılmalıdır.

## V FƏSİL
## ELEKTRİK TƏSƏRRÜFATINDA YANĞIN TƏHLÜKƏSİZLİYİ HAQQINDA

**1. Elektrik avadanlıqlarının vəziyyətinə cavabdeh şəxslər nələri etməyə borcludurlar?**

Elektrik avadanlıqlarının vəziyyətinə cavabdeh şəxslər aşağıdakıları etməyə borcludurlar:

- elektrik avadanlıqlarına, aparatlarına və elektrik şəbəkələrində vaxtı-vaxtında profilaktik yoxlamaların, planlı-qabaqlayıcı təmirin aparılmasına, nasazlıqların aradan qaldırılmasına;
- vaxtaşırı qəza ventilyasiyasının sınağının aparılmasına, qaz analizatorların sazlığını yoxlamağa;
- sistematik olaraq qısa qapanmalardan, həddindən artıq elektrik yüklənmələrindən, daxili və atmosfer gərginliyinin həddindən artıq artmasından qoruyan aparat və qurğuların vəziyyətinə nəzarət etməyə;
- elektrik qurğularının alışması və bunun nəticəsində əmələ gələn yanğınların araşdırılmasında və bu halların qarşısını almaq tədbirlərinin işlənib hazırlanmasında iştirak etməyə.

**2. Elektrik qurğularının istismarı zamanı nələr qadağandır?**

Elektrik qurğularının istismarı zamanı aşağıdakılar qadağandır:

- izolyasiyası zədələnmiş və istismar prosesi zamanı qoruyucu elektrik izolyasiya xüsusiyyətlərini itirmiş kabel və naqillərdən, odadavamlı altlığı olmayan elektrik qızdırıcı cihazlardan istifadə etmək;
- zədələnmiş razetkalardan, şaxələndirici və birləşdirici qutulardan, açarlardan və digər elktrik avadanlıqlarından istifadə etmək;
- iş prosesində səthinin temperaturu ətraf mühitin temperaturundan 40$^{o}$C–dən yuxarı olan elektrik mühərrik və avadanlıqlarından istifadə etmək;
- izolyasız naqillərin partlayış təhlükəli otaqlarda istifadəsi.

**3. Elektrik qurğuları qısa qapanma cərəyanından və digər anomal rejimlərdən mühafizə olunması üçün hansı tədbir görülməlidir?**

Bütün elektrik qurğuları qısa qapanma cərəyanından və digər anomal rejimlərdən (alışmaya və yanğına gətirib çıxaran) qoruyucu aparatlarla müfafizə olunmalıdır. Qoruyucuların əriyən taxmaları üzərində nominal cərəyanı göstərilməklə kalibirlənməlidir (möhür qoruyucunu istehsal edən zavod və ya elektrotexniki labarotoriya tərəfindən vurulmalıdır).

**4. İşıqlandırma şəbəkəsi necə quraşdırılmalıdır?**

İşıqlandırma şəbəkəsi elə quraşdırılmalıdır ki, çıraqlar binanın yanan materiallardan hazırlanmış konstruksiyaları ilə təmasda olmasın.

**5. Partlayış təhlükəli binalarda hansı növ işıqlandırıcılardan istifadə olunmalıdır?**

Partlayış təhlükəli binalarda və xarici qurğuların elektrik işıqlandırılması partlayışdan mühafizəli çıraqlarla təmin edilməlidir.

**6. Yanğın təhlükəli anbarlarda hansı çıraqlardan istifadə olunmalıdır?**

Yanğın təhlükəli anbar otaqlarında yalnız şüşə qapaq ilə təchiz edilmiş mühafizəli çıraqların quraşdırılmasına icazə verilir.

**7. İldırımdan və statik elektrikləşmədən mühafizə qurğularının vəziyyətinə kim cavabdehdir?**

Obyektdə istehsalat qurğu və avadanlıqlarının statik elektrikləşmədən qorunması qüvvədə olan norma və qaydalara əsasən aparılmalı, onların istismar üçün yararlı vəziyyətinə cavabdehlik müəssisənin baş energetikinə və ya elektrik təsərrüfatına cavabdeh şəxsə həvalə edilir.

**8. İldırım və statik elektrikləşmədən mühafizə necə aparılır?**

İldırım təsirindən və statik elektrikləşmənin boşalmasından mühafizə olunmaq üçün bütün metal aparatlar, çənlər, qazqolderlər, qaz kəmərləri, neft kəmərləri, boşaltma-doldurma qurğuları binaların daxili və xaricində yerləşməsindən asılı olmayaraq yerlə birləşdirilməlidir. Bu zaman mühafizə qurğularının vəziyyətinə cavabdehlik müəssisənin energetikinə və ya elektrik təsərrüfatına cavabdeh şəxsə həvalə olunur.

**9. Statik elektriləşmə yüklərinin ötürülməsi üçün nəzərdə tutulmuş yerləbirləşdirici qurğuların müqaviməti nə qədər olmalıdır?**

Yalnız statik elektriləşmə yüklərinin ötürülməsi üçün nəzərdə tutulmuş yerləbirləşdirici qurğuların müqaviməti 100 OM-dan çox olmamalıdır.

**10. Mühafizə qurğularına baxış və təmiri hansı müddətdən bir aparılmalıdır?**

Mühafizə qurğularına baxış və onların cari təmiri texnoloji avadanlıqlara baxış və təmirlə eyni zamanda aparılmalıdır. Avadanlıqların yerlə birləşməsi xüsusi cihazlarla, ildə bir dəfədən az olmayaraq, hər təmirdən sonra yoxlanılmalıdır.

**11. Elektrik avadanlığında yanğının söndürülməsi üçün nə etmək lazımdır?**

Yanğının söndürülməsindən əvvəl gərginlik altında olan elektrik avadanlığı dərhal dövrədən açılmalıdır. Əgər avadanlığı dövrədən açmaq mümkün deyilsə, yanğının söndürülməsi üçün karbon qazlı və tozlu odsöndürənlərdən, quru qumdan və azbest örtükdən istifadə olunmalıdır. Gərginlik altında olan yanan elektrik avadanlıqlarının söndürülməsində iştirak edən şəxslər saz və yoxlanılmış fərdi izoləedici elektrik qoruyucu vasitələrlə işləməlidirlər (dielektrik əlcəklər, uzunboğaz çəkmələr).

## VI FƏSİL
## QAZ TƏSƏRRÜFATININ İSTİSMARINDA YANĞIN TƏHLÜKƏSİZLİYİ QAYDALARI HAQQINDA

**1. Qaz kəmərlərinin qazla üfürülməsi və sınağı zamanı hansı təhlükəsizlik tədbirləri görülməlidir?**

Qaz kəmərlərinin qazla üfürülməsi və sınağı zamanı əhatəyə alınmış sahədə mühərriki işləyən avtomobil və traktorların olması, açıq alovdan istifadə edilməsi və siqaretin çəkilməsi qadağandır.

**2. Dəmir və avtomobil yolları yaxınlığındakı qaz kəməri zədələndikdə hansı təhlükəsizlik tədbirləri görülməlidir?**

Dəmir və avtomobil yolları yaxınlığındakı qaz kəməri zədələndikdə qəza sahəsi çəpərlənməli, xəbərdarlıqedici nişanlar qoyulmalı, burada nəqliyyatın hərəkəti dayandırılmalı və qəzanın aradan qaldırılması üçün tədbirlər görülməlidir. Xəbərdaredici işarələr qaz kəmərinin zədələnən yerindən şosse yolunun hər iki tərəfindən 800 m-dən az olmayan məsafədə qoyulmalıdır. Bu barədə dəmir yol xidmətinə məlumat verilməlidir.

**3. Odlu işlərin aparılması zamanı hansı tələblərə riayət olunmalıdır?**

Hər bir müəssisədə qüvvədə olan qaydalara və təlimatlara əsasən, istehsalatın xüsusiyyətini nəzərə almaqla odlu işlərin təhlükəsiz təşkili üçün müəssisə daxili təlimat işlənib hazırlanmalıdır. Təlimatlar hazırlanarkən "Neft sənayesində partlayış, partlayış-yanğın və yanğın təhlükəli obyektlərdə qaynaq və digər odlu işlərin aparılma qaydaları üzrə nümunəvi təlimat"ın tələbləri nəzərə alınmalıdır. Hazırlanmış təlimatlar yanğın təhlükəsizliyi xidməti ilə razılaşdırılmalı və müəssisənin baş mühəndisi tərəfindən təsdiq olunmalıdır.

**4. Qaynaq və digər odlu işlərin aparılması zamanı yanğın təhlükəsizliyinə kimlər cavabdehlik daşıyır ?**

Qaynaq və digər odlu işlərin aparılması zamanı yanğın təhlükəsizliyini təmin edən tədbirlərə görə cavabdehlik, ərazisi və otaqlarında bu işlər aparılan müəssisə, sex, laboratoriya, emalatxanaların və s. rəhbərlərinin üzərinə düşür. Partlayış, partlayış-yanğın və yanğın təhlükəli obyektlərdə odlu işlərin aparılması xüsusi icazə ilə həyata keçirilir.

5. **Partlayış, partlayış-yanğın və yanğın təhlükəli istehsalat sahələrində odlu işlər günün hansı vaxtında və kimlər tərəfindən yerinə yetirilə bilər?**

Partlayış, partlayış-yanğın və yanğın təhlükəli istehsalat sahələrində odlu işlər yalnız gündüz vaxtı aparılmalıdır və bu işlərin icrası xüsusi peşə hazırlığı keçmiş, imtahan vermiş, müvafiq ixtisas vəsiqəsi olan şəxslər tərəfindən yerinə yetirilməlidir. Odlu işlər yanar konstruksiyaların yaxınlığında aparılarsa, onlar yanmayan materiallarla mühafizə olunmalıdır. Odlu işlər başlayana qədər həmin yerdə digər bütün işlər dayandırılmalı, birbaşa işlə məşğul olamayan işçilər ərazidən uzaqlaşdırılmalıdır.

6. **Odlu işlərə başlamazdan əvvəl hansı tədbirləri həyata keçirmək lazımdır?**

İşə başlamazdan əvvəl odlu işlərin aparılmasına cavabdeh şəxs qaynaqçı ilə birlikdə qaynaq transformatoruna, kabellərə, elektrod tutucusuna, yerləbirləşdirmə naqillərinə və iş yerinə baxış keçirməli, yanar materialların, ətraf mühitdə qazlığın olmamasına və müvafiq işıqlandırmanın mövcudluğuna əmin olmalıdır.

7. **Elektrik qaynaq işləri zamanı əks ötürücü kimi nədən istifadə etmək qadağandır?**

Elektrik qaynaq işləri zamanı əks ötürücü kimi metal konstruksiyalardan, texnoloji aparatların gövdələrindən və boru kəmərlərindən istifadə etmək qadağandır. Bu məqsədlə elektrod tutucusu üçün tətbiq edilən naqilə uyğun kabel seçilməlidir.

8. **Qaz qaynağı zamanı yanğın təhlükəsizliyini təmin olunması üçün nələrə diqqət yetirilməlidir?**

- qaz qaynağı işləri zamanı oksigen balonlarının, şlanqların, odluğun, həmçinin asetilen genaratorunun üzərinə yağ, neft və neft məhsullarının dağılmasının qarşısını alan tədbirlər görülməsinə;
- Oksigen balonlarının açıq alovdan 10 metrdən yaxın məsafədə olmamasına və bu məsafədə yanacaq-sürtgü materialların saxlanılmamasına, oksigen və asetilen balonları arasında məsafənin 5 m-dən az olmamasına;

- Şlanqların sazlığına, onların odluğa bərkidilməsinə, qaz şlanqının yüksək temperaturun təsirindən və mexaniki zədələrdən qorunmasına;
- Qaynaq işləri zamanı odluğun həddən artıq qızmasına yol verilməməsinə və bu halda işi vaxtaşırı dayandıraraq odluğun su ilə soyudulmasına.

**9. Qaz qaynağı zamanı nələr qadağandır?**

Qaz qaynağı zamanı aşağıdakılar qadağandır:

- nasaz aparat və şlanqlarla qaynaq işinin aparılması, donmuş generatorun və onun hissələrinin, reduktorların, ventillərin, boru xətlərinin və qaynaq qurğusunun digər detallarının açıq alov və ya həddindən artıq qızmış əşya ilə qızdırılması;
- qaz balonunun içində qalan qaz tamamilə çıxarılmadan və balon üfürülmədən ventillərin təmir edilməsi;
- asetilen generatorundan, oksigen balonlarından, şlanqlardan, qaz xətlərindən və lil çalalarından 10 m-dən yaxın məsafədə siqaret çəkmək və açıq alovdan istifadə etmək;
- sıxılmış və mayeləşdirilmiş qaz balonlarının üstü açıq halda, günəş şüaları altında saxlanılması;
- oksigen şlanqlarının generatora tərəf üfürülməsi.

**10. Elektrik aparatları ilə (laqunda və s.) kəsmə və səthi təmizləmə işləri aparılarkən yanğın təhlükəsizliyi baxımından hansı tədbirləri görülməlidir?**

Elektrik aparatları ilə (laqunda və s.) kəsmə və səthi təmizləmə işləri görülən yerlər 10m radiusda asan alışan və yanar maddələrdən təmizlənməlidir. Qısa müddətli işin dayandırılması müddətində və yaxud fasilə zamanı elektrik aparatları elektrik şəbəkəsindən açılmalıdırlar. Elektrik kəsmə və səthi təmizləmə aparatları ilə işləyərkən qığılcımın təsirindən mühafizə olunmaq üçün işçılər xüsusi fərdi mühafizə vasitələri ilə təchiz olunmalıdır. Odlu işlər qurtardıqdan sonra ehtimal olunan alovlanmanın qarşısını almaq üçün işlərin aparıldığı və yaxınlıqda olan otaqlar və sahələr yoxlanılmalı və tələb olunarsa 1 saat ərzində nəzarətdə saxlanılmalıdır.

**11. Boru kəmərləri zədələndikdə hansı tədbirlər görülməlidir?**
Boru kəmərləri zədələndikdə (partladıqda) qəza sonrası dərhal dövrəyə alınmalıdır, xəbərdaredici işarələr qoyulmalıdır, nəqliyyatın hərəkəri dayandırılmalı və qəzanın ləğv edilməsi üçün tədbirlər görülməlidir.
**12. Texnoloji aparatların və qurğuların istismarı zamanı nə etmək lazımdır?**
Texnoloji aparatların və qurğuların istismarı zamanı daimi olaraq onların flans birləşmələrinin və kipgəc sıxlaşmalarının germetikliyinə nəzarət edilməlidir. Sızma yerləri aşkar edildikdə, onların ləğvi üzrə tədbirlər görülməlidir. Texnoloji aparat və qurğular təmirə dayandırıldıqda istismardan çıxarılmalı,məhsulu boşaldılmalı, istismarda olan armaturlardan, avadanlıqlardan və boru kəmərlərindən təcrid olunmalı, buxara verilməli və ya təsirsiz qazla üfürülməlidir. Lyuklərin açılmasına yuxarıdan başlamaq lazımdır.
**13. Yaşayış və xidməti otaqlarda yanğının söndürülməsi üçün nələrdən istifadə olunmalıdır?**
Yaşayış və xidməti otaqlarda yanğının söndürülməsi üçün aşağıdakılardan istifadə olunmalıdır:
- su söndürmə sistemlərindən;
- köpüklə söndürmədən;
- insanların olmadığı otaqlarda karbon qazı ilə.

**14. Tərkibində nəmlik olan qazlar və məhsulları nəql edən boru kəmərləri nə ilə qorunmalı və təchiz edilməlidir?**
Tərkibində nəmlik olan qazlar və məhsulları nəql edən boru kəmərləri istilik izolyasiyası ilə qorunmalı və ya lazım olarsa qızdırıcı qurğu ilə təchiz edilməlidir.

## VII FƏSİL
## NƏQLİYYAT MÜƏSSİSƏLƏRİNDƏ YANĞIN TƏHLÜKƏSİZLİYİ HAQQINDA

1. **Yanğın zamanı avtomobillərin evakuasiyası necə həyata keçirilməlidir?**

Avtomobillərinin sayı 25-də artıq olan avtonəqliyyat müəssisələrində yanğın zamanı avtomobillərin köçürülməsinə şərait yaratmaq üçün istehsalat rəhbəri tərəfindən, növbəsi və köçürülmə qaydası göstərilməklə, avtomobillərin düzülüşünün xüsusi planı işlənməli və təsdiq edilməlidir. Bu qarajların ən azı 2 darvazası olmalı və ehtiyat darvazasına yol həmişə boş olmalıdır. Plan dispetçerdə və ya avtomobil təsərrüfatı növbətçisində olmalı, sürəti isə qarajda saxlanılmalıdır.

2. **Avtomobillərin təmir olunduğu yerlərdə və yardımçı otaqlarda yanğın təhlükəsizliyinin təmin olunması üçün nələrə diqqət yetirilməlidir?**

Avtomobillərin təmir olunduğu yerlərdə və yardımçı otaqlarda bakları yanacaqla və karterləri yağla dolu (qazla işləyən maşınların isə dolu qaz balonu ilə) avtomobillərin təmirinə (1 saylı texniki xidmət üzrə işlər istisna olmaqla) icazə verilmir.

İşin sonunda təmir otaqları və baxış çuxurları yağlanmış silgi parçalardan və müxtəlif mayelərdən təmizlənməli, zibil tullantı və s. yığışdırılmalıdır.

3. **Avtomobil saxlanılan yerlərdə yanğın təhlükəsizliyi baxımında nələrə yol verilmir?**

Avtomobil saxlanılan yerlərdə aşağıdakılara yol verilmir:

- normadan artıq sayda avtomobillərin saxlanılması, onların düzülüş üsulunun pozulması, avtomobillər arasında və avtomobillərlə binanın elementləri arasındakı ara məsafənin gözlənilməməsi;
- avtomobillərin benzin baklarının ağzı açıq vəziyyətdə, həmçinin yanacağın sızması baş verərkən saxlanılması;
- dayanacaq, xidmət və təmir yerlərində avtomobillərin yanacaqla doldurulması;
- AAM və YM dolu taraların saxlanılması;

- mühərriklərin açıq odla qızdırılmasına, həmçinin texniki baxış və digər işlərin aparılması zamanı açıq alov mənbələrinin istifadəsinə;
- mühərriklərin işlək vəziyyətdə saxlanılmasına;
- müvafiq ixtisası olmayan şəxslərə avtomobillərin texniki xidmətinin və idarə olunmasının həvalə edilməsinə.

**4. Avtomobillərin yanmasının qarşısını almaq üçün hansı şərtlərə əməl edilməlidir?**

Avtomobillərin yanmasının qarşısını almaq üçün aşağıdakı  şərtlərə əməl edilməlidir:

- mühərriki işlək vəziyyətində olan avtomobillərin yanacaq və yağla doldurulmamasına;
- mühərrikdə və onun karterində neftlə qarışmış çirkin yığılmamasına;
- benzin xətti, karbürator və benzin bakı nasaz olan avtomobillərin istismarına;
- qarajda yerləşdirilmiş avtomobillərin banlarında AAM və YM saxlanılmamasına.

**5. Akkumulyator sexlərində yanğın təhlükəsizliyinə qarşı tələblər hansılardır?**

Akkumulyator sexlərində yanğın təhlükəsizliyinə qarşı tələblər aşağıdakılardır:

- akkumulyator sexləri yanmayan divarlar və ya arakəsmələrlə ayrılmalıdır;
- akkumulyator batareyalarının doldurma otaqlarında elektrik avadanlıqları partlayışdan mühafizəli icrada olmalıdır;
- elektrik naqilləri kip bərkidilməli və üzəri turşuya davamı laklanmış rezinlə örtülməlidir;
- turşulu və qələvili akkumulyatorlar üçün ayrı-ayrılıqda ventilyasiya quraşdırılmalıdır;
- akkumulyatorların təmiri, turşulu və qələvili akkumulyatorların bir yerdə quraşdırılması və nasaz akkumulyatorların doldurulması qadağandır.

**6. Rənglənmə sexlərində, rəng hazırlanma bölmələrində yanğın təhlükəsizliyinin təmin olunması məqsədilə nəyə icazə verilmir?**

Rənglənmə sexlərində, rəng hazırlanma bölmələrində, lak materialları anbarında açıq alov və qığılcım yaranması ilə müşahidə olunan işlərin aparılmasına icazə verilmir.

**7. Yanar yüklərin daşıyan avtomobillərə yanğın təhlükəsizliyinə qarşı tələblər hansılardır?**

Yanar yüklər - benzin, kerosin, metanol, texniki spirt və s. avtosisternlərdə və ya metal çəlləklərdə nəql olunur. Yüklərin daçınması, yüklənməsi və boşaldılması zamanı taraların zədələnməsi və bir-birinə toxunmaması üçün tədbirlər görülməlidir. Başqa qablarda (şüşə qablarda, vedrələrdə) yanar yükləri nəql etmək qadağandır. Avtomobildə yanğını söndürmək üçün vasitələr və xəbərdarlıq siqnalı (qırmızı bayraq) olmalıdır.

**8. Təhlükəli yük daşıyan avtomobili saxlamaq məcburiyyətində qaldıqda sürücü hansı şərtlərə əməl etməlidir?**

Görünmə şəraiti pis olan zaman təhlükəli yük daşıyan avtomobili saxlamaq məcburiyyətində qaldıqda, sürücü yol hərəkəti qaydalarında nəzərdə tutulan 25-30m arxada qəza dayanacağı işarəsi, avtomobilin qabaq və arxasında, arası 10 m məsafədən az olmayaraq narıncı rəngli 2 ədəd fənər qoymalıdır.

**9. Sıxılmış və mayeləşdirilmiş qazla dolu balonlar necə daşınır və saxlanılır?**

Sıxılmış və mayeləşdirilmiş qazla dolu balonlar xüsusi olaraq quraşdırılmış avtomobillərdə daşınmalıdır, qaz balonlarını avtomobil nəqliyyatına qədər xüsusi əl daşıyıcıları və ya arabalar vasitəsilə daşımaq lazımdır. Sıxılmış qaz balonları daşınan avtomobillər balonların diametrinə uyğun və çökəkləri keçə ilə örtülmüş olan xüsusi rəflərlə təchiz olunmalıdır. Balonların qoruyucu başlıqları eyni istiqamətə çevrilmiş halda, avtomobillərin banının hündürlüyü səviyyəsindən aşağı olmaqla yığılmalıdır.

## VIII FƏSİL
## YANĞINSÖNDÜRMƏ QURĞU və VASİTƏLƏRİ HAQQINDA

1. **Stasionar yanğınsöndürmə qurğularının texniki vəziyyətinə kim və necə nəzarət etməlidir?**

Stasionar yanğınsöndürmə qurğularının texniki vəziyyətinə nəzarət etmək üçün əmrlə müəssisənin (obyektin) texniki heyətində məsul şəxs, qurğuya gün (sutka) ərzində xidmət etmək üçün isə xüsusi hazırlıq keçmiş fəhlə briqadası təyin edilməlidir. Sistematik olaraq (həftədə bir dəfədən az olmayaraq) qurğunun vəziyyətini, briqada üzvlərinin öz vəzifə borclarını bilmələrini yoxlamalıdır.

2. **Avtomatik yanğınsöndürmə sistemləri hansı müddətlərdə yoxlanılmalıdır?**

İldə bir dəfədən az olmayaraq bütün avtomatik yanğınsöndürmə sistemlərinin işi yoxlanılmalı və yoxlamanın nəticələri jurnalda qeyd edilməlidir.

- yanğınsöndürmə qurğularının bütün aparat və boru xətləri 3 ildə bir dəfədən az olmayaraq möhkəmliyə və germetikliyə yoxlanılması üçün hidravlik sınaqdan keçirilməli, boru xətləri çirkdən və pasdan təmizlənməli, aşkar olunan nasazlıqlar aradan qaldırılmalıdır;
- qış dövründə yanğınsöndürmə qurğularına baxış zamanı istilik izolyasiyasının və qurğunun hissələrinin donmasının qarşısını alan qızdırıcı qurğuların vəziyyətinə xüsusi nəzarət edilməlidir.

3. **Köpükləsöndürmə qurğu və vasitələrinə nələr aiddir?**

Köpükləsöndürmə qurğu və vasitələrinə aşağıdakılar aiddir:

- köpük yaradan qurğular
- orta artımlı köpük generatoru
- hava–köpük lülələri
- köpükqaldırıcılar
- köpükəmələgətirici maddələr.

4. **İlkin yanğınsöndürmə vasitələri hansılardır?**

İlkin yanğınsöndürmə vasitələrinə aşağıdakılar aiddir:

- od söndürənlər (köpüklü, karbon qazlı və tozlu);
- qum dolu yeşiklər;

- bel, link, balta, qarmaq, yanğın vedrələri, brezent parçalar;
- qum daşıyan xərəklər.

**5. Köpüklü odsöndürənlərin gövdəsinin möhkəmliyə hidravliki sınağı hansı müddətdə aparılmalıdır?**

Köpüklü odsöndürənlərin gövdəsinin möhkəmliyə hidravliki sınağı yenidən doldurulmaqla aşağıdakı müddətə aparılmalıdır:

- 25% odsöndürənlər istismara veriləndən bir il sonra;
- 50% odsöndürənlər istismara veriləndən iki il sonra aparılır.

Sonrakı istismar müddəti üçün odsöndürənlərin hamısı (100%) ildə bir hidravlik sınaqdan keçirilir.

**6. Odsöndürən, qum yeşikləri və su saxlanılan çəlləklərə hansı tələblər qoyulur?**

Odsöndürən, qum yeşikləri və su saxlanılan çəlləklərə aşağıdakı tələblər aiddir:

- karbonqazlı odsöndürənlərin dolu olması 3 aydan bir, 20 qr-a qədər dəqiqlikdə çəkmə yolu ilə yoxlanılmalıdır;
- qum üçün yeşiklər 0,5; 1,0 və 3 m3 həcmdə hazırlanmalı, kip bağlanan qapağı olmalı, kürəklə təchiz olunmalı, qırmızı boya ilə rənglənməlidi;
- su saxlanılan çəlləklərin tutumu 0,2 m3-dən az olmalı və onlar vedrə ilə təchiz olunmalıdır.

**7. Yanğın rabitəsi və siqnalizasiya vasitələrinin vəziyyətinə nəzarət kim tərəfindən həyata keçirilir?**

Yanğın rabitəsi və siqnalizasiya vasitələrinin vəziyyətinə nəzarəti obyektin rəhbəri tərəfindən təyin edilmiş mühəndis-texniki işçi həyata keçirir.

**8. Qəza vəziyyəti nə vaxt ləğv edilə bilər?**

Qəza yerində avadanlıq və kommunikasiyanın texnoloji vəziyyəti yoxlanıldıqdan və yanar qazların partlayış təhlükəli qatılığının olmadığına əmin olmaq üçün analız aparıldıqdan sonra qəza vəziyyəti ləğv oluna bilər.

**9. Yanğın baş verdikdə müəssisənin hər bir fəhlə və qulluqçusu hansı işləri görməyə borcludur?**

Yanğın baş verdikdə müəssisənin hər bir fəhlə və qulluqçusu aşağıdakı işləri görməyə borcludur:

- dərhal yanğın dəstəsini çağırmalı;
- yanğın baş verən yerə obyektin rəhbərini çağırmalı;
- ilkin və stasionar yanğınsöndürmə vasitələrindən istifadə etməklə yanğının ləğvi üzrə tədbirlər görməli.

**10. Yanğın yerinə gələn xidmət rəisləri yanğın dəstəsi gələnə qədər hansı tədbirləri görməlidir?**

Yanğın yerinə gələn xidmət rəisləri yanğın dəstəsi gələnə qədər aşağıdakı tədbirləri görməlidir:

- yanğın haqqında dərhal müəssisə rəhbərliyinə xəbər verməli;
- yanğın dəstəsinin qarşılanmasını təşkil etməklə yanğın mənbəyinə yaxınlaşmaq üçün ən qısa yolun seçilməsində və yanğınsöndürmə vasitələrinin işə salınmasında kömək etməli;
- lazım gələrsə, elektrik enerjisinin kəsilməsinə, avadanlıqların və aqreqatların işinin dayandırılmasını və yanğının yayılmasının qarşısının alınması üzrə tədbirlərin götülməsini təmin etməli;
- obyektin yanğın təhlükəli zonasında yanğının ləğvi ilə bağlı işlərdən başqa bütün işləri dayandırmalıdır.

**11. Yanğının söndürülməsi işlərinə rəhbərlik edən nələri etməyə borcludur?**

Yanğının söndürülməsi işlərinə rəhbərlik edənlər aşağıdakıları etməyə borcludur:

- stasionar yanğın söndürmə vasitələrini işə salmaq;
- yanğının söndürülməsində iştirak edən şəxslərin elektrik cərəyanından zədələnməsindən, zəhərlənmədən və yanmadan mühafizəsini təmin etmək;
- yanğının söndürülməsi ilə yanaşı texnoloji avadanlıqların və tikinti konstruksiyalarının yüksək temperaturun təsirindən qorumaq üçün soyutmaq;
- yanğının söndürülməsi zamanı təhlükəsizlik tələblərinə əməl etmək.

**12. Müəssisə və obyektlərdə yanğın təhlükəsizliyi sahəsində işlərin görülməsi və xidmətlərin göstərilməsi nəyə əsasən aparılır?**

Müəssisə və obyektlərdə yanğın təhlükəsizliyi sahəsində işlərin görülməsi və xidmətlərin göstərilməsi FHN-nin Dövlət Yanğın Nəzarəti Xidmətindən alınmış razılıq əsasında həyata keçirilir.

## V BÖLMƏ

## YÜKQALDIRMA MEXANİZMLƏRİ, TƏHLÜKƏLİ YÜKLƏRİN DAŞINMASI, TƏHLÜKƏ POTENSİALLI OBYEKTLƏR VƏ TƏZYİQ ALTINDA İŞLƏYƏN QABLARIN İSTİSMARI ZAMANI TƏHLÜKƏSİZLİK QAYDALARI HAQQINDA

### I FƏSİL

### YÜKQALDIRMA MEXANİZMLƏRİ HAQQINDA

**1. Yük qaldırıcı mexanizmlərin qeydiyyatı və onların işə buraxılması üçün icazənin verilməsi qaydaları?**

FHN-nin Sənayedə işlərin təhlükəsiz görülməsi və dağ-mədən nəzarət Dövlət Agentliyində qeydiyyatda olan və ya qeydiyyatdan keçməsi nəzərdə tutulan yükqaldırıcı maşınların işə buraxılmasına icazə aşağıdakı hallarda alınır:

- Yeni qeydiyyatdan keçmiş kranı işə salmazdan əvvəl.
- Kranın başqa yerə köçürülməsi ilə əlaqədar olaraq quraşdırma işlərindən sonra.
- Kranın rekonstruksiyasının əsaslı təmirindən sonra.

Kranın işə salınmasına “Dövdağtexnəzarət” komitəsinin müfəttişinin nəzarət yoxlamasının və kran sahibinin apardığı texniki yoxlamanın nəticələri əsasında verilir. Bunun üçün 5 gün əvvəl müfəttiş xəbərdar edilməlidir. Müəssisə tərəfindən kranın texniki vəziyyəti yoxlanılır və nəticə barədə kranın pasportunda qeydiyyat aparılır. Bundan sonra özü hərəkət edən oxlu kranın işə salınmasına nəzarət orqanları tərəfindən icazə verilir. Kranın istismarına icazə pasportda qeyd olunur.

**2. Yük qaldırıcı mexanizmlərin texniki sınağının aparılması müddəti, növləri və cavabdeh şəxslər?**

Texniki vəziyyətin yoxlanmasında məqsəd yükqaldırıcı mexanizmlərin sazlığını yoxlamaq, onların müasir normaların tələblərinə cavab verməsini müəyyənləşdirməkdən ibarətdir. Texniki vəziyyətin yoxlanılması 12 aydan bir, çox az hallarda istifadə olunan kranlar isə 3 ildən bir “Dövdağtexnəzarət” komitəsi nümayəndəsinin iştirakı ilə aparılır. Texniki

vəziyyətin yoxlanmasının statik və dinamik növləri vardır. Kranlar aşağıda göstərilən hallarda növbədənkənar texniki yoxlamadan keçirilir.

- kranın konstruksiyasının əsaslı təmirindən sonra;
- metal konstruksiyasının əsaslı təmirindən sonra;
- yükqaldırma mexanizminin dəyişdirilməsindən sonra.

Yükqaldırma mexanizmlərin istismarına istehsalatın (sexin) mexanikləri və elektrikləri cavabdehdir.

**3. Hansı kranlar yükqaldırıcı məhdudlaşdırıcılarla təchiz olunmalıdır?**

Oxlu, qülləli və portal kranlar yükqaldırma məhdudlaşdırıcısı ilə təchiz olunmalıdırlar. Məhdudlaşdırıcı hər bir yük yol veriləndən 10%-dan (portal kranlar üçün 15%-dan) artıq olduqda avtomatik saxlanmanı təmin etməlidir.Körpülü kranlar istehsalat texnologiyasına əsasən onların əlavə yüklənməsi istisna olunmursa, yükqaldırma məhdudlaşdırıcı ilə təmin olunmalıdır. Kranın məhdudlaşdırıcısı ilə təmin olunması zərurəti sifarişdə göstərilməlidir. Körpülü kranın nominal yükqaldırmadan 25%-dən artıq yüklənməsinə məhdudlaşdırıcı imkan verməməlidir.

**4. Yükqaldırıcı maşınlar üzərində nəzarət kimə həvalə oluna bilər və həmin şəxslərin vəzifələri nələrdir?**

Yükqaldırıcı maşınlara nəzarət üçün komissiya tərəfindən yoxlanılan, xüsusi vəsiqəsi olan idarə tərəfindən təyin olunmuş mühəndis-texniki işçi ola bilər. Onun vəzifə borcu aşağıdakılardır:

- Yükqaldırıcı maşının təhlükəsiz istismarına və texniki vəziyyətinə nəzarət etmək, geydirilib-çıxarıla bilən yükqaldırıcı tərtibatlara nəzarət etmək. Xüsusən: Yüklərin düzgün ştropit olunmasına, ştrop salanların şəxsi təhlükəsizliyinə, yüklərin yerləşdirilməsində qabaritlərə fikir vermək, işləyən vaxt özü yeriyən kranların düzgün yerləşdirilməsinə nəzarət etmək.
- Texniki nəzarət orqanı tərəfindən verilən göstərişlərin, yükqaldırıcı maşınların və karnların növbəti qrafik üzrə yoxlanılmasına, geydirilib-çıxarıla bilən tərtibat və taraların baxış vaxtına nəzarət etmək.

**5. Hansı avtomobil sürücüləri avtokranların idarə edilməsinə buraxıla bilərlər?**

Avtokranı idarə etməyə yalnız kranı peşəsinə dair hazırlanmış proqram üzrə təlimat keçmiş və ixtisas dərəcəsini təyin edən komissiya tərəfindən tövsiyyə olunmuş vəsiqəsi olan avtomobil sürücülərinə icazə verilir. Avtokranın sürücüsü və cavabdeh şəxs kranın qəzasız işinə, əməkçi və yükvuran fəhlələrin əməyinin təhlükəsizliyinə, həmçinin kranın yanğından mühafizəsinə və yüklərin təhlükəsiz yüklənib-boşalmasına, daşınmasına cavabdehdir.

**6. Hansı hallarda kran statik sınanmaya davamlı sayılır?**

İstismarada olan qaldırıcı qurğular hər ildə 1 dəfədən az olmayaraq hissəli texniki sınaqdan və hər 3 ildə 1 dəfədən az olmayaraq tam texniki sınaqdan keçməlidirlər. Tam texniki sınaq zamanı krana baxış aparılmalı, statik və dinamik sınaqlardan keçirilməlidir. Texniki sınağın məqsədi aşağıdakılardır:

- Qaldırıcı qurğunun və onun hissələrinin qeydiyyatda göstərilmiş sənədlərə və qaydalara uyğunluğu;
- Qaldırıcı saz olması və onun təhlükəsizlik işləməsinin təmin olunması;
- Qaldırıcı qurğuya təhlükəsizlik qaydalarına uyğun olaraq xidmət edilməsi.

Statik sınaq zamanı kranın yükqaldırma qabiliyyətinə 25% əlavə yük verilir. Dinamik sınaqda isə 10% əlavə yük verilir. Statik sınaqda yük 20-30 sm qaldırılır və 10 dəq saxlanılır. Dinamik sınaqda yük hərəkət etdirilir, sonra bütün elementlər yoxlanılır.

**7. Yükqaldıran maşınların işi zamanı hansı işlərin görülməsinə icazə verilmir?**

- Qaldırıcı maşın hərəkət edərkən ona daxil olmaq;
- Üzərində adam olan yüklərin qaldırılması və yerdəyişməsi;
- Torpaqla örtülmüş, yerə donub yapışmış, digər yüklər arasında sıxılmış, bolt, qayka ilə bərkidilmiş yüklərin qaldırılması;
- Qaldırılmış yüklərin kənardan yana çəkilməsi;
- Yük altında ilmələrin və kanatların kran vasitəsilə çəkilməsi;

- Avtomobilin kabinasında adam olduğu zaman yüklərin doldurulub və ya boşaldılması;
- Təhlükəsizlik cihazları və tormoz saz olmadıqda işləmək.

**8. Avtonəqliyyat və xüsusi texnika maşınların texniki sazlığının yoxlanılması qaydası?**

Xəttə buraxılarkən və xətdən qayıdarkən avtomobillərin və onların aqreqatlarının texniki vəziyyəti mühərrik söndürülərkən və avtomobilin təkərlərinin əyləcləri yoxlanılmalıdır. Avtomobilin əyləci, yanacaqla qidalanma və alışma sistemlərinin yoxlanılması zamanı yuxarıda qeyd edilənlərə müstəsna hal kimi riayət edilmir.

**9. Yükqaldırma və boşaltma zamanı tətbiq edilən kanatların sazlığının təyin edilməsi qaydası necədir?**

Yükqaldırıcı maşınlar və yüktutan tərtibatlarda tətbiq olunan polad kanatlar aşağıdakı nöqsanlar aşkar olunursa yenisi ilə əvəz olunmalıdır:

- kanatın bir teli qırıldıqda;
- diametri 20mm-ə qədər olan kanatın addım burğusunun qırılmış məftillərinin sayı kanatın ümumi məftillərinin sayının 5%-dən çoxdursa, diametri 20 mm-dən böyük olan kanatlarda isə 10%-dən çox olduqda;
- kanatın dartılması nəticəsində onun diametri ilkin diametrinin 75%-ni təşkil etdikdə;
- kanatda burulmalar baş veribsə;
- yeyilmə, paslanma nəticəsində onun diametri əvvəlki diametrinin 40%-ni təşkil etdikdə.

**10. Qaldırıcı kranların təhlükəsiz işinin təmin edilməsi üçün müəssisə rəhbərliyi kimi məsul şəxs təyin edə bilər?**

Kran təsərrüfatına birbaşa məsul olan mühəndis-texniki işçilərdən birini.

**11. Yükqaldırma maşınlarda, yüklərin qaldırılmasını məhdudlaşdıran mexanizmə və oxun çıxmaması üçün tələb olunan təhlükəsizlik qaydası?**

Qülləli, qollu kranlar mütləq yükqaldırmanı məhdudlaşdıran mexanizm və oxun çıxmaması üçün avtomatik söndürücülərlə təmin olunurlar.

**12. Yükqaldırıcı kranların nəzarət orqanlarında qeydiyyata alınma qaydası?**

Nəzarət orqanlarından aşağıda göstərilən yükqaldırıcı maşınlar qeydiyyatdan keçir:

- qarmaqla işləmək üçün nəzərdə tutulmuş ekskavatorlar;
- ekskovator kranları;
- portal kranlar;
- körpülü kranlar;
- avtokranlar.

Aşağıda göstərilən kranlar nəzarət orqanlarından qeydiyyatdan keçmir:

- əl ilə idarə olunan kranlar, həmçinin əl ilə işləyən hərəkətdə olan mexanizmlər;
- yükqaldırma qabiliyyəti 10t-dək (10t daxil olmaqla) olan yerdən idarə olunan körpülü kranlar, hərəkət edən və ya dönə bilən konsollu kranlar;
- yükqaldırma qabiliyyəti 1 tona (1 t daxil olmaqla) qədər olan oxlu və qülləli kran yükqaldırıcı kranlar DDTNK-da məxsus olduğu idarə rəhbərliyinin ərizəsi və yükqaldırıcı maşının pasportu əsasında qeydiyyata alınır.

Ərizədə yükqaldırıcı kranların təhlükəsiz işinə nəzarət edən bilikləri yoxlanılmış cavabdeh şəxslər və krana xidmət heyəti haqqında məlumat olmalıdır və göstərilməlidir ki, kranın texniki vəziyyəti onun təhlükəsiz işləməsini təmin edə bilər. Kranları qeydiyyata alarkən ərizəyə kranı quraşdıran təşkilatın məsul şəxsi tərəfindən imzalanmış quraşdırma işlərinin aparılmasını təsdiq edən akt əlavə edilməlidir. Yükqaldırıcı kranlar yanalma körpüsü üzərində quraşdırılarsa, kranın orada quraşdırılmasının mümkünlüyü haqqında arayış təqdim edilməlidir.

Yükqaldırıcı kranın hazırlandığı zavod tərəfindən verilmiş pasportu yoxdursa, o, məxsus olduğu idarə tərəfindən hazırlanmış pasport əsasında qeydiyyata alına bilər.

**13. Yükqaldırma kranlarının sınanması qaydası?**

İstismarda olan qaldırıcı qurğular hər ildə bir dəfədən az olmayaraq qeyri/tam texniki sınaqdan keçməlidirlər. Tam texniki sınaq zamanı krana baxış aparılmalı, statik və dinamik sınaqlardan keçirilməlidir. Texniki sınağın məqsədi aşağıdakılardır:

- Qaldırıcı qurğunun və onun hissələrinin qeydiyyatda göstərilmiş sənədlərə və qaydalara uyğunluğu;
- Qaldırıcı qurğunun saz olması və onun təhlükəsiz işləməsinin təmin olunması;
- Qaldırıcı qurğuya təhlükəsizlik qaydalarına uyğun olaraq xidmət edilməsi.

Statik sınaq zamanı kranın yükqaldırma qabiliyyətindən 25% əlavə yük verilir. Dinamik sınaqda isə 10% əlavə yük verilir. Statik sınaqda yük 20-30 sm qaldırılır və 10 dəq saxlanılır. Dinamik sınaqda yük hərəkət etdirilir, sonra bütün elementlər yoxlanılır.

**14. Qollu kranların təhlükəsizliyini təmin edən cihazlara və quruluşlara tələb olunan təhlükəsizlik qaydası?**

Qollu kranlarda qolun qaldırılmasında avtomatik söndürücü qoyulur ki, axıra yaxınlaşanda dayandırılsın, həmçinin bu kranlarda yükün qaldırılması məhdudiyyəti vardır ki, həmin anda yükqaldırma avtomatik dayandırılır. Qollu kranın kabinəsində kranlı əyilmə dərəcəsini göstərən göstəricisi quraşdırılır. Bu kranlarda həmçinin səs siqnalı olur.

**15. Kranların və onların elementlərinin təmiri üçün icazənin alınması qaydası?**

Kranların və onların aparıcı elementlərinin təmiri DDTNK-nın icazə verdiyi müəssisələr tərəfindən aparıla bilər. Belə işlərin aparılmasına icazə "qaldırıcı qurğuların hazırlanmasına nəzarət üzrə təlimat"da göstərilən qaydada verilir. Kranların və onların ayrı-ayrı elementlərinin hazırlanmasına icazə o zavoda verilir ki, onun texniki imkanları olsun və qaynaq işlərinin keyfiyyətinə nəzarət etməyə qaydalar əsasında imkan olsun.

Kranları seriya ilə hazırlayan zavod texniki nəzarət orqanına icazə almaq üçün aşağıdakı sənədləri təqdim etməlidir:

- kranın ümumi görünüşünün cizgiləri, qəbul komissiyasının aktı, texniki şərtlər (təsdiq olunmuş formada), pasport, montaj və istismar üzrə təlimatlar.

Kranların elementlərinin təmiri üçün icazə almaq üçün zavod texniki nəzarət orqanına aşağıdakı sənədləri təqdim etməlidir:

- hazırlanacaq elementlərin cizgiləri, texniki şərtlər (təsdiq olunmuş formada), bilikləri yoxlanılmış qaynaqçıların sayı haqqında arayış.

**16. Hansı yükqaldırıcı kranlarda məhdudlaşdırıcının quraşdırılması zəruridir, hansılarda yox?**

Oxlu, qülləli və portal kranlar yükqaldırma məhdudlaşdırıcısı ilə təchiz olunmalıdırlar. Məhdudlaşdırıcı hər bir yük yol veriləndən 10%-dən (portal kranlar üçün 15%-dən) artıq olduqda avtomatik saxlanmanı təmin etməlidir. Körpülü kranlar istehsalat texnologiyasına əsasən onların əlavə yüklənməsi istisna olunmursa (mümkündürsə), yükqaldırma məhdudlaşdırıcısı ilə təmin olunmalıdırlar. Kranın məhdudlaşdırıcısı ilə təmin olunması zərurəti sifarişdə göstərilməlidir. Körpülü kranın nominal yükqaldırmadan 25%-dən artıq yüklənməsinə məhdudlaşdırıcı imkan verməməlidir.

**17. Hansı yükqaldırıcı kranlara və tərtibatlara qayda tələbləri tətbiq edilir?**

- Bütün növ qaldırıcı kranlara;
- Yer üzərindəki relslərlə idarəetmə kabinələri ilə birlikdə hərəkət edən yük elektrik arabalarına;
- Əl və elektrik tallara;
- Kran-ekskovatorlara;
- Yüktutucu hissələrə;
- Yük qaldırmada istifadə olunan qablara.

**18. Hansı yükqaldırıcı kranlara və tərtibatlara qayda tələbləri tətbiq edilmir?**

- Gəmilərin və üzən qurğuların üzərində quraşdırılmış qaldırıcı qurğulara (onlar üçün xüsusi qaydalar tətbiq olunur);
- Yerqazan ekskovatorlara və qreyferlərə;
- Xüsusi təyinatlı qaldırıcılara;
- Quraşdırıcı polisepatlara və konstruksiyalara;
- Hərbi hissələrin qaldırıcı maşınlarına.

**19. Yükqaldırıcı kranları idarə edən və onlara xidmət edən şəxsə qarşı hansı tələblər var?**

Yükqaldıran maşınların idarə edilməsinə və onlara xidmət edən şəxslərin yaşı 18-dən yuxarı olmalıdır və müəyyən olunmuş qaydada təlimat və təcrübə keçmiş və biliyi yoxlanılmalıdır. Belə şəxslərlə təlimat usta tərəfindən keçirilməlidir. Biliklərin yoxlanması isə sahə rəisi tərəfindən aparılmalıdır. Avtokranı xüsusi proqramla öyrədilmiş və attestasiya

komissiyası tərəfindən attestasiya olunmuş sürücülər idarə edə bilər. Bu zaman kranın maşinistinə attestasiya komissiyasının və DDTN nümayəndəsi sədri tərəfindən  imza edilmiş vəsiqə verilməlidir və onun sərbəst işə başlaması müəssisə üzrə əmrlə rəsmiləşdirilməlidir.
Yükləmə-boşaltma əməliyyatlarında iştirak edən şəxslər bilməlidirlər:

- Metalkonstruksiyaların, avadanlığın, materialların və digər yüklərin çəkisini və ağırlıq mərkəzini;
- Yüktutucu alətlərin və takelaj vasitələrinin quruluşunu və təyinatını, habelə onların yükqaldırma və yol verilən yüklənmə həddini;
- Metalkonstruksiyaların, avadaqnlığın və materialların bağlanma sxemini, yükləyib-boşaltma işlərinin ardıcıllığını.

## II FƏSİL
## TƏHLÜKƏLİ YÜKLƏRİN DAŞINMASI ZAMANI TƏHLÜKƏSİZLİK QAYDALARI HAQQINDA

1. **Avtomobil nəqliyyatı vasitələri ilə təhlükəli yüklərin daşınmasında təhlükəsizliyin təmin olunması hansı qaydalar əsasında tənzimlənir?**

Azərbaycan Respublikası ərazisində avtomobil nəqliyyatı vasitələri ilə təhlükəli yüklərin daşınmasında təhlükəsizliyin təmin edilməsi üzrə əsas tələblər Nazirlər Kabinetinin 27.01.2000-ci il tarixli 10 nömrəli qərarı ilə təsdiq edilmiş "Təhlükəli yüklərin avtomobil nəqliyyatı ilə daşınması Qaydalarına"na əsasən tənzimlənir.

2. **Hansı fiziki və hüquqi şəxslər təhlükəli yüklərin daşınması fəaliyyəti ilə məşğul ola bilər?**

Mülkiyyət və təşkilati-hüquqi formasından asılı olmayaraq, hüquqi şəxslər, habelə hüquqi şəxs yaratmadan sahibkarlıq fəaliyyəti ilə məşğul olan fiziki şəxslər təhlükəli yüklərin daşınması üzrə fəaliyyət göstərməsi üçün FHN-nin Sənayedə İşlərin Təhlükəsiz Görülməsinə Nəzarət və Dağ-Mədən Nəzarəti Ağentliyindən xüsusi razılıq (lisenziya) almalıdırlar.

3. **Hansı sürücülər təhlükəli yük daşıyan avtomobilləri idarə edə bilərlər?**

Təhlükəli yük daşıyan avtomobilləri ixtisaslaşdırılmış təhsil kurslarında DYP və Dövlətdağmədəntexnəzarət Agentliyi ilə razılaşdırılmış proqram əsasında xüsusi hazırlıq keçmiş sürücülər idarə etməyə buraxılır. Eyni zamçanda bu sürücülərin ən azı fasiləsiz 3 il sürücülük stajı və həmin növ nəqliyyat vasitəsini idarə etməyə uyğun kateqoriyalı sürücü vəsiqəsi olmalı, müvafiq qaydada təlimatlandırılmalı və tibbi yoxlamadan keçməlidir.

4. **Təhlükəli yüklərin daşınma marşurutu kim tərəfindən müəyyən edilir?**

Təhlükəli yüklərin daşınma marşrutunun müəyyən edilməsi Azərbaycan Respublikasının Dövlətdağmədəntexnəzarət Agentliyi və DYP ilə razılaşdırılması həmin yükləri daşıyan avtonəqliyyat müəssisələri və ya

sənaye müəssisələrinin (hüquqi şəxslərin) avtonəqliyyat təsərrüfatları və fiziki şəxslər tərəfindən həyata keçirilir

5. **Təhlükəli yüklərin daşınma marşurutu müəyyən edilərkən nələr nəzərə alınmalıdır?**

Daşınma marşrutu müəyyən edilərkən aşağıdakılar nəzərdə tutulmalıdır:

- daşınma marşrutunun mümkün qədər yaşayış məntəqələrindən, eləcə də sənaye obyektlərinin, istirahət zonalarının, təbii qoruqların və memarlıq abidələrinin yaxınlığından keçməməsi;
- təhlükəli yüklər iri yaşayış məntəqələrindən daşındığı təqdirdə marşrutun mədəni-maarif, tədris, məktəbəqədər tərbiyə və müalicə müəssisələrindən mümkün qədər aralı keçməsi.

6. **Təhlükəli yüklər nəqliyyat vasitələri karvanları ilə daşınarkən karvandakı nəqliyyat vasitələri arasında nə qədər məsafə saxlanmalıdır?**

Təhlükəli yüklər nəqliyyat vasitələri karvanları ilə daşınarkən karvandakı nəqliyyat vasitələri arasında aşağıdakı məsafələr saxlanmalıdır:

- düzənlik yerlərdən keçən yol sahələrində hərəkət zamanı - ən azı 50 metr;
- dağlıq yerlərdən keçən yol sahələrində hərəkət zamanı - ən azı 300 metr.

Təhlükə potensiallı yükləri daşıyan nəqliyyat vasitələri karvanla hərəkət edərkən daşınmaya məsul olan şəxs qabaqdakı avtomaşında, daşınma şərtləri ilə karvanın mühafizəsi nəzərdə tutulduğu hallarda isə mühafizəçilərdən biri axırıncı avtomaşında olur.

7. **Tez alışan və partlayış təhlükəli yükləri daşıyan nəqliyyat vasitələrnə yanacaq doldurularkən hansı şərtlərə əməl olunmalıdır?**

Tez alışan və partlayış təhlükəli yükləri daşıyan nəqliyyat vasitələri mümkün qədər yanacaqdoldurma məntəqələrindən yanacaq doldurmamaq məqsədi ilə daşınma məntəqəsinə qədər yanacaqla təmin olunur.

Yanacaqdoldurma məntəqəsindən yanacaq doldurmaq zəruriyyəti yarandığı təqdirdə nəqliyyat vasitələri ən azı 25 metr aralı məsafədə dayanır və məntəqədən ağzı bağlı metal qablarda gətirilən yanacaqla, yaxud bu məqsədlə ayrılmış xüsusi səyyar yanacaqdoldurma qurğuları vasitəsilə «Daimi və səyyar yanacaqdoldurma məntəqələrinin texniki

istismarı qaydaları» ilə nəzərdə tutulmuş tələblərə əməl edilməklə doldurulur.

**8. Təhlükəli yüklər hansı avtomobillərdə daşına bilər?**

Təhlükəli yüklər ixtisaslaşdırılmış xüsusi banlı və ya onların daşınması üçün avadanlıqlaşdırılmış xüsusi təyinatlı texniki təhlükəsizlik üzrə uyğunluq sertifikatı olan nəqliyyat vasitələri ilə daşınır. Həmin nəqliyyat vasitələrinin texniki-istismar göstəriciləri və texniki vəziyyəti onları istehsal edən zavodun təlimatının, «Nəqliyyat haqqında» və «Yol hərəkəti haqqında» qanunların, müvafiq normativ aktların, bu Qaydaların və xüsusi razılığın (lisenziyanın) tələblərinə və müəyyən növ təhlükəli yüklərin daşınma şərtlərinə cavab verməlidir.

Yuxarıda göstərilən texniki vasitələr Dövlətdağmədəntexnəzarət Agentliyi tərəfindən verilən şəhadətnamə əsasında DYP-də qeydiyyata alına bilər.

**9. Partlayış təhlükəli maddə və məmulatları daşıyan avtomobillərin səsboğanları hansı tələblərə cavab verməlidir?**

Partlayış təhlükəli maddə və məmulatları, tez alışan maye və qazları (çəndə və ya konteynerlərdə) daşıyan nəqliyyat vasitəsi radiatorun qabağından sağ tərəfə çıxan səsboğanla təchiz edilir. Mühərrikin yerləşməsi bu cür avadanlıqlaşdırmaya imkan vermədikdə, səsboğan yanacaq borularından, bandan və çəndən aralı sağ tərəfə çıxarılır.

Tez alışan maye və qazları daşıyan nəqliyyat vasitəsinin səsboğanı asan sökülən və quraşdırılan qığılcımsöndürənlə təchiz edilir.

Həmin nəqliyyat vasitələrinin yanacaq çənlərinin qabaq və arxa tərəfləri metal lövhələrlə qorunmalı, oturacağına 10x10 mm ölçüdə deşikləri olan metal tor quraşdırılmalıdır. Metal lövhə və torla çənin arasındakı məsafə 20 mm-dən az olmamalıdır.

**10. Təhlükəli yükləri daşıyan nəqliyyat vasitəsinin sürücüsündə yol hərəkəti qaydalarında göstərilənlərdən əlavə hansı sənədlər olmalıdır?**

Təhlükəli yükləri daşıyan nəqliyyat vasitəsinin sürücüsündə yol hərəkəti qaydalarında göstərilənlərdən əlavə aşağıdakı sənədlər olmalıdır:

- daşınmaya məsul şəxs olmadıqda təhlükəli yükün daşınma marşrutu;
- nəqliyyat vasitəsinin təhlükəli yüklərin daşınmasına buraxılması haqqında şəhadətnamə;

- sürücünün təhlükəli yüklərin daşınmasına buraxılması haqqında şəhadətnamə;
- təhlükə barədə xəbərdarlıq sisteminin qəza vərəqəsi.

Təhlükəli yükləri daşıyan nəqliyyat vasitələrinin yol vərəqəsinin sol yuxarı küncündə qırmızı rəngli mürəkkəblə «Təhlükəli yük» sözləri qeyd edilməlidir.

**11. Təhlükəli yüklərin daşındığı nəqliyyat vasitəsini idarə edən sürücülərə nələr qadağandır?**

Təhlükəli yüklərin daşındığı nəqliyyat vasitəsini idarə edən sürücülərə aşağıdakılar qadağan edilir:

- nəqliyyat vasitəsini yerindən kəskin tərpətmək;
- nəqliyyat vasitəsini kəskin tormozlamaq;
- sürət ötürücüsünün neytral vəziyyətində söndürülmüş mühərriklə hərəkət etmək;
- partlayıcı maddələr, tez alışan maye və qazlar, bərk xüsusiyyətli təhlükəli məmulatlar daşıyarkən siqaret çəkmək;
- nəqliyyat vasitələrindən 100 metrdən yaxın məsafədə od (tonqal) yandırmaq;
- zəruri olmadığı hallarda (yükü müşayiət edən şəxs olmadıqda) nəqliyyat vasitəsini tərk etmək.
- sənədlərdə nəzərdə tutulmayan yükləri, həmçinin yüklərin daşınması ilə əlaqədar olmayan şəxsləri daşımaq.

**12. Hansı obyektlər təhlükə potensiallı obyektlər hesab edilir?**

Əhali və ətraf mühit üçün təhlükə yaradan partlayış-yanğın, radioaktiv və ionlaşdırıcı şüa mənbələrinin, zəhərləyici maddələrin əldə olunması, hazırlanması, emalı, daşınması, istifadə edilməsi və ləğvi ilə məşğul olan istehsal, təchizat, nəqliyyat və sosial təyinatlı obyektlər təhlükə potensiallı obyektlər hesab edilir.Təhlükə potensiallı obyektlərin siyahısı müvafiq icra hakimiyyəti orqanı tərəfindən təsdiq edilir və müəyyən edilmiş qaydada dövlət reyestrində qeydiyyatdan keçirilir.

## III FƏSİL
## TƏHLÜKƏ POTENSİALLI OBYEKTLƏR HAQQINDA

1. **Hansı obyektlər təhlükə potensiallı obyektlər hesab edilir və onlar hansı sənədlər əsasında müəyyən edilir?**

Əhali və ətraf mühit üçün təhlükə yaradan partlayış-yanğın, radioaktiv və ionlaşdırıcı şüa mənbələrinin, zəhərləyici maddələrin əldə olunması, hazırlanması, emalı, daşınması, istifadə edilməsi və ləğvi ilə məşğul olan istehsal, təchizat, nəqliyyat və sosial təyinatlı obyektlər təhlükə potensiallı obyektlər hesab edilir.Təhlükə potensiallı obyektlərin siyahısı müvafiq icra hakimiyyəti orqanı tərəfindən təsdiq edilir və müəyyən edilmiş qaydada dövlət reyestrində qeydiyyatdan keçirilir. Bu obyektlərin siyahısı Azərbaycan Respublikası Nazirlər Kabinetinin "Təhlükə potensiallı obyektlərin Siyahısının təsdiq edilməsi haqqında" 10.05.2001-ci il tarixli 94 nömrəli qərarında göstərilmişdir.

2. **Təhlükə potensiallı obyektdə istifadə olunan texniki qurğular və avadanlıqlarla bağlı hansı tələblər mövcuddur?**

Təhlükə potensiallı obyektdə istifadə olunan texniki qurğular, maşın və mexanizmlər texniki təhlükəsizlik tələblərinə uyğunluğu baxımından Azərbaycan Respublikasının qanunvericiliyi ilə müəyyənləşdirilmiş qaydada sertifikatlaşdırılır. Təhlükə potensiallı obyektlərdə istifadə olunan texniki qurğuların siyahısı müvafiq icra hakimiyyəti orqanı tərəfindən təsdiq olunur.Təhlükə potensiallı obyektlərdə istifadə olunan texniki qurğuların sertifikatlaşdırılması müvafiq icra hakimiyyəti orqanı tərəfindən aparılır və Sertifikatın verilmə qaydaları qanunvericiliyə uyğun olaraq müəyyənləşdirilir.Təhlükə potensiallı obyektlərdə istifadə olunan avadanlıq və texniki qurğular istismar prosesində müəyyən edilmiş qaydada texniki təhlükəsizlik ekspertizasından keçirilir.

3. **Təhlükə potensiallı obyektlərin layihələşdirilməsinə, tikintisinə və istismara qəbul edilməsinə texniki təhlükəsizlik tələbləri hansılardır?**

Təhlükə potensiallı obyektin tikintisinə, genişləndirilməsinə, yenidən qurulmasına, texniki cəhətdən yeniləşdirilməsinə, konservasiyasına və

ləğv edilməsinə başlanması barədə qərarın qəbul edilməsinin məcburi şərtlərindən biri layihə sənədləri barədə texniki təhlükəsizlik üzrə müsbət ekspertiza rəyinin olmasıdır. Bu zaman layihə sənədlərindən kənara çıxma hallarına yol verilmir. Layihə sənədlərinə edilən dəyişikliklər müvafiq icra hakimiyyəti orqanı ilə razılaşdırılır.

Təhlükə potensiallı obyektlərin istismara qəbulu Azərbay-can Respublikasının qanunvericiliyi ilə müəyyənləşdirilmiş qaydada aparılır.

Təhlükə potensiallı obyektlərin istismara qəbulu zamanı obyektin layihə sənədlərinə uyğunluğu, hüquqi və fiziki şəxslərin təhlükə potensiallı obyektlərin istismarına, habelə qəzaların lokallaşdırılmasına və nəticələrinin ləğv edilməsinə hazırlıqlarının vəziyyəti yoxlanılır.

**4. Təhlükə potensiallı obyektin istismarına dair texniki təhlükəsizlik tələbləri hansılardır?**

Təhlükə potensiallı obyekti istismar edən hüquqi və fiziki şəxslər:

- “Texniki təhlükəsizlik haqqında Azərbaycan Respublikasının qanunu”nun, digər qanunların və normativ hüquqi aktların, eləcə də texniki normativ sənədlərin tələblərinə əməl etməlidir;
- Təhlükə potensiallı obyektlərdə işçi heyətlərini komplektləşdirərkən onların texniki təhlükəsizlik və ixtisaslaşma tələblərinə, habelə qanunla müəyyənləşdirilmiş digər tələblərə uyğunluğunu və tibbi cəhətdən yararlığını təmin etməlidir;
- Təhlükə potensiallı obyektdə normativ hüquqi aktlara və işlərin aparılması qaydalarını müəyyənləşdirən normativ texniki sənədlərə malik olmalıdır;
- Binaların texniki təhlükəsizlik ekspertizasından keçirilməsini təmin etmək, eləcə də Təhlükə potensiallı obyektdə istifadə olunan tikili, avadanlıq və texniki qurğuların diaqnostikasını, sınağını və ümumi yoxlanmasını keçirməlidir;
- Təhlükə potensiallı obyektlərin mühafizəsini təşkil etməli və təhlükəli maddələrin saxlanmasına dair texniki təhlükəsizlik tələblərinə riayət etməlidir;

texniki təhlükəsizlik bəyannaməsi hazırlamaq, təhlükə potensiallı obyektlərin istismarı zamanı dəymiş zərərə görə məsuliyyətin məcburi sığortalanması barədə müqavilə bağlamalıdır;

- Təhlükə potensiallı obyektin istismarına dair xüsusi razılığa malik olmalıdır;
- Partlayıcı və radioaktiv maddələrin, partlayıcı materialların və ionlaşdırıcı şüa mənbələrinin uçotunun aparılmasını, onların texniki normativ sənədlərin tələblərinə uyğun qaydada saxlanmasını, işlədilməsini və təhlükəsiz istifadə olunmasını təmin etməlidir;
- Müvafiq icra hakimiyyəti orqanlarının təlimat, sərəncam və göstərişlərinə əməl etməlidir.

**IV FƏSİL**
**TƏZYİQ ALTINDA İŞLƏYƏN QABLARIN İSTİSMARI ZAMANI TƏHLÜKƏSİZLİK QAYDALARI HAQQINDA**

1. **Neft və qaz sənayesində istismarda olan təzyiq altında işləyən qabların istismarı hansı qaydalarla tənzimlənir?**

“Neft, qaz və neft-kimya sənayesində təzyiq altında işləyən qabların quruluşu və texniki təhlükəsizlik Qaydaları”na əsasən.

2. **Hansı şəxslər oksigen balonlarının daşınması və onlara xidmət göstərilməsinə buraxıla bilər?**

Oksigen balonlarının daşınması, onların saxlanıldığı anbarda xidmət işlərinə 18 yaşından yuxarı, tibbi müayinədən keçmiş, sağlam, nəzəri və praktiki hazırlığı olan, yerinə yetirdiyi iş həcmində “təzyiq altında işləyən qabların qurluşu və təhlükəsizlik istismar qaydaları” üzrə bilikləri yoxlanılmış işçilər buraxıla bilər.

3. **Təzyiq altında işləyən qabların istismarı ilə əlaqəli baş vermiş qəzaların və bədbəxt hadisələrin tədqiqatı necə aparılır?**

Təzyiq altında işləyən qabların istismarı ilə əlaqəli baş vermiş qəzaların və bədbəxt hadisələrin texniki təhqiqatı Azərbaycan Respublikası NK 28.02.2000-ci il tarixli, 27 nömrəli qərarı ilə təsdiq edilmiş “İstehsalatda baş verən bədbəxt hadisələrin təhqiqi və uçota alınması qaydaları”nın tələblərinə uyğun olaraq FHN-nin SİTGDMND Agentliyi tərəfindən yaradılan xüsusi komissiya həyata keçirməlidir.

Qəza və bədbəxt hadisə baş verdiyi halda təhqiqat komissiyası hadisə yerinə baxış keçirənədək iş yerindəki şərait və avadanlıqların vəziyyəti hadisənin baş verdiyi anda olduğui kimi saxlanılmalıdır (əgər həmin şərait və vəziyyət ətrafdakı insanların həyatı və səhhəti üçün təhlükə yaratmırsa və qəzaya səbəb olmursa).

4. **Təzyiq altında olan yanar qaz balonlarının saxlanılması necə həyata keçirilir?**

Yanar qaz balonları üçün anbarların təchizatı, partlayış təhlükəli otaqlar üçün müəyyən olunmuş normalara uyğun olmalıdır, təbii hava mübadiləsi və yaxud süni ventilyasiya sistemi ilə təchiz edilməlidir. Anbarlarda balonlarla davranma qaydalarını əks etdirən təlimatlar, qaydalar və

plakatlar asılmalıdır. Anbarlar ildırımdan mühafizə olunmuş zonada yerləşdirilməlidir.
Qazla dolu balonlar xüsusi qapalı yerlərdə və açıq havada saxlanıla bilər. Lakin bu halda balonlar atmosfer yağıntılarından və günəş şualarından mühafizə olunmalıdır. Oksigen və yanar qaz balonlarının eyni anbarda bir yerdə saxlanılması qadağandır.

**5. Hansı hallarda sistern və çəlləklərin qazla doldurulması qadağandır?**

Sistern və çəlləklərin aşağıdakı hallarda qazla doldurulması qadağandır:

- təyin edilmiş şəhadətləndirilmə müddəti olduqda;
- armatur və nəzarət-ölçü cihazları olmadıqda və ya nasaz vəziyyətdə olduqda;
- müvafiq rəngə boyanmadıqda və ya yazılar olmadıqda;
- sisternlərə və çəlləklərə onlar üçün nəzərdə tutulmayan qaz doldurduqda.

**6. Hansı balonlara qazın doldurulması qadağandır?**

Aşağıdakı balonlara qazın doldurulması qadağandır:

- növbəti şəhadətləndirmə vaxtı keçmiş;
- məsaməli kütlənin yoxlama müddəti keçmiş;
- gövdəsi zədələnmiş;
- ventilləri nasaz olan;
- müvafiq rənglə boyanmamış və müvafiq yazıları olmayan;
- qazın izafi təzyiqi olmadıqda;
- müvafiq damğası olmayan.

Qazın izafi təzyiqi olmayan balonlara doldurulması, doldurmanı həyata keçirən müəssisənin (qaz doldurma stansiyası) təlimatına uyğun olaraq əvvəlcədən yoxlanıldıqdan sonra yetirilməlidir.

**7. Hansı hallarda təzyiq altında işləyən qabların istismarı qadağan olunmalıdır?**

Aşağıda qeyd olunan hallar aşkar edildikdə təzyiq altında işləyən qabların istismarı qadağan olunmalıdır:

- təhlükəsizliyin pozulmasına səbəb ola biləcək qüsürlar və ya müvafiq qaydaların tələblərinə riayət edilməməsi;

- istehsalçı tərəfindən müəyyən olunmuş istismar müddətinin və ya növbəti şəhadətləndirilmə müddətinin bitməsi;
- qabın saz vəziyyətinə, təhlükəsiz istismarına və onun texniki vəziyyətinə nəzarət edən cavabdeh şəxsin qaydalarda müəyyən olunmuş qaydada təyin olunmaması və yaxud biliklərin yoxlanılmaması;
- təhlükəsizlik avtomatikasının, qəza siqnalizasiyasının nasazlığı.

Bu halda təzyiq altında işləyən qabın pasportuna Qaydaların müvafiq bəndlərinə istinad edilərək, onun istismarına qadağa qoyulmasının səbəbləri qeyd olunmalıdır.

**8. Hansı hallarda təzyiq altında işləyən qabların işi dərhal dayandırılmalıdır?**

Qabların iş rejimi və təhlükəsiz xidməti üzrə təlimatda aşağıda nəzərdə tutulmuş hallarda onların işi dərhal dayandırılmalıdır:

- qabın daxilində təzyiq yol verilən həddən yuxarı qalxdıqda və işçi heyət tərəfindən görülən tədbirlərə baxmayaraq aşağı enmədikdə;
- təzyiqin artmasının qarşısını alan qoruyucu qurğuların nasazlığı aşkar olunduqda;
- təzyiq altında işləyən qablarda və onun hissələrində hermetikliyin pozulması, qabarıqların olması, kipləyicilərin (araqatların) partlaması aşkar olunduqda;
- manometr nasaz olduqda;
- odla qızdırılan qablarda maye səviyyəsi yol verilə bilən səviyyədən aşağı düşdükdə;
- maye səviyyə ölçənləri sıradan çıxdıqda;
- qoruyucu bloklayıcı qurğuların nasazlığı zamanı;
- təzyiq altında olan qaba bilavasitə təhlükə yarada bilən yanğın baş verdikdə.
- Sənayedə təzyiq altında işləyən qabların, hidravlik sınağı və ya ildə bir dəfə olaraq texniki baxışdan keçməlidir, əks halda onların istismarı dərhal dayandırılmalıdır.

**9. Təzyiq altında işləyən balonların həcmi necə müəyyən edilir?**

Təzyiq altında işləyən balonların həcmi onun su ilə dolu kütləsi ilə boş vəziyyətdəki kütləsi arasındakı fərqə görə və ya ölçü bakına görə müəyyən edilir.

**10. Təzyiq altında işləyən balonların şəhadətnaməsində hansı məlumatlar və kim tərəfindən yazılır?**

Hazırlanmış balonların şəhadətləndirilməsinin nəticələri istehsalçının Texniki nəzarət şöbəsi tərəfindən aşağıdakı məlumatları əks etdirən cədvələ yazılır:

- balonun nömrəsi;
- balonun hazırlanma və növbəti şəhadətləndirilmə tarixi (ay, il);
- balonun kütləsi, kq;
- balonun həcmi (tutumu), l;
- işçi təzyiq, MPa (kqq/sm2);
- sınaq təzyiqi MPa (kqq/sm2);
- istehsalçının TNŞ-nin nümayəndəsinin imzası.

**11. Təzyiq altında işləyən qabların quraşdırılmasına harada və hansı şərtlərlə icazə verilir?**

Təzyiq altında işləyən qabların quraşdırılmasına aşağıdakı şərtlərlə icazə verilir:

- binadan əsaslı divarla ayrılması şərti ilə istehsal binalarına bitişik örtülü yerlərdə (otaqlarda);
- sahə üzrə təhlükəsizlik qaydalarında nəzərdə tutulduğu halda istehsal sahələrində;
- armaturu idarə etmək və ona baxış keçirmək üçün daxil olma imkanının olması, torpaq və azan cərəyan korroziyalarından qabın divarlarının qorunması şərti ilə torpağa basdırmaqla.

**12. Təzyiq altında işləyən qablarda daxili təzyiq nədir?**

Təzyiq altında işləyən qabın divarının daxili səthinə təsir edən təzyiqə daxili təzyiq deyilir.

**13. Balonda təzyiqi nə ilə ölçürlər və harada quraşdırılır?**

Hər bir qab və müxtəlif təzyiqləri olan müstəqil boşluqlar birbaşa ölçən manometrlərlə təchiz olunmalıdırlar. Manometrlər qabın ştuseri və ya qabla bağlayıcı armatur arasında olan boru kəməri üzərində quraşdırılır.

**14. Manometrlər hansı dəqiqlik sinfinə aid olmalıdır?**

Manometrlər - qabın işçi təzyiqi 2,5 MPa (25kqq/$sm^2$) –a qədər olduqda - 2,5; qabın işçi təzyiqi 2,5 MPa (25kqq/$sm^2$) -dan yuxarı olduqda - 1,5-dən az olmayan dəqiqlik sinfinə malik olmalıdırlar.

**15. Manometr necə quraşdırılmalıdır?**

Manometr elə quraşdırılmalıdır ki, onun göstəriciləri  xidməti personala aydın görünsün.

**16. Təzyiq altında işləyən qablarla məşğul olanlar harada attestasiyadan keçirilməlidir?**

Qabların layihələndirilməsi, hazırlanması, yenidən qurulması, quraşdırılması, sazlanması, təmiri, diaqnostikası və istismarı ilə məşğul olan rəhbər işçilər və mütəxəssislər Azərbaycan Respublikası Fövqəladə Hallar Nazirliyi Sənayedə İşlərin Təhlükəsiz Görülməsi və Dağ-Mədən Nəzarəti Dövlət Agentliyində.

**17. Qabların saz saxlamasına kim cavabdehdir və nə etməlidir?**

Qabın sahibi qabın saz vəziyyətdə saxlanılmasını və təhlükəsiz istismarını təmin etməlidir, lazımi sayda öyrədilmiş və qablara xidmət etmək hüquq verən sertifikata malik xidmət edən personalı təyin etmək, eləcə də nizam – intizamın təmin olunması, qablara xidməti heyət vəzifələrini yerinə yetirən diqqətlə baxış keçirməklə ona tapşırılan avadanlığa nəzarəti, armaturun işçi vəziyyətdə olmasının yoxlanmasını, qoruyucu və bloklayıcı qurğuların və qabların saz vəziyyətdə saxlanılmasına nəzarəti həyata keçirsin.

**18. Normal iş prosesi zamanı yaranan maksimal daxili izafi və ya xaricdə yaranan təzyiq necə adlanır?**

Mütləq təzyiqlə barometrin göstərdiyi ətraf mühitin təzyiqi arasındakı fərqə izafi təzyiq deyilir.

**19. Sisternlərdə quraşdırılan qoruyucu klapanlar necə olmalıdır?**

Sisterndə quraşdırılan qoruyucu klapan sisternin qaz fazası ilə əlaqəli olmalı və klapan açılan zaman qazın buraxılması üçün deşikli qapağa malik olmalıdır. Qapaqdakı deşiklərin sahəsi qoruyucu klapanın işçi kəsiyinin sahəsinin 1,5 mislindən kiçik olmamalıdır.

**20. Təzyiq altında işləyən qab və balonlara xarici və daxili baxış hansı məqsədlə keçirilir?**

İlkin texniki şəhadətləndirilmə zamanı qabın mövcud Qaydaların və qeydiyyat zamanı təqdim olunan sənədlərin tələblərinə uyğun quraşdırılmasını və avadanlıqla təchiz olunmasını, eləcə də qabın və onun hissələrinin zədəsiz olmasını yoxlamaq üçün.

**21. Təzyiq altında işləyən qabların təmiri nəyə əsasən yerinə yetirilməlidir?**

Təzyiq altında işləyən qabların və onun elementlərinin qaynaq (lehimlənmə) tətbiq olunmaqla təmiri, işlər yerinə yetirilməyə başlamazdan əvvəl istehsalçı, konstruktor və ya təmir müəssisəsinin işləyib hazırladığı texnologiya üzrə yerinə yetirilməli, təmirin nəticələri isə qabın pasportuna yazılmalıdır.

**22. Azot, oksigen asitilen və yanar qaz balonları hansı rəngə boyanır?**

- Azot – qara
- oksigen – mavi
- asitilen – ağ
- yanar qaz balonları – qırmızı.

**23. Mayeləşdirilmiş qaz üçün sisternlərə quraşdırılan ventillərə qoyulan tələb?**

Mayeləşdirilmiş qaz üçün sistern və çəlləklərin hər bir doldurucu və boşaldıcı ventilləri tıxacla təchiz olunmalıdır.

**24. Stasionar qab nədir?**

Müəyyən bir yerdə istismar olunması üçün daimi quraşdırılmış qablara deyilir.

**25. Markası olan, lakin pasportu olmayan armaturun quraşdırılmasına nə vaxt icazə verilir?**

Markası olan, lakin pasportu olmayan armaturun yalnız yoxlanıldıqdan, sınaqdan keçirildikdən və materialının markası yoxlanıldıqdan sonra tətbiqinə icazə verilir. Bu halda armatura, istehsal edən müəssisə tərəfindən pasport tərtib olunmalıdır.

**26. Balonların şəhadətləndirilməsi harada keçirilir və havanın tempraturu nə qədər olmalıdır?**

Balonların şəhadətləndirilməsi ayrıca, xüsusi avadanlıqla təchiz olunmuş otaqda keçirilməlidir. Bu otaqda havanın temperaturu $12^0$C-dən aşağı olmamalıdır.

**27. Təzyiq altında işləyən qablar və sisternlər işə buraxılmazdan əvvəl harada qeydiyyatdan keçirilir?**

Qaydaların tələblərinin şamil edildiyi qablar işə buraxılmazdan əvvəl FHN-nin müvafiq agentliyində qeydiyyatdan keçirilməlidirlər.

**28. Sisternlər doldurulan zaman nə tərtib olunur və buraya nə qeyd olunur?**

Sisternlərin doldurulmasını həyata keçirən müəssisələr və doldurma stansiyaları müdiriyyətin müəyyən etdiyi formaya əsasən doldurma jurnalı tərtib etməli, bu jurnalda aşağıdakılar göstərilməlidir:

- doldurulma tarixi;
- sisternlərin və çəlləklərin istehsalçısının adı;
- sisternlər üçün zavod və qeydiyyat nömrəsi, çəlləklər üçün zavod nömrəsi;
- doldurma əməliyyatını yerinə yetirən şəxsin imzası.

Doldurma stansiyasında sisternlər və çəlləklər doldurularkən hər qaz üzrə ayrıca jurnal tərtib olunmalıdır.

**29. Balonlar üst-üstə yığılarkən onların hündürlüyü nə qədər olmalıdır?**

Balonlar nizamla üst-üstə yığılarkən onların hündürlüyü 1,5 m-dən çox olmamalıdır. Balonların ventili bir tərəfə yönəldilməlidir.

**30. Asitilen balonlarının şəhadətləndirilməsi neçə ildən bir, kim tərəfindən keçirilir və nədən ibarətdir?**

Asetilen balonlarının şəhadətləndirilməsi 5 ildə bir dəfədən gec olmayaraq asetilen doldurma stansiyalarında həyata keçirilməlidir və aşağıdakılardan ibarətdir.

- xarici səthə baxışın keçirilməsi;
- məsaməli kütlənin yoxlanılması;
- pnevmatik sınağın keçirilməsi.

**31. Balonların daxilinə baxış keçirmək üçün hansı cihazdan istifadə olunur?**

Balonların daxilinə baxış keçirmək üçün, gərginliyi 12V-dan yüksək olmayan elektrik çıraqları tətbiq edilməlidir.

**32. Sıxılmış qaz şəklində oksigen nə ilə təmasda olduqda yanğın və ya partlayış baş verə bilər?**

Sıxılmış qaz şəklində oksigen yağ və ya piy ilə təmasda olduqda yanğın və ya partlayış baş verə bilər.

**33. Oksigen, asetilen qazlarının saxlanılması üçün balonlar hansı materialdan hazırlanır?**

Oksigen, asetilen qazlarının saxlanılması üçün balonlar Polad materialdan hazırlanır.

**34. Oksigen balonunun xarici səthi hansı rənglə boyanır?**
Oksigen balonunun xarici səthi mavi rənglə boyanır.
**35. Propan baloninun xarici səthi hansı rənglə boyanır?**
Propan baloninun xarici səthi qırmızı rənglə boyanır.
**36. Qaz balonunda istifadə olunan reduktorun vəzifəsi nədən ibarətdir?**
Balondan gələn qazın təzyiqini işçi təzyiqinədək azaltmaqdan ibarətdir.
**37. İstehsalat prosesində istifadə edilən qaz balonlarının rəngləri hansılardır?**
İstehsalat prosesində istifadə edilən qaz balonlarının rəngləri aşağıdakı cədvəldə göstərilən rənglərdədir:

| Sıra № | Qaz | Balonun rəngi | Birkanın mətni | Birkanın rəngi | Zolağın rəngi |
|---|---|---|---|---|---|
| 1 | Azot | Qara | AZOT | Sarı | Qəhvəyi |
| 2 | Ammonyak | Sarı | AMMONYAK | Qara | - |
| 3 | Propan | Qırmızı | PROPAN | Ağ | - |
| 4 | Texniki arqon | Qara | TEXNİKİ ARQON | Tünd göy | Tünd göy |
| 5 | Asetilen | Ağ | ASETİLEN | Qırmızı | - |
| 6 | Səmt qazı | Boz | SƏMT QAZI | Qırmızı | - |
| 7 | Butan | Qırmızı | BUTAN | Ağ | - |
| 8 | Hidrogen | Tünd yaşıl | HİDROGEN | Qırmızı | - |
| 9 | Hava | Qara | SIXILMIŞ HAVA | Ağ | - |
| 10 | Helium | Qəhvəyi | HELİUM | Ağ | - |
| 11 | Oksigen | Mavi | OKSİGEN | Qara | - |
| 12 | Tibbi oksigen | Mavi | TİBBİ OKSİGEN | Qara | - |
| 13 | Hidrogen sulfid | Ağ | HİDROGEN SULFİD | Qırmızı | Qırmızı |
| 14 | Kükürdlü qaz | Qara | KÜKÜRDLÜ QAZ | Ağ | Sarı |
| 15 | Karbon2-oksid | Qara | KARBON 2-OKSİD | Sarı | - |
| 16 | Xlor | Xaki | XLOR | - | Yaşıl |

## VI BÖLMƏ

## ƏTRAF MÜHİTİN MÜHAFİZƏSİ HAQQINDA

1. **Ekologiya sözünün mənası nədir ?**

"Ekologiya" sözü yunanca – oikos – ev, məskən, vətən mənasını daşıyır. Loqos (logiya) isə elm deməkdir

2. **Azərbaycan Respublikasında ekologiya elminin banisi kimdir?**

Azərbaycan Respublikasında ekologiya elminin banisi Həsən Əliyev hesab edilir.

3. **Ətraf mühitin mühafizəsinin məqsədi nədir ?**

Ətraf mühitin mühafizəsinin məqsədi gələcək nəsillərin ehtiyacını nəzərə almaqla ətraf mühitin ekoloji tarazlığının pozulmasına yol vermədən təbii resurslardan səmərəli istifadə edilməsidir.

4. **İstixana effektinin törətdiyi fəsadlar hansılardır ?**

İqlim dəyişiklikləri, buzlaqların əriməsi və daşqınların çoxalması istixana effektinin törətdiyi fəsadlar.

5. **Ekologiya elmi nə zaman yaradılmışdır?**

Ekologiya elmi 18-ci əsrin sonlarında Ernest Hekkel tərəfindən yaradılmışdır.

6. **"Kioto protokolu" nə vaxt və neçə dövlət tərəfindən imzalanmışdır?**

"Kioto protokolu" 1997-ci ildə, 159 dövlət tərəfindən imzalanmışdır.

7. **Atmosferə hansı qazların yığılması istixana effekti yaradır?**

Atmosferə $CH_4$, *CO və* $CO_2$ qazların yığılması istixana effekti yaradır.

8. **Ozon təbəqəsi haqqında nə deyə bilərsiniz ?**

Ozon təbəqəsi canlı aləmi günəşin dağıdıcı ultrabənövşəyi süalarının təsirindən qoruyur. İstixana qazları ozon qatının məhv olmasına gətirib çıxarır.

9. **Ekoloji mədəniyyət nədir ?**

Ekoloji mədəniyyət dedikdə insanın təbiətə olan münasibəti və təbiətlə davranması başa düşülür.

10. **Dünyada mövcud olan 11 iqlim tipindən neçəsi Azərbaycan Respublikasının ərazisindədir?**

Dünyada mövcud olan 11 iqlim tipinin 9-u Azərbaycan ərazisindədir.

**11. Atmosfer havasının çirklənməsinin qarşısını almaq üçün hansı enerji mənbələrindən istifadə etmək daha əlverişlidir ?**

Atmosfer havasının çirklənməsinin qarşısını almaq üçün alternativ enerji mənbələrindən (külək, günəş) istifadə etmək daha əlverişlidir.

**12. Ekoloji təsir mənbələri hansılardır ?**

İnsana təsir, havaya təsir, torpağa təsir, təbii resurslara təsir Ekoloji təsir mənbələridir.

**13. Təhlükəli tullantılar hansılardır ?**

Ekoloji tarazlığın pozulmasına səbəb olan tullantılar Təhlükəli tullantılar adlanır.

**14. SOCAR-ın idarə və müəssisələrində ekologiyaya dair hansı sənədlərin olması mütləqdir ?**

SOCAR-ın idarə və müəssisələrində ekologiyaya dair Ekoloji pasport, Yol Verilən Axıntı Həddi, Yol Verilən Tullantı Həddi və radiasiya vəziyyəti sənədlərin olması mütləqdir.

**15. SOCAR-ın idarə və müəssisələri ekologiyaya dair hansı statistik hesabatları təqdim etməlidirlər ?**

SOCAR-ın idarə və müəssisələri ekologiyaya dair TG-2 (hava, su təsərrüfatı, tullantılar) statistik hesabatları təqdim etməlidirlər.

**16. Yaşıllıqların çoxaldılmasının nə kimi əhəmiyyəti vardır ?**

Ekosistemin davamlı inkişafının qorunub saxlanılması və ekoloji mühitin daha da yaxşılaşdırılması üçün yaşıllıqların çoxaldılmasının böyük əhəmiyyəti vardır.

**17. Ekoloji idarəetmə hansı sənədlərlə tənzimlənir ?**

Ekoloji idarəetmə Ekoloji-normativ sənədlərlə tənzimlənir.

**18. Tullantıların idarə edilmə ardıcıllığı necədir ?**

Tullantıların idarə edilmə ardıcıllığı belədir:

Toplanma - utilizə edilmə - təkrar emal - kənarlaşdırma.

**19. Ətraf mühiti çirkləndirən əsas hansı amillərdir ?**

Antropogen fəaliyyət ətraf mühiti çirkləndirən əsas amillərdir.

**20. SOCAR-ın Ekoloji Siyasətinin məqsədi nədir ?**

SOCAR-ın Ekoloji Siyasətinin məqsədi Ətraf mühitin qorunması, ekoloji təhlükəsizlik və təbii ehtiyatlardan səmərəli istifadə sahəsində praktiki fəaliyyətin ümumi istiqamətlərini müəyyən etməkdir.

**21. Ekologiya anlayışı nədir?**

Ekologiya Ətraf mühitin tarazlığını və bu tarazlığın pozulmasına təsir edən təbii amillər, antropogen və fiziki prosesləri öyrənən elmdir.

**22. Ekoloji sistem nədir?**

Təbiətdə olan canlı və cansız komponentlərin cəmi Ekoloji sistem adlanır.

**23. Qlobal ekoloji problemlər hansı proseslərin nəticəsidir?**

Qlobal ekoloji problemlər İnkişafın yüksək tempinin nəticəsidir.

**24. Ümumdünya ətraf mühitin mühafizəsi günü nə vaxt keçirilir ?**

5 İyun Ümumdünya ətraf mühitin mühafizəsi günüdür.

**25. Atmosfer çirkləndiricilərinin zərərsizləşdirilməsində bitkilərin rolu nədir?**

Atmosfer çirkləndiricilərinin zərərsizləşdirilməsində bitkilərin rolu ondan ibarətdir ki, bitkilər havaya daxil olan toz, his və müxtəlif qazları tutur, karbon qazını isə udaraq fotosintezlə ətraf mühitə oksigen buraxır.

**26. Məişət tullantılarının utilizasiya qaydaları necədir?**

Məişət tullantılarının utilizasiya qaydaları dedikdə çeşidlənərək təkrar emala göndərilməli, emal olunmayanların isə yandırılmalı olduqları prosessi başa düşülür.

**27. Məişət-çirkab sularının təmizlənməsinin məqsədi nədir?**

Məişət-çirkab sularının təmizlənməsinin məqsədi çirkab suyun tərkibindəki inqridientlərin zərərsizləşdirilməsi və canlıların yoluxucu xəstəliklərə yoluxmasının qarşısının alınmasıdır.

**28. Flora-Fauna nədir ?**

Bitki və heyvanlar aləmi Flora-Fauna adlanır.

**29. “Ekologiya” termini hansı alim tərəfindən elmə daxil edilmişdir?**

“Ekologiya” termini XVIII əsrin sonlarında Alman alimi E.Hekkel tərəfindən elmə daxil edilmişdir.

**30. Ətraf mühitin monitorinqi nədir?**

Ətraf mühitin monitorinqi dedikdə Təbii və antropogen təsir nəticəsində ətraf mühitə yayılan zərərli qaz, maye və bərk tullantıların kəmiyyət və keyfiyyətinə elmi əsaslarla nəzarət başa düşülür.

**31. Ətraf mühitin mühafizəsi hansı qanunlarla tənzimlənir?**

Ətraf mühitin mühafizəsi Azərbaycan Respublikası “Ətraf mühitin mühafizəsi haqqında” və “Ekoloji Təhlükəsizlik haqqında” qanunları ilə tənzimlənir.

**32. Təmiz İnkişaf Mexanizmi nədir?**

Təmiz İnkişaf Mexanizmi dedikdə İstilik effekti yaradan qazların atmosferə atılmalarının azaldılması üzrə layihələr başa düşülür.

**33. Atmosferin çirklənməsi nəyə deyilir?**

Havaya atılan zərərli maddələrin atmosferdəki konsentrasiyasının artmasına atmosferin çirklənməsi deyilir.

**34. Ətraf mühitin yaxşılaşdırılmasının yolları hansılardır?**

Yaşıllıqların genişləndirilməsi, sənaye müəssisələrindən atmosferə atılan tullantıların azaldılması, sənaye müəssisələrindən ətraf mühitə atılan tullantıların qarşısının alınması, hidrosferə atılan tullantıların azaldılması, ətraf mühitin yaxşılaşdırılmasının yollarıdır.

**35. Müəssisələrdə ISO-14001 standartını tətbiq etməklə nəyə nail olmaq olar?**

Müəssisələrdə ISO-14001 standartını tətbiq etməklə ətraf mühitin qorunması və ətraf mühitin çirklənməsinin qarşısının alınmasına nail olmaq olar.

**36. Ətraf mühiti daha çox çirkləndirən sahə hansıdır?**

Ətraf mühiti daha çox çirkləndirən sahə Neft, qaz və kimya sənayesidir.

**37. Torpağın münbit qatı nəyə deyilir?**

Mikroorqanizimlərin mövcud olduğu qat torpağın münbit qatı adlanır.

**38. Meşələrin məhvi hansı qlobal fəsada səbəb olur?**

Meşələrin məhvi oksigen rejiminin pozulması kimi qlobal fəsad yaradır.

**39. Yer kürəsində canlı həyatın yayıldığı sahə necə adlanır?**

Yer kürəsində canlı həyatın yayıldığı sahə Biosfer adlanır.

**40. Yol verilən axıntı həddi nədir (YVAH)?**

Müəssisənin fəaliyyəti zamanı ətraf mühitə axıdılan tullantıların tərkibindəki çirkləndirici maddələrin razılaşdırılmış maksimal həddi yol verilən axıntı həddidir.

**41. Ekoloji təbliğat nədir?**

Ekoloji təbliğat əhali arasında ekoloji mədəniyyətin formalaşdırılmasına yönəldilən maarifləndirmə fəaliyyəti sistemidir.

**42. Ətraf mühitin mühafizəsi necə tənzimlənir?**

Ətraf mühitin mühafizəsi ətraf mühitin və təbii ehtiyatlardan səmərəli istifadə sahəsində qanunvericilik aktları, Azərbaycan Respublikası

prezidentinin sərəncamları, Nazirlər Kabinetinin qərarları, müvafiq icra hakimiyyəti orqanlarının normativ təlimatları və metodik göstərişləri ilə tənzimlənir.

**43. Ekoloji təhlükəsizlik nədir?**

Ekoloji təhlükəsizlik dedikdə insanın və cəmiyyətin həyati vacib maraqlarının, ətraf mühitə antropogen və təbii təsirlər nəticəsində yaranan təhlükələrdən qorunmasının təmin edilməsi başa düşülür.

**44. Hidrosfer nədir?**

Yerin su qatı hidrosfer adlanır.

**45. Bəşəriyyətin qlobal ekoloji problemləri hansılardır?**

Ozon dəliklərinin genişlənməsi, səhralaşma, meşə sahələrinin kəskin surətdə azalması bəşəriyyətin qlobal ekoloji problemləridir.

**46. İstixana effekti nədir?**

Çirklənmiş hava qatının yer səthinə gələn radiasiya şüalarının asanlıqla buraxması, yer səthindən qayıdan istiliyin qarşısının alınması İstixana effekti yaradır.

**47. Atmosfer havasının transsərhəd çirklənməsi nədir?**

Atmosfer havasının transsərhəd çirklənməsi bir dövlətin ərazisində yerləşən zərərli maddələrin yayılması nəticəsində digər ölkənin atmosfer havasının çirklənməsidir.

**48. Tullantıların identifikasiyası nədir?**

Tullantıların identifikasiyası istehsal prosesində əmələ gələn tullantıların təhlükəli və ya təhlükəsiz olmasının təyin edilməsidir.

**49. Neft-qaz emalı sahəsində atmosferə atılan və ətraf mühiti çirkləndirən əsas hansı maddələrdir?**

Neft-qaz emalı sahəsində əsas çirkləndiricilər-karbohidrogenlər, uçucu üzvi birləşmələr, karbon oksidləri və azot oksidləridir.

**50. Atmosfer çirklənməsinin nəticəsi nə ola bilər?**

Ozon qatının deşilməsi, istixana effekti, turşulu yağışlar atmosfer çirklənməsinin nəticəsi ola bilər.

**51. Torpağın çirklənməsi nə deməkdir?**

Radioaktiv maddələr, erroziya, şorlaşma, bataqlaşma və s. nəticəsində torpağın məhsuldarlığının azalması torpağın çirklənməsi deməkdir.

**52. Ekoloji terror nədir?**
Ekoloji terror-digər ölkə və ya şəxs tərəfindən digər ölkənin flora və faunasına zərər yetirməklə, təbii sərvətlərini məhv etməklə vurulan ziyandır.
**53. Ekologiyanı mühitə görə necə qruplaşdırmaq olar?**
Ekologiyanı mühitə görə suyun ekologiyası, torpağın ekologiyası, havanın ekologiyası üzrə qruplaşdırmaq olar.
**54. Atmosfer havasının kimyəvi tərkibi necədir?**
Atmosfer havasının kimyəvi tərkibi belədir: azot 78,1%, oksigen 21%, təqribən 1 % isə təsirsiz qazların payına düşür.
**55. Nəqliyyat vasitələri tərəfindən atmosfer havasına ən çox hansı zərərli maddələr atılır?**
Nəqliyyat vasitələri tərəfindən atmosfer havasına ən çox dəm qazı atılır.
**56. İstilik-elektrik mərkəzlərində hansı yanacaqdan istifadə olunduqda atmosfer havasına daha az zərərli maddələr atılır?**
İstilik-elektrik mərkəzlərində təbii qaz yanacağından istifadə olunduqda atmosfer havasına daha az zərərli maddələr atılır.
**57. Atmosfer havasını çirkləndirən səyyar mənbələr hansılardır?**
Atmosfer havasını çirkləndirən səyyar mənbələr nəqliyyat vasitələridir.
**58. Tullantı poliqonları nədir?**
Poliqonlar - tullantıların zərərsizləşdirilməsi və basdırılması üçün xüsusiləşdirilmiş müəssisələrdir.
**59. Eldar şamının vətəni hansı ölkədir?**
Eldar şamının vətəni Azərbaycan Respublikasıdır.
**60. Kioto Protokolu nə haqdadır?**
İqlim Dəyişmələri üzrə Çərcivə Konvensiyasıdır.
**61. Metanın tam yanması zamanı hansı məhsullar yaranır?**
Metanın tam yanması zamanı karbon qazı və su yaranır.
**62. Metanın natamam yanması zamanı hansı məhsullar yaranır?**
Metanın natamam yanması zamanı karbon qazı, dəm qazı və su yaranır.
**63. Ekoloji təmiz yanacaq dedikdə nə nəzərdə tutulur?**
Ekoloji təmiz yanacaq dedikdə atmosferə atılan yanma məhsullarının miqdar və keyfiyyətinə əsasən dünya standartlarına uyğunluq nəzərdə tutulur.

**64. Təbii qaza odorant kimi vurulan hansı maddədir?**
Təbii qaza odorant kimi vurulan maddə Etilmerkaptandır.
**65. Azərbaycanın beynəlxalq əhəmiyyətli magistral neft və qaz ixrac kəmərləri hansılardır?**
Bakı-Tbilisi-Ceyhan, Bakı-Novorossiysk, Bakı-Tbilisi-Ərzurum, Bakı-Supsa Azərbaycanın beynəlxalq əhəmiyyətli magistral neft və qaz ixrac kəmərləridir.
**66. İnsanın fəaliyyəti nəticəsində ətraf mühitə atılan tullantılar fiziki halına görə neçə növ olur?**
İnsanın fəaliyyəti nəticəsində ətraf mühitə atılan tullantılar fiziki halına görə 3 növ olur.
**67. SOCAR-ın müəssisələrində ekoloji monitorinqlərin keçirilməsi səlahiyyəti hansı dövlət qurumuna verilmişdir?**
SOCAR-ın müəssisələrində ekoloji monitorinqlərin keçirilməsi səlahiyyəti Ekologiya və Təbii Sərvətlər Nazirliyinin Ətraf mühitin Mühafizəsi Departamentinə verilmişdir.
**68. Xəzər dənizinə axıdılan çirkab suların mənbələri hansı böyük çaylardır?**
Xəzər dənizinə axıdılan çirkab suların mənbələri Volqa, Kür və Ural çaylarıdır.
**69. Ekoloji problemlər miqyasına görə neçə yerə bölünür?**
Ekoloji problemlər miqyasına görə 3 yerə a) lokal; b) regional, v) qlobal problemlərə bölünür.
**70. Litosfer nədir?**
Litosfer Yer Kürəsinin bərk hissəsi-qabığı və mantiyanın bir hissəsidir.
**71. Biosfer nədir?**
Biosfer – Yer kürəsində canlı həyatın yayıldığı sahədir.
**72. Təbii qazın digər yanacaq növlərindən üstünlüyü nədir?**
Təbii qaz-ucuz və ekoloji cəhətdən ən təmiz yanacaq növüdür.
**73. Kağız istehsalında nə qədər ağac istifadə olunur?**
1 ton ofis kağızının istehsalı üçün ən azı 10 ağac kəsilməlidir.
**74. Kağız tullantılarının təkrar emalının nə faydası vardır?**
Kağız tullantılarının təkrar emalının təbii ehtiyatların qorunmasına, enerji sərfiyyatının azalmasına,su sərfiyyatının azalmasına və tullantıların miqdarının azalması kimi faydası vardır.

**75. Nə üçün dünya okeanı ilə birbaşa əlaqəsi olmayan Xəzər gölünü dəniz adlandırırlar?**

Dibində okean tipli yer qatı yerləşdiyinə və dəniz ölçülərinə malik olduğuna görə Xəzər gölünü dəniz adlandırırlar.

**76. Xəzər dənizi daha çox nə ilə çirklənmişdir?**

Xəzər dənizi daha çox karbohidrogenlərlə çirklənmişdir.

**77. Azərbaycanda ekoloji təhlükəsizliyin pozulma səbəbləri nələrdir?**

Sənayenin, kənd təsərrüfatının, nəqliyyatın intensiv inkişafı Azərbaycanda ekoloji təhlükəsizliyin pozulma səbəbləridir.

**78. Azərbaycanda atmosferə ən çox atılan kimyəvi maddə hansıdır?**

Azərbaycanda atmosferə ən çox atılan kimyəvi maddə Karbohidrogenlərdir.

**79. Xəzərin çirklənməsinin yaratdığı ekoloji problemin nəticəsi nədir?**

Xəzərin çirklənməsinin yaratdığı ekoloji problem Bioloji resursların azalmasıdır.

**80. Ekoloji aspekt nədir?**

Ətraf mühitə təsir edə biləcək potensial mənbəyə ekoloji aspekt deyilir.

**81. Aspektlərin qiymətləndirilməsi hansı formulaya əsasən hesablanır?**

Aspektlərin qiymətləndirilməsi Risk = ehtimal x şiddət formulasına əsasən hesablanır.

**82. Rekultivasiya hansı metodlarla həyata keçirilir?**

Rekultivasiya mexaniki, fiziki və bioloji metodlarla həyata keçirilir.

**83. Meşələrin ətraf mühitdə rolu nədən ibarətdir?**

Meşələr atmosfer havasını zərərli tullantılardan təmizləyir, atmosferi oksigen ilə təmin edir, torpaq örtüyünü eroziya prosseslərindən qoruyur, su obyektlərinin rejiminə müsbət təsir göstərir.

**84. Xəzər dənizinin çirklənmə mənbələri hansılardır?**

Xəzərə axan çaylar vasitəsi ilə gələn çirkləndiricilər, sahil zonasında yerləşən şəhərlərdən və sənaye obyektlərindən çirklənmə, dənizdə neft hasilatı və nəqli ilə əlaqədar çirklənmə, Xəzər dənizi səviyyəsinin qalxması nəticəsində sahil zonasında su altında qalmış mənbələrdən çirklənmə.

## VII BÖLMƏ

## BEYNƏLXALQ İDARƏETMƏ SİSTEMLƏRİ HAQQINDA

**1. ISO nədir?**

ISO Beynəlxalq standartlaşdırma təşkilatıdır və təşkilatın ingilis dilində qısaldılmış adıdır (İnternational Sertification of Organisation).

**2. ISO 9001 nədir?**

ISO 9001 Keyfiyyət idarəetmə sistemi üzrə beynəlxalq standartdır.

**3. Keyfiyyəti İdarəertmə Sisteminin prinsipləri hansılardır ?**

- Müştəriyə istiqamətlənmək. Rəhbərliyin liderliyi.
- İdarəetmədə personalın iştirakı. Prosesli yanaşma.
- İdarəetmədə sistem yanaşması. Davamlı təkmilləşdirmə.
- Qərarların faktlara əsaslanaraq verilməsi. Tədarükçülərlə qarşılıqlı faydalı əməkdaşlıq.

**4. Keyfiyyəti İdarəertmə Sisteminin tələbləri necə yerinə yetirilməlidir?**

Keyfiyyəti İdarəertmə Sisteminin tələblərinin yerinə yetirilmə ardıcıllığı belədir: Müəyyənləşdirilməlidir, sənədləşdirilməlidir, tətbiq edilməlidir, dəstəklənməlidir, effektliyi mütəmadi olaraq yaxşılaşdırılmalıdır.

**5. Müştəriyə istiqamətlənmək nə deməkdir ?**

Mövcud və gələcək tələbləri müəyyən etmək və yerinə yetirmək müştəriyə istiqamətlənmək deməkdir.

**6. Rəhbərliyin liderliyi nə deməkdir ?**

Rəhbərliyin liderliyi müəssisənin daxilində birlik və normal psixoloji iqlim yaradaraq idarə etmək və bütün personalı cəlb etməklə qarşıya qoyulmuş məqsədlərə nail olmaqdan ibarətdir.

**7. Müəssisədə Rəhbərliyin vəzifələri nədən ibarətdir?**

Rəhbərliyin vəzifələri İstehlakçının, qanunvericiliyin və mütləq olan tələblərin yerinə yetirilməsinin vacibliyini təşkilatın diqqətinə çatdırmaq, keyfiyyət sahəsində siyasəti (strategiyanı) hazırlamaq, keyfiyyət sahəsində məqsədlərin hazırlanmasını təmin etmək, KİS-nin təhlilini aparmaq və lazımı ehtiyatlarla təmin etməkdən ibarətdir.

**8. İdarəetmə sistemlərində istifadə olunan sənədlər hansılardır ?**

- Keyfiyyət sahəsində siyasət
- Keyfiyyət üzrə Rahbər sənəd
- İS üzrə prosedurlar
- Vəzifə və nəzarət təlimatları
- Qeydlər və hesabatlar üçün formalar.

**9. Keyfiyyət sahəsində məqsədləri kim müəyyənləşdirir ?**

Keyfiyyət sahəsində məqsədləri Ali rəhbərlik müəyyənləşdirir.

**10. Rəhbərlik ildə neçə dəfə məlumatların təhlilini təşkil etməlidir ?**

Rəhbərlik ildə bir dəfədən az olmayaraq məlumatların təhlilini təşkil etməlidir.

**11. Audit hansı beynəlxalq standartda təsvir edilir ?**

Audit ISO 19011 beynəlxalq standartında təsvir edilir.

**12. Auditin mərhələləri hansılardır ?**

- Hazırlıq
- Audit
- yekun tədbirlər.

**13. Audit hansı müddəalara əsasən keçirilməlidir ?**

Audit qüvvədə olan standartlara, normativlərə, təlimatlara və prosedurlara əsasən keçirilməlidir.

**14. Auditin keçirilməsi barədə əvvəlcədən məlumat verilməlidirmi** ?

Bəli auditin keçirilməsi barədə əvvəlcədən məlumat verilməlidir.

**15. Auditor hansı keyfiyyətlərə malik olmalıdır ?**

Auditorlar aşağıdakı keyfiyyətlərə malik olmalıdırlar:

- Diplomatik, dürüst, qərəzsiz, ünsiyyətcil
- Köməksevər, inadkar, vicdanlı, professional
- Səbirli, açıq fikirli, dəqiq, məntiqli
- Əməkdaşlıq edən, müşahidəçi, etik.

**16. Auditor işlədiyi bölməni audit edə bilərmi ?**

Xeyr Auditor işlədiyi bölməni audit etməməlidir.

**17. Bədbəxt hadisə nədir?**

Bədbəxt hadisə işçinin zədə almasına, xəstələnməsinə və ya ölümünə səbəb olan arzuolunmaz haldır.

**18. Keyfiyyəti İdarəertmə Sisteminin sənədləri necə idarə olunur ?**
Keyfiyyəti İdarəertmə Sisteminin sənədləri Kodlaşdırılaraq idarə olunur.
**19. Uyğunsuzluq təyin edilərkən hansı amillərə əsaslanmaq lazımdır?**
Uyğunsuzluq təyin edilərkən yazılı təlimatlara əsaslanmaq lazımdır.
**20. Uyğunsuzluğun aradan qaldırılmasına kim tam əmin olmalıdır ?**
Auditor uyğunsuzluğun aradan qaldırılmasına tam əmin olmalıdır.
**21. İdarəertmə necə həyata keçirilir ?**
İdarəertmənin həyata keçirilmə ardıcıllığı belədir:
- Planlaşdırılır
- yerinə yetirilir
- yoxlanılır
- təkmilləşdirilir.

**22. Müəssisə hansı tələblər əsasında fəaliyyət göstərir ?**
Müəssisə qanunvericilik və müştəri tələbləri əsasında fəaliyyət göstərir.
**23. Keyfiyyət hədəfləri hansı amillərə əsasən təyin edilir ?**
Keyfiyyət hədəfləri keyfiyyət siyasətinə və məqsədinə əsasən təyin edilir.
**24. Müəssisənin iş prosedurlarını kim hazırlamalıdır ?**
Müəssisənin iş prosedurlarını işi birbaşa icra edən səlahiyyətli şəxslər qrupu hazırlamalıdır.
**25. Məhsulun uyğunluğunun saxlanılması nə deməkdir?**
İstehsal olunmuş məhsulda olan nöqsanın istehlakçıya çatmadan aradan qaldırılması məhsulun uyğunluğunun saxlanılması deməkdir.
**26. Uyğunsuzluq nədir?**
Uyğunsuzluq hər hansı bir mütləq şərtin yerinə yetirilməmiş olmasıdır.
**27. Aspektlərin qiymətləndirilməsi hansı standartın tərkib hissəsidir?**
Aspektlərin qiymətləndirilməsi ISO 14001 standartın tərkib hissəsidir.
**28. Obyektiv dəlil nədir?**
Bir şeyin doğruluğunu və ya mümkünlüyünü dəstəkləyən məlumatlar obyektiv dəlil adlanır.
**29. Planlı audit hansı aralıqlarda keçirilməlidir?**
Planlı audit İldə bir dəfədən az olmayaraq keçirilməlidir.
**30. Daxili audit nədir?**
Müəssisənin özü tərəfindən aparılan auditə daxili audit deyilir.

**31. Azərbaycan neçənci ildən ISO-nun tam hüquqlu üzvü seçilmişdir?**

Azərbaycan 2003–cü ildən ISO-nun tam hüquqlu üzvü seçilmişdir.

**32. ISO 14001 nədir?**

ISO 14001 Ətraf mühitin mühafizəsi üzrə standartdır.

**33. Audit prosesinin başlamasından bitmə tarixinədək auditdən məsul şəxs kimi kim qeyd olunur?**

Audit prosesinin başlamasından bitmə tarixinədək auditdən məsul şəxs kimi Baş auditor qeyd olunur.

**34. Aşkar olunmuş uyğunsuzluqların səbəblərinin aradan qaldırılması üçün görülən fəaliyyət necə adlanır?**

Aşkar olunmuş uyğunsuzluqların səbəblərinin aradan qaldırılması üçün görülən fəaliyyət düzəldici fəaliyyət adlanır.

**35. Obyektiv dəlil hansı yollarla əldə edilə bilər?**

Obyektiv dəlil müşahidə, ölçmə, müayinə vasitəsi ilə əldə edilə bilər.

**36. Daxili Auditi zəruri edən amillər hansılardır?**

- Rəhbərlik tərəfindən istifadə edilən nəzarət mexanizmidir
- personalın maariflәndirilməsi yoludur
- davamlı inkişafi təmin edən vasitədir.

**37. Sınaq və kalibrasiya laboratoriyalarının işinin təşkili hansı beynəlxalq standartda təsvir edilir?**

Sınaq və kalibrasiya laboratoriyalarının işinin təşkili ISO 17025 beynəlxalq standartda təsvir edilir.

**38. Qanunvericilik tələblərinin yerinə yetirilməməsi nə ilə nəticələnə bilər?**

Qanunvericilik tələblərinin yerinə yetirilməməsi intizam tənbehi, işdən azad edilmə və ya azadlıqdan məhrum olunma ilə nəticələnə bilər.

**39. Təhlükə nədir?**

Təhlükə xəsarət hadisəsinin baş verə biləcəyi haldır. Həmçinin təhlükə işçilərin həyatına və sağlamlığına zərər verən, təşkilatın əmlakının dağılması və iş yerlərində əmək şəraitinin pozulması hallarının baş verməsi üçün potensial vəziyyət və mənbədir.

**40. Risk nədir?**

Risk təhlükə ilə bir başa təmasda olmaqdır. Həmçinin təhlükəli hadisənin və onun nəticələrinin ehtimalının uyğunluğu risk adlanır.

**41. Əməyin mühafizəsi sahəsində insident nə deməkdir?**

Qəza vəziyyəti və bədbəxt hadisənin baş verməsinə səbəb olan və ya qəza vəziyyəti və bədbəxt hadisənin potensial baş verməsinə imkan verən hadisəyə insident deyilir.

**42. Hədəf nədir?**

Hədəf ölçülə bilən və dəqiq olmalıdır.

**43. Müştəri məmnuniyəti və şikayətlərin araşdırılması hansı beynəlxalq standartda əks olunur?**

Müştəri məmnuniyəti və şikayətlərin araşdırılması ISO 10002 beynəlxalq standartında əks olunur.

**44. Laboratoriya ölçmələrində xətalar necə müəyyənləşdirilir?**

Laboratoriya ölçmələrində xətalar müqayisə yolu ilə müəyyənləşdirilir.

**45. Müəssisənin fəaliyyəti hansı tələblər əsasında həyata keçirilir ?**

Müəssisənin fəaliyyəti qanunvericilik və müştəri tələbləri əsasında həyata keçirilir.

**46. Təşkilati baxımdan müəssisə hansı resurslara malik olmalıdır?**

Təşkilati baxımdan müəssisə Maddi və insan resurslarına malik olmalıdır.

**47. Qeyd nədir?**

Qeyd həyata keçirilən fəaliyyətin dəlilini təmin edən və ya əldə edilən nəticələri sübut edən sənəddir.

**48. Önləyici fəaliyyət nəyə deyilir?**

Potensial uyğunsuzluğun səbəbinin aradan qaldırılması üçün görülən işə önləyici fəaliyyət deyilir.

**49. Müştəri anlayışı nədir?**

Müştəri məhsulu alan müəssisə və ya şəxsdir.

**50. Təlimat özündə nələri əks etdirməlidir?**

Təlimat müəssisənin daxilində hər hansı konkret işlərin yerinə yetirilmə ardıcıllığını və məxsusi detallarını özündə əks etdirən sənəddir.

**51. Keyfiyyət İdarəetmə Sisteminin tətbiqindən hansı faydalar əldə edilə bilər?**

- İstehsalat itkisini minimuma endirir

- Müəssisənin imicinin yüksəlməsinə səbəb olur
- Müştəri məmnuniyyətini artırır
- Daha çox potensial müştəri cəlb olunur və s.

**52. Peşə Təhlükəsizliyi və Əməyin Mühafizəsi sahəsini əks etdirən standart hansıdır?**

Peşə Təhlükəsizliyi və Əməyin Mühafizəsi sahəsini əks etdirən standart OHSAS 18001-dir.

**53. Keyfiyyət idarəetmə sisteminin inkişafını təmin etmək məqsədi ilə sistematik, müstəqil, sənədləşmiş olaraq həyata keçirilən proses necə adlanılır?**

Keyfiyyət idarəetmə sisteminin inkişafını təmin etmək məqsədi ilə sistematik, müstəqil, sənədləşmiş olaraq həyata keçirilən proses Audit adlanılır.

**54. Potensial təhlükələrin neqativ nəticələri və baş vermə ehtimalı nə deməkdir?**

Potensial təhlükələrin neqativ nəticələri və baş vermə ehtimalı Risk deməkdir.

**55. Ümumdünya standart günü və ya Ümumdünya standartlaşdırma günü nə vaxtdır?**

Ümumdünya standart günü və ya Ümumdünya standartlaşdırma günü 14 oktyabrdır.

**56. Beynəlxalq Standartlarda Sistem anlayışı nədir?**

Beynəlxalq Standartlarda Sistem anlayışı Qarşılıqlı əlaqələrin və qarşılıqlı fəaliyyətin məcmusudur.

**57. Bir neçə idarəetmə sisteminin birgə təşkil edilən audit prosesi necə adlanır?**

Bir neçə idarəetmə sisteminin birgə təşkil edilən audit prosesi kompleks audit adlanır.

**58. Sənədləşmiş auditin məqsədləri, əhatə dairəsi və kriteriaları özündə əks etdirən audit proqramı kim tərəfindən idarə olunur?**

Baş auditor tərəfindən idarə olunur.

**59. Auditin başlanması üçün təşkil edilən və məlumat xarakteri daşıyan toplantı necə adlanır?**

Auditin başlanması üçün təşkil edilən və məlumat xarakteri daşıyan toplantı açılış toplantısı adlanır.

**60. Xarici audit nədir?**

Xarici audit Sertifikatlaşdırma təşkilatı tərəfindən keçirilən auditdir.

**61. Enerji idarəetmə sistemi nədir?**

Enerji siyasətinin və enerji məqsədlərinin eləcədə prosess və prosedurların işlənməsinə və tətbiqinə yönəlmiş qarşılıqlı əlaqədə və ya qarşılıqlı hərəkətdə olan elementlər toplusu deməkdir.

**62. Enerji bazisi nədir?**

Enerji məhsuldarlığının müqayisə edilməsi üçün əsas verən və kəmiyyət baxımından hesablana bilən vahid enerji bazisidir.

Enerji bazisi konkret zaman nisbətində özünü əks etdirir. Enerji bazisi enerji sərfiyyatı ilə əlaqədar parametrlərə uyğun olaraq normativləşdirilə bilər: məsələn – istehlak həddi, temperatur-gün və s.

Enerji bazisi həm də enerjinin qənaətinə yönəlmiş hesabatlarda da başlanğıc nöqtə kimi də enerji məhsuldarlığının yaxsılaşdırılmasına yönəlmiş fəaliyyətdən əvvəlki və sonrakı xarakteristikaları müqayisə etmək üçün istifadə edilə bilər.

**63. Enerji məhsuldarlığı nədir?**

İstehssal edilmiş mal-material, xidmət və ya enerji üçün sərf olunmuş enerji ilə, daxil olunmuş (alınmış) enerji arasındakı əlaqədir.

Misal. Yeni formaya düşmə koofisienti; tələb olunan enerji/istifadə olunan enerji; istehsal olunan güc/sərf olunan güc; işin yerinə yetirilməsi üçün nəzərdə tutulmuş enerji/işə sərf olunmuş faktiki enerji.

**64. Enerji təhlili nə deməkdir?**

Müəssisənin enerji məhsuldarlığının verilmiş və əldə olunmuş məlumatlar əsasında təyininə uyğun fəaliyyətinin yaxşılaşdırılması imkanlarının identifikasiyasına enerji təhlili deyilir.

**65. Şikayət nədir?**

Bir müəssisəyə məhsulları və ya şikayətləri ələ alma prosesləri ilə əlaqədar edilən məmnuniyyətsizlik ifadəsinə şikayət deyilir. Burada birbaşa və ya dolayı olaraq cavab və ya həll gözlənilir.

**66. Müştəri məmnuniyyəti nə deməkdir?**

Həll edilən müştəri tələblərinin müştəri tərəfindən görünmə dərəcəsi.

**67. Müştəri xidməti nə deməkdir?**

Bir xidmətin tətbiq dövrü ərzində müştəri ilə təşkilatın qarşılıqlı əlaqəsi müştəri xidməti adlanır.

**68. Proses nə deməkdir?**

Giriş məhfumunu çıxış məhfumuna çevirən fəaliyyətə proses deyilir.

## İxtisarlar

ABA – Aralıq balon anbarları.
AQDS – Avtomobil qazdoldurma stansiyası
FİƏ – Faydalı iş əmsalı
İM – İdarəetmə məntəqəsi
İSYO – İnfraqırmızı şua yayan odluq
QDM – Qazdoldurucu məntəqə
QDS – Qazdoldurucu stansiya
QPS – Qaz paylayıcı stansiya
QTM – Qaz tənzimləyici məntəqə
QTQ – Qaz tənzimləyici qurğu
QAK – Qoruyucu atqı klapan
QBK – Qoruyucu bağlayıcı klapan
MKHQ – Mayeləşdirilmiş karbohirogen qazı
MİM – Mərkəzi idarəetmə məntəqəsi
NÖC – Nəzarət ölcü cihazı
NOM – Nəzarət olunan məntəqə
SYS – Suyun yuxarı səthi
TM və TPAİS – Telemexanizasiya və Texnoloji proseslərin avtomatlaşdırılmış idarəetmə sistemləri.

## İstifadə edilmiş ədəbiyyatların siyahısı:


1. Qaz təsərrüfatında təhlükəsizlik Qaydaları. 1987-ci il.
2. Qaz təsərrüfatında texniki təhlükəsizlik Qaydaları. 2005-ci il.
3. Qaz təsərrüfatında texniki istismar Qaydaları. 2008-ci il.
4. Azərbaycan neft sənayesində əməyin mühafizəsinin vahid idarəetmə sistemi. 2008-ci il.
5. Neft, qaz və neft-kimya sənayesində yanğın təhlükəsizliyi Qaydaları. 2012-ci il.
6. Qaz təchizatı. Layihələndirmə normaları AzDTN 2.13-1
7. Bədbəxt hadisələr və fövqəladə vəziyyətlər zamanı ilk tibbi yardım. 2008-ci il.
8. ISO 9001 "Keyfiyyəti İdarəetmə Sistemi" üzrə standart.
9. ISO 14001 "Ətraf mühitin idarə edilməsi sistemi" üzrə standart.
10. OHSAS 18001 "Əməyin mühafizəsi və təhlükəsizliyi idarəetmə sistemi" üzrə standart.
    Ölçmələrin vəhdətinin təmin eilməsi haqqında Azərbaycan Respublikasının qanunu (13 iyun 2000-ci il N-893 İQ).
11. Azərbaycan Respublikasının Nazirlər Kabinetinin 27.01.2000-ci il tarixli 10 nömrəli qərarı ilə təsdiq edilmiş "Təhlükəli yüklərin avtomobil nəqliyyatı ilə daşınması Qaydaları".
12. Metalların qaynaq edilməsi və kəsilməsi D.L.Qlizmanenko.
13. "Enerji resurslarından istifadə haqqında" Azərbaycan Respublikasının Qanunu. Bakı, 1999.
14. "Qaz təchizatı haqqında "Azərbaycan Respublikasının Qanunu, 1999.
15. "Qazdan istifadə qaydaları". Azərbaycan Respublikası Nazirlər Kabinetinin 12 may 2011-ci il tarixli 80 № - li qərarı.
16. AzDTN 2.13- L "Qaz təchizatı. Layihələndirmə normaları". Bakı, 2009.
17. "Ətraf mühitin mühafizəsi haqqında" Azərbaycan Respublikasının Qanunu.
18. "Azərbaycan Respublikasının yanacaq enerji kompleksinin inkişafı
19. (2005 2015 ci illər) üzrə Dövlət Proqramı." Bakı, 2005.
20. РД 153-39.4-079-01. Методика определения расходов газа на технологические нужды предприятий газового хозяйства и потерь в системах распределения газа.
21. Методология расчета расхода природного газа на технологические нужды и технические потери в распределительных сетях. Кишинев. 2001.
22. ГОСТ 5542-87. Газы горючие природные для промышленного и коммунально- бытового назначения.
23. ГОСТ 2939 - 63.Газы. Условия для определения объема.
24. Газ природный. Методы расчета физических свойств.

25. Dənizdə Neft və Qazçıxarma idarələrində qazın sərfi normaları. V.İ.Əliyev, Azərnəşr, Bakı. 2001.
26. Методика по расчету удельных показателей загрязняющих веществ в выбросах (сбросах) в атмосферу (водоемы) на объектах газового хозяйства. ОАО «Ростазификация». 1996г.
27. "Energetika haqqında" Azərbaycan Respublikasının Qanunu, 1998.
28. СТО ГАЗПРОМ 1 1-2005. Методические указания по расчету валовых выбросов углеводородов в атмосферу в ОАО «ГАЗПРОМ»
29. Типовая методика расчета норм потребления природного газа населением в квартирах (домах) на приготовление пищи, горячей воды и отопление в условиях отсутствия приборов учета расхода газа (По состоянию на 18 октября 2006 г.).
30. «Azneft» İB-nin neft və qazçıxarma idarələrində və müştərək müəssisələrində neftin və qazın texnoloji itkilərinin təyini. Metodiki göstəriş. Bakı, 2005.
31. "Qazın nəqlə hazırlanması, nəqli, saxlanması və korroziya problemləri" Elmi əsərlər toplusu. Bakı, "Elm", 2006.
32. Порядок содержания и ремонта внутридомового газового оборудования в Российской Федерации. Приказ министра регионального развития РФ 26.06.2009 г. №239.
33. "Qaz təsərrüfatının istismarı". Ə.Məlikov, Ə.İsmayılov, S.Rəsulov. Bakı,
34. Qaz təsərrüfatı müəssisələrində qaz sərfi və qazpaylayıcı şəbəkələrdə texniki itkilərin təyin olunma metodikası. Azərbaycan Respublikası Dövlət Neft Şirkəti "Neftqazelmitədqiqatlayihə" İnstitutu. Bakı. 11.12.2012.

# MÜNDƏRİCAT

**IV Bölmə.**



**V Bölmə.**



**VI Bölmə.**



**VII Bölmə.**